Kitab İsa NƏCƏFOV və Vidadi MƏMMƏDOVUN təşəbbüsü və yardımı əsasında tərcümə və çap olunmuşdur.

*Redaktor:* **Bayram AĞAYEV**
*filologiya elmləri namizədi*

*Rus dilindən tərcümə edən:* **Mehdi QULİYEV**

*Seriyanın bədii tərtibat və illüstrasiyalarının rəssamı:* **Fikrət ƏLƏKBƏROV**

**Əbu Hamid Əl-Qəzali. «ƏMƏLLƏRİN MİZANI» və başqa əsərləri.** *Bakı, «Adiloğlu» nəşriyyatı- 2007, 212 səh.*

Oxuculara təqdim olunan bu kitab Əbu Hamid əl-Qəzalinin Moskvadakı «Ansar» nəşriyyat evində 2004-cü ildə rus dilində işıq üzü görmüş «Əməllərin mizanı» kitabının tərcüməsidir. «İslam fikrinin qızıl fondu» seriyasından nəşr olunmuş kitaba onun «Əməllərin mizanı»ndan başqa, «Yanılmalardan xilas edən kitab» və «Oğluma nəsihət» əsərləri də daxil edilmişdir.

Əbu Hamid əl-Qəzali (1058-1111) ən nəhəng islam ilahiyyatçılarından biridir. O, özünün haqlı olaraq insan mənəviyyatının müsəlman ensiklopediyası sayılan «Əməllərin mizanı» əsəri ilə dərin psixoloq, tədqiqatçı və hətta müəyyən dərəcədə insan ruhunun mühəndisi kimi bizim qarşımızda durur.

Əl-Qəzali möminlərin sosial mühitin təsiri və xarakterlərin xüsusiyyətləri ilə diqtə olunmuş əməllərinin gizli səbəblərini sadəcə olaraq təhlil etmir, həm də bir çox hallarda insanın bizim həyatımızda həlledici əhəmiyyət kəsb edən müqəddəs, mənəvi tərkibini açıb göstərir. «Əməllərin mizanı» əsəri müəyyən dərəcədə həm də insan ruhunun sağlamlaşdırılması üçün bir tibbi nüsxədir. Əl-Qəzali insana öz həyatını təbii və düzgün yola çıxarmaq üçün mənəvi özünütəyinlə şəxsən məşğul olmaq imkanı verir.

M $\frac{4322110018}{121\text{-}2007}$ qrifli nəşr

**İnamı biliklə qarışıq salmaq adəti bizim dövrümüzün yoluxucu xəstəliyidir.**

*Əbu Hamid əl-Qəzali*

**Hörmətli oxucular!**

Bu nəşrdə aşağıdakı islam ifadələri ərəb liqaturaları ilə verilmişdir:

- Cəlli-və Cəlaluhi (Allahın adından sonra );
- Səllallahu əleyhi və-səlləm (Məhəmməd peyğəmbərin adından sonra);
- Əleyhissalam (digər peyğəmbərlərin və mələklərin adlarından sonra);
- Rəhmətullah (Peyğəmbərin ardıcıllarının adlarından sonra).

***Rəhman və rəhmli olan Allahın adı ilə!***

*Şeyx, imam, islamiyyətdə ləyaqətli nüfuz sahibi, imanın bəzəyi Əbu Hamid ibn Məhəmməd əl-Qəzali ət-Tusi (124) aşağıdakıları söyləmişdir.*

*İlk insanlardan tutmuş sonunculara qədər bütün insanların məqsədi olan səadətə insan yalnız biliyi və işi özündə birləşdirməklə çata bilər. Bu ikisindən hər birini zəruri olaraq yaxşı öyrənmək, onun mahiyyətini və ölçülərini bilmək lazımdır. Deməli, biz xüsusi meyar qəbul edərək, onun vasitəsilə bilik əldə etməli, həqiqi biliyi hansısa digər şeylərdən fərqləndirməyi bacarmalıyıq. Biz artıq bunu etmişik. İndi isə insanı xoşbəxtliyə çatdıran və onu bədbəxt edən əməllərin hansı olduğunu bilmək lazımdır. Bunun üçün mütləq meyar lazımdır. Biz bu haqda danışmaq arzusundayıq və izah etmək istəyirik ki, xoşbəxtlik axtarışında kifayət qədər səy göstərməmək axmaqlıqdır. Sonra biz özündə biliyin və əməlin birləşdirilməsinin məhz xoşbəxtliyə aparan yeganə yol olduğu barədə danışacağıq. Sonra söhbət İdrak və ona çatmaq yolları haqqında olacaqdır. Daha sonra isə hansı əməllərin insanı səadətə çatdırdığı və bu əməllərin necə həyata keçirildiyi haqqında söhbət açılacaqdır. Bütün bunları səlisliyi öz qarşımıza məqsəd qoyaraq və yamsılamaqdan daha yaxşı üsullar seçərək həyata keçirəcəyik və əgər tədqiqatlarımız getdikcə daha dərin, ifadələrimizsə daha çox sözdən ibarət olarsa bu, sübut dərəcəsinə yüksəlməyimizi göstərir. Bu zaman biz haqqında «Elmin meyarları» əsərimizdə söhbət açdığımız qaydalara əməl edəcəyik. Lakin bu haqda çox danışmadan, yalnız əsas prinsiplər və qaydalar barədə söhbət edəcəyik.*

# XOŞBƏXTLİK AXTARIŞINDA KİFAYƏT QƏDƏR SƏY GÖSTƏRMƏMƏYİN AXMAQLIQ OLDUĞU HAQQINDA

Axirət həyatındakı, yəni əbədi həyatdakı səadət sonsuz həzz və əsl sevinclə doludur. Zamanın axını və müddətin yaxınlaşması hökmü altında olmayan sonsuz bir əbədilik bunu arzulayanların məqsədi və onun həsrətində olanların istəyidir. Əgər biz belə təsəvvür etsək ki, bu fani dünya bütünlüklə toz zərrələri ilə doludur və belə düşünsək ki, bir quş hər min ildə bir toz zərrəciyini tutarsa, onda toz zərrələri nə vaxtsa qurtarar, lakin bu müddət ərzində sonsuz əbədilik azca da olsa dəyişməz. İndi isə bütün bunların mövcud olduğuna əmin olduqdan sonra səadətə çatmaq üçün heç bir məcburiyyət və kifayət qədər səy göstərməməyin inkar olunması vacib deyildir. Axı hər bir düşüncəli insan bu yolun əzablı olduğuna, dünyəvi həyatın ləzzətlərindən tam imtina və çətinliklərdən keçmək tələblərinə baxmayaraq, səylə, öz yolundan sarpmadan buna can atır. Doğrudan da, çətinlik tələb olunan zaman müddəti qısadır və insan çox az bir şey itirir. (Əbədi səadətin əksinə olaraq) dünyəvi xoşbəxtlik tez ötüb keçəndir və heç də əbədi deyildir və ağıllı insan gələcəkdə daha çox pul qazanmaq naminə indi az miqdarda itirməyi üstün tutar və buna görə də çox adamların ticarətlə və istehsalla məşğul olduğunu özün görürsən. Bilik əldə etmək (yolunda) insan hətta həqarətlərə dözməyə, itkilərə, çətinliklərə və iztirablara (hazırdır) və bütün bunlar hal-hazırda itirdiklərindən dəfələrlə artıq xoşbəxtliyə çatmaq üçün onun səylərini daha da gücləndirir. Onda nəyə görə insan gələcəkdə hədsiz və son dərəcə qiymətli səadət qazanmaq naminə indi çətinliklərə qatlanmamalıdır. Yer üzərində hələ elə bir ağıllı və öz dövlətini artırmaq imkanını əldən buraxmayan bir insan yoxdur ki, bir dinar[1] və intizarlı bir ay sərf edərək, bu müddətin başa çatdığı anda adi misi təmiz qızıla çevirən «fəlsəfə» daşını əldə etməkdən imtina etsin; və o, indiki zamanda itki də belə olsa, digər bir şeyə bu dinarı xərcləməyi özünə rəva bilməz. Elə bunun kimi, hesaba gəlməz xoşbəxtlik naminə müvəqqəti aclığın əzablarından keçə bilməyən şəxs dəli adlanmağa layiqdir. Ola bilər ki, insan özünə bunu rəva görməsin, lakin ölüm hər an onunla daban-dabana gedir və axirət günündə qızıl ona heç bir xeyir verməyəcəkdir. Bu insan ola bilər ki, həmin intizarla gözlədiyi ay ərzində və ya o, başa çatdıqdan bir gün sonra öləcək və onun öz qızılından xeyir götürmək imkanı ol-

mayacaq. Buna baxmayaraq, o, bütün bu müddət ərzində onu gözləyən mənfəəti düşünərək dinarı xərcləmək haqqında fikirləşməyəcəkdir. Lakin idrakı olan insan ən çoxu yüz il davam edən dünyəvi həyatının ləzzətini həmin əbədi səadətdən nəyə görə üstün tutur? Buna səbəb Axirət gününə zəif inamın nəticəsində səadət axtarışında olan insan ağlının laqeydliyidir. Ruhi cəhətdən tam sağlam adam bir kənarda qalsın, axı, hətta zəif dərrakəli adam da xoşbəxtliyə aparan yolla getməyi üstün tutar.

AXİRƏTƏ İMANIN ZƏİFLİYİNDƏN DOĞAN DƏLİLİK.

## ALLAHA OLAN İNAMI ƏLDƏ ETMƏK VƏ ONU MÖHKƏMLƏNDİRMƏK YOLUNDA GÖSTƏRİLƏN SƏYLƏRDƏ KİFAYƏT QƏDƏR TƏŞƏBBÜS GÖSTƏRMƏMƏYİN DƏ AXMAQLIQ OLDUĞU HAQQINDA

Mən deyirəm ki, inamın zəifliyi növbəti bir axmaqlıqdır, çünki səyin kifayət qədər olmaması təkcə xoşbəxtlik yolunda hərəkət etmək və laqeydlik deyildir. Axirət həyatına münasibətdə insanlar həqiqətən dörd qrupa bölünürlər.

Bir qrup insanlar Məhşər gününə, yenidən Dirilməyə, Cənnətə və Cəhənnəmə inanırlar, çünki bütün bunlar haqqında səma qanunları dəlalət edir və Quranda da aydın şəkildə ifadə olunmuşdur. (Bu qrup insanlar) üçün fiziki məhəbbət, digər yeyilə bilən, hiss oluna bilən, duyula bilən, geyilə bilən və görünə bilən kimi hiss olunan həzlər mövcuddur. Və deyildi ki, bütün bunlara təsvir oluna bilinməyən xoşbəxtlik və səadət formaları da aiddir, zira onları «heç kim heç vaxt görməyib, eşitməyib və hətta özündə təsəvvür belə edə bilməz». Bu, əbədi davam edir və heç zaman qurtarmır. Ona yalnız biliklərin və əməllərin köməyi ilə çatmaq olar. Bu qrupa bütün müsəlmanlar, Məhəmmədə (122) qədərki bütün peyğəmbərlərin ardıcılları aiddir.

İnsanın təsəvvür edə bilmədiyi nə isə bir həzzin mövcud olduğunu təsdiq edən ayrı-ayrı ilahiyyatçı filosoflar ikinci qrupa aid olanlardır. Onlar bunu ağılın həzzi adlandırırlar, lakin bu insanlar zahiri dünyada hissi həzlərin mövcud olduğunu inkar edirlər. Bu sonuncuların təsəvvürlərdə yuxu zamanı mövcud olduğu sübut olunmuşdur, lakin yuxu oyanma ilə yox olur, əqli həzz isə əbədi qalır. Bu qrupun alimləri belə hesab edirlər ki, hiss olunan şeylərə vurulan və ürəkləri yalnız belə şeylərə cəlb olunan insanların ruh-

ları heç zaman əqli həzzə qədər yüksələ bilməz. Lakin bu, məqsədə doğru hərəkətdə qaçılmaz başısoyuqluğa gətirib çıxarmır, çünki insanın ruhundakı həzz hiss olunan, görünən, yeyilən və bu kimi digər şeylərin təsirindən yaranır. Əlamətin yaranmasına səbəb nə isə zahiri bir şeydir və həzz də həmin zahiri şeydən deyil, onun saxladığı əlamətdən yaranır. Və əgər yuxuda olduğu kimi, insanın ruhunda zahiri şeylərin təsiri olmadan əlamətlər yarana bilsəydi, bu zaman heç bir zahiri şeyə ehtiyac da olmazdı.

Üçüncü qrupp, ümumiyyətlə, həm ayıq olduqda, həm də yuxuda hiss olunan həzləri inkar edir və onlar belə hesab edirlər ki, təsəvvür fiziki mexanizmlərlə qırılmaz surətdə bağlıdır, ölüm isə ruh və bədən arasında mövcud olan və təsəvvür kimi digər hisslər üçün zəruri olan əlaqəni kəsir. Ruh bədəni tərk etdikdən sonra onu idarə etməkdən ötrü bir daha geri qayıtmır və onun üçün yalnız qəm-qüssə və sevinc qalır ki, bunlar cismani olmasa da, cismanidən daha güclüdür. Həqiqətən də, insan bu dünyada onun ruhuna sevinc bəxş edən şeylərə daha çox can atır və ruhuna ağrı verən şeylərdən daha artıq qorxur, buna görə də o, şərəfini itirməkdən qorxaraq rüsvayçılıqdan qaçmağa çalışır və intim həzzin təmin olunmasını gizlətməyi, əzablara və çətinliklərə dözməyi üstün tutur. Bəzən insan şahmatda qələbə qazanmaq naminə bir-iki gün yemək haqqında belə unudur, baxmayaraq ki, yemək cismani, qələbə sevinci isə əqli həzdir. O, qəlbində ümid etdiyi mükafata görə, yəni məhz insanların minnətdarlığı və igidlik şöhrəti naminə çox sayda düşmənin üstünə hücum çəkərək onlarla döyüşə girə bilər. Bu qrupa aid olan insanların düşüncələrinə görə, hissi şeylər ölümdən sonra mövcud olanlardan çox uzaqdır. Bunu onunla müqayisə etmək olar ki, ləzzətli bir yeməyin ətrini duyasan və ya onu dadasan, ya da sevgilinin üzünə baxıb ondan zövq alasan və ya ona öz yatacağında yer ayırasan, lakin əvvəlki müqayisədəki fərq bu saydıqlarımızdan daha böyükdür; onlar belə hesab edirlər ki, adi insan bu həzzi təsəvvür edə bilmədiklərindən onlar bunu ancaq bələd olduqları hissi həzlər vasitəsilə anlaya bilərlər. Axı balaca uşaq da hakim və ya nazir olmaq üçün səylə oxuyur və bu zaman o, bu vəzifələrin ona verə biləcəyi səadəti heç təsəvvürünə gətirə bilmir - bu uşaq ona görə oxuyur ki, ona oynamaq üçün çubuq və ya şənlənmək üçün quşcığaz və s. kimi məhz indi sevinc gətirən şeyləri vəd edirlər. Lakin quşcığazla oynamaqdan alınan ləzzəti hökmdarın və ya nazirin mövqeyi ilə müqayisə etmək olarmı?

Ancaq hər halda onun üçün mürəkkəb olanı anlamadığından uşağı daha yaxın olan şeylərlə qarşılaşdırırlar - uşaq da həmin şeyləri xoşlayır və bütün bunları ona görə edirlər ki, həmin uşaq yavaş-yavaş onun üçün səadət olanı əldə edə bilsin. Bütün sufilər və ilahiyyatçı filosoflar belə hesab edirlər və hətta ən görkəmli sufi alimləri istisnasız olaraq qəti surətdə bunu təsdiq etmişlər. Onlar göstərirlər ki, Cənnəti qazanmaq və Cəhənnəmdən qurtulmaq naminə Allaha (121) səcdə edənlər rəzil insanlardır, çünki insanlar daha nəcib məqsədlər üçün buna səy göstərirlər. Sufi şeyxləri ilə tanış olanlar, onların baxışlarını öyrənənlər və onların kitablarını oxuyanların hamısı, yəqin ki, bu əqidəni başa düşmüşlər.

Dördüncü qrupa aid olanlar bir yığın axmaqlardır ki, onların adlarını çəkməyə belə layiq deyillər və biz onları sadəcə olaraq kor adlandırırıq. Onlar belə düşünürlər ki, ölüm sadəcə mövcud olmamaqdır və Allaha (121) sitayiş etməyin və ya ona itaətsizlik göstərməyin davamı və mükafatı yoxdur, insan isə özünün mövcudluğuna qədər necə olmuşsa, eləcə də yenidən yoxluğa qayıdır. Bu insanları hətta qrup da adlandırmaq olmaz, ona görə ki, qrup[2] insanların birliyidir, bizə məlum olan məşhur alimlərin heç birinin daxil olmadığı axın isə birlik adlandırıla bilməz. Bu insanların fikirləri – öz arzularının hökmü və şeytanın idarəçiliyi altında olan və öz istəklərinin əksinə getməyə qüvvəsi çatmayan axmağın fikirləridir. Onun yüngülxasiyyətliliyi ona öz arzularının əksinə gedə bilmək iqtidarında olmamasını dərk etməyə imkan vermir və o, bu cür geriliyinin səbəbindən özünə təsəlli verir ki, guya həmin düşüncələr labüddür və əslində, elə həqiqətin özü budur. Daha sonra isə o, digər bir kimsənin onun tərəfinə keçməsini arzulayır və həmin yalana və arzuların ardınca getmək kimi öz qəlbini dolduran şeylərə onu da cəlb etməyə başlayır. Digər bir axmağın da onun ardınca getməyinin əsas səbəbi də budur, xüsusən də bəzən bir sıra vicdansız adamlar belə bir yalana əl atırlar ki, guya hansısa bir alim, məsələn, Aristotel, Platon və ya hətta bir qrup filosof da onlara nə vaxtsa belə deyib. Tədricən onlar həmin adamı inandırırlar ki, onun elmi məşhur alimlərin bildiklərindən çox ola bilməz. Onlar uzun müddət öyrənmişlər, lakin hamısı faydasız olmuşdur. Və həmin zavallı da özünün aldandığını hiss etmir, o inanır, çünki onun qəlbi buna meyllidir və o, bu və ya digər alimin məhz bu cür deyib-demədiyi barədə sübut tələb etmir. Bax əgər ona bir dirhəmin[3] itməsi barədə xəbər versəydilər, onda dəlil-

sübut olmadan o, buna inanmazdı. Əgər ona desəydilər: «Sənin atan sənə saxladığı puldan bir nəfərə on dirhəm verməyə söz vermişdir və bu barədə həmin adamda şahidlərin imzaladığı məktub vardır», - onda o, mütləq soruşardı: «Hansı səbəbdən? Bütün bunları təsdiq edə bilən canlı şahid varmı?» Buna baxmayaraq, o, həmin alimin dediklərini həqiqətdə eşidən şahidlər dəvət etmədən və onun heç olmasa bir əsərini – qoy lap bu əsər digər bir adamın xətti ilə yazılsın – tələb etmədən adı çəkilən alimin doğrudan da bu fikri dəstəklədiyinə inanır. Və bütün bunlar axmaqlıqdan irəli gəlir, çünki hətta öz qulaqlarınla eşitsən də ki, bu və ya digər bir adam nə barədəsə açıq-aşkar danışır, yenə də (yadda saxla ki, həmin şəxsə) dərhal inanmaq lazım deyil. Sadəcə olaraq kiminsə arxasınca getmək meylindən irəli.gələn inam da lazım deyil, çünki peyğəmbərlərin, övliyaların[4], alimlərin – insan qruplarının da – ardınca getmək səhvlərdən qorunmayan bir adamın ardınca getməkdən daha məntiqlidir.

Ey məsləkdaş, bu mülahizələrimizi öyrəndikdən sonra aşağıdakılar artıq sənin üçün aydındır. Əgər indi sən yanlış yolla gedən həmin bu qrupun fikirlərinə tərəfdarsansa, onda sənin vəziyyətini aşağıdakı təyinetmələrin biri ilə xarakterizə etmək olar: ya sən (bu fikrin) yanlışlığına əminsən, ya onun yanlış ola biləcəyini düşünürsən, ya sən onun yanlışlıqdan daha çox həqiqi olduğunu düşünürsən, lakin az da olsa yanlış ola biləcəyinə ehtimal var, ya da onun həqiqiliyinə tam inanırsan. Hər nə cür olsa da, sən dünyəvi həyatın ləzzətlərini unudaraq bilik qazanmalı və faydalı əməllər icra etməlisən: əgər sənin idrakın sağlamdırsa və səndə müdriklik varsa, onda həmin fikrin səhv olduğuna inanırsansa və ya onun səhv ola biləcəyini düşünərək ağlının - hər hansı bir mənfəət ardınca dənizləri dolanmaq kimi tələbinə oxşar - onların ardınca getmək tələbinin iradəsi altındasansa, yenə də bu əməllərin icrası sənin vəzifən olaraq qalır.

Dövlət başçısı olmaq (kim bunun arzusundadırsa), ya nazir stolunu qazanmaq və indikindən daha imtiyazlı mövqe tutmaq məqsədi ilə gənclikdə biliklərin qazanılmasına gəldikdə isə, bunların hamısının nəticəsi yalnız ehtimal olunandır, axı insan öz arzularına çatmağında əmin deyildir. Məsələn, dünyəvi həyata bağlı olan və kimyagərliyin mövcud olduğuna müəyyən qədər inanan, lakin eyni zamanda onun mövcud olmadığını da mümkün hesab edən bir şəxsi təsəvvür edək. Əgər o bilsə ki, bir ay müddətində

müəyyən əmək sərf edərək kimyagərliyin – əgər o mövcuddursa - sirlərinə sahib ola bilər və sonra isə bütün qalan həyatı – bu, bir aydan qısa da ola bilər,.ya da ola bilər ki, daha uzun davam etsin - boyu bundan həzz alacaq, onda öz idrakına qulaq asaraq bu nəticəyə gələcəkdir ki, yaxşı olar bir ay müddətində bütün çətinliklərə dözsün və bu çətinliklərin onu indi və zəruri olaraq gözlədiyinə, lakin mənfəətin hələlik uzaqda olmasına və özünün, ümumiyyətlə, arzusuna çatacağı hələ naməlum qalmasına baxmayaraq, bu çətinliklərdən qorxmasın.

Əgər sən həmin adamların mülahizələrinin doğruluğuna inanırsansa, lakin bununla bərabər, zəif də olsa, peyğəmbərlərin, övliyaların, alimlərin və ümumiyyətlə, digər qrup insanların fikirlərinin düzgünlüyünün mümkün ola biləcəyini düşünürsənsə, bu zaman idrakın yenə də sənə daha sakit və təhlükəsiz yolu seçməyini məsləhət görəcəkdir. Məsələn, əgər sən şahın yaxın ətrafındansansa və sənə öz qohumlarından birinə himayə göstərmək (məsələn, onu qulluğa götürmək) izni verilibsə, onda düşünəcəksən ki, yəqin hökmdar səndən razıdır və bununla səni mükafatlandırır, lakin digər əks mülahizən də ola bilər – o, sənə qəzəblənmişdir və səni bununla cəzalandıraraq biabır etmək istəyir ki, bütün qalan həyatın bu cəza altında keçsin – və bu zaman ağılın bu təhlükədən yayınmağın daha düzgün olduğunu deyəcəkdir. Çünki əgər sən əvvəlki fikrində dursan və sonradan haqlı çıxsan, onda bir dinar qazanmış olursan ki, bu da sənə az bir müddətə bəs edər, əgər səhv etmiş olsan, onda cəzan çox ağır olacaq və bütün ömrün boyu davam edəcək, deməli, gümanlarının doğru çıxmasından qazanacağın mənfəət onların yanlış olması zamanı səni gözləyə biləcək bədbəxtliklə müqayisə edilə bilməz. Buna görə də əgər sən yemək tapsan və kimsə sənə onun zəhərli olduğunu desə, bu adam öz mövqeyinə görə peyğəmbərdən aşağı olsa və dediklərinin həqiqət olduğunu möcüzə ilə təsdiq edə bilməsə, onda sən, yəqin ki, onun yalan danışdığını düşünəcəksən, çünki qərara gəlmisən ki, bütün peyğəmbərlər yalan danışır, lakin ola bilər ki, o, düz deyir, ancaq düşünürsən ki, həmin yeməkdə onun dadındakı ləzzətdən və yediyin zaman hiss edəcəyin həzdən başqa heç nə yoxdur, lakin o zəhərlidirsə, bu artıq labüd olaraq ölümdür. Və idrakın sənə təlqin edəcək ki, əgər ağıllısansa, belə bir vəziyyətdə ehtiyatlı olmaq daha yaxşıdır. Buna görə də nifaq toxumu səpənlərə və axirət həyatı haqqında mübahisə edənlərə Əli (124) belə demişdi: «Əgər

hər bir şey sənin hesab etdiyin kimidirsə, onda biz hamımız xilas olmuşuq, yox əgər mənim söylədiyim kimidirsə, onda sən məhv oldun, mən isə xilas yolundayam». Bu ifadələrlə onun Məhşər gününə şübhə ilə yanaşdığını düşünməməlisən, bu sadəcə olaraq müsahibinin axmaqlığı səviyyəsində olan bir etirazdır ki, onu başqa cür, yəni məntiqli dəlillərin köməyi ilə başa salmaq mümkün deyildir. O, bu yolu cahil və Allaha (121) sitayiş etməkdən çəkinən insanlarla münasibətdə bizə kömək etmək məqsədi ilə göstərmişdir.

Beləliklə, bizə aydın oldu ki, hətta mövcudluğuna inam az olduqda belə, yenə də nəhəng və dəhşətli şey özündən kiçik, lakin mövcudluğuna daha çox inamlı şeylərdən üstün tutulur, çünki ölçü çox böyük əhəmiyyət kəsb edir. İndi də gəlin həyat yolunun sonuna nəzər yetirək və dünyəvi həyatdan ləzzət alanların varlığından qalacaq şeylərə baxaq, halbuki eyni zamanda digər üç qrup öz inandıqlarına – kamil bir axirət sevincinə və onun davamına – qovuşacaq və onların yer üzündə üz döndərdikləri şeylərin indi əvəz kimi qazandıqları ilə müqayisədə necə çox əhəmiyyətsiz olduğuna əmin olacaqlar. Əgər sən dördüncü qrupun fikirləri ilə razısansa, onda öz cahilliyin və qafilliyin səviyyəsində sənə iki üsulla müraciət edək. Birincisi, sən həmin fikirlə səhvlərdən kənar, həqiqi və təkzibedilməz dəlillər olmadan razılaşmısan, buna görə də peyğəmbərlərin, övliyaların, müdriklərin və bütün ağıllı adamların yan keçdikləri dəlillərin sənin görə bildiyini zənn etmək düzgün olmazdı, onda bu halda sənin özünün səhv etmədiyinə kim zəmanət verə bilər, kim səni səhvlərdən qoruya bilər? Əgər sən başqalarının doğru olduğunu, özününsə səhv etdiyini mümkün hesab edirsənsə, onda sən üçüncü qrupa aid olursan. Lakin sən bunu mümkün hesab edəcək qədər alicənab deyilsənsə, yəni başqalarının səhv etdiyinə tam əminsənsə və ruhun bir varlıq kimi ölümdən sonra mövcud olduğunu və Məhşər günündə qayıdacağını mümkün hesab etmirsənsə və bütün düşündüklərinə ikinin vahiddən böyük olduğu qədər və qara ilə ağın birləşə bilməyəcəyi qədər inanırsansa, onda sənin kimi axmağı islah etmək mümkün deyil və Allah (121) məhz beləleri haqqında buyurur: «...Onlar heyvan kimidirlər, bəlkə də, daha çox zəlalətdədirlər» (7:179). Lakin bu qrupa aid olanlar axirət sevincinin mövcud olduğunu inkar etsələr də, dünyəvi ləzzətlərin mövcud olduğunu qəbul edirlər. Yer üzündəki ən böyük sevinc isə şöhrət və ehtiram, yüksək mövqe və

qüdrətli olmaqdır, kədər və müsibətlər səndən yan keçir, sağlamlıq və sevincsə həmişə səni müşayiət edir. Lakin bütün bunları da yalnız həqiqi biliklə və xeyirxah əməllər vasitəsilə əldə etmək olar. Alimin öz biliklərindən və yenicə öyrəndiyi şeylərdən (həqiqi alim fasiləsiz dərketmə fəaliyyətindədir) – xüsusilə də əgər bu fəaliyyət ilahi məsələlərə və səma səltənətinə aiddirsə – aldığı ləzzət hamıya məlumdur, lakin bu ləzzəti yalnız həmin sualların mahiyyətini dərk edən insanlardan başqa heç kəs tam surətdə hiss edə bilməz. Biliyin sərhədi olmadığı kimi, həmin ləzzətin də həddi-hüdudu yoxdur və bilik axtarışında olanlar nə qədər çoxsaylı olsalar da, heç bir zaman bir-birilə toqquşmurlar, çünki elm hamıya bəs edir. Əksinə, əgər alim bu həyatın idarə edilməsinə və onun ləzzətlərinə can atmayaraq, doğrudan da, elmi axtarışlara səy göstərirsə, onda o özü kimi yeni biliklər axtaran insanların sayca çox olmasına sevinir, çünki bu dünya burada ləzzət axtaran insanların çoxalması ilə getdikcə darısqal olur, elmin isə hüdudları onu əldə etmək arzusunda olanların sayının artması ilə daha da genişlənir. Və daha sonra, arzulanan şey ona can atan üçün ən böyük var-dövlətdir və əgər bunu sənə bağışlayana – Allaha (121) – səylə müraciət edirsənsə və bütünlüklə özünü ona həsr edirsənsə, onda bu var-dövlət daha uzunömürlü olacaqdır, buna görə də şah və hökmdarların həmişə hakimiyyətlərini itirməkdən qorxduqlarını və onların öz şöhrətlərinin alimlərin şöhrətlərinə bərabər olmasını arzuladıqlarını aydın görürsən.

Əməl dedikdə isə biz daxildən gələn arzuların idarə olunmasını, idraka tabe olaraq onu idarə edə bilməməsi və dünyanı idarə etmək imkanlarının axtarışlarına istiqamətləndirə bilməməsi üçün qəzəb və bu kimi digər keyfiyyətlərin susdurulmasını nəzərdə tuturuq. Yalnız öz arzularını idarə etməyi öyrənən şəxs əsl mənada azad olur və o, həqiqi hakim olur. Elə buna görə də bir zahid hökmdara müraciətlə: «Mənim var-dövlətim səninkindən çoxdur», - deyir. Hökmdar soruşur: «Bu necə olur?». Zahid cavab verir: «Qulluğunda durduğun şey mənim qulluğumdadır» və bununla onu nəzərdə tutur ki, hökmdar öz arzularının quludur, özü isə arzularını özü idarə edir. Və öz arzularının qulu olan, ona müqavimət göstərə bilməyən və onları idarə edə bilməyən şəxs, həqiqətən də, qul və əsirdir, o, fasiləsiz olaraq yorğunluq hiss edir və hər an əzab çəkir, çünki o, öz arzuladığı şeyi bir dəfə əldə edə bilsə də, buna uzun müddət nail ola bilməz. Sonra isə bu təhlükəli bir hal

alır, çətinliklər yaranmağa başlayır və sonda isə (öz arzularını) məhdudlaşdırmağa məcbur olur. Və doğrudan da, arzuların sakitləşdirilməsilə bədbəxtliklərin səbəbləri də azalmağa başlayır, öz üzərində işləməkdən və mübarizədən başqa, onlardan can qurtarmağın digər üsulu yoxdur və elə bu da əməllərin məqsədidir.

Beləliklə, xeyirxah əməllərin sahibi olan alim adam öz xoşbəxtliyini məhdud dünyəvi həyatda görənlər üçün ən yüksək mövqedə duran adamdır. Daim öz arzularının ardınca gedən və ağılın səsinə qulaq asmaq istəməyən isə dünyəvi həyatda ən bədbəxt adamdır. Hamı belə düşünür. O, axirət həyatında da bədbəxtdir – dörd qrupdan üçü bu fikirdədir, heç kimin ağıllı saymadığı yalnız bir yığın axmaq bununla razı deyildir ki, onlar da heç kimlə hesablaşmırlar və heç kim də onlarla hesablaşmır. Beləliklə, əqlin (sübutları ilə) köməyi ilə aydınlaşdırdıq ki, axirət dünyasına ancaq biliklərlə və əməllərlə hazırlaşmaq lazımdır və bunda lazımi qədər səy göstərməyən şəxs cahildir. Əgər sən xəbər alsan ki, «Nəyə görə insanların çoxu buna lazımi qədər səy göstərmir, axı onlar Məhşər gününə inanırlar?» - onda bil ki, buna səbəb onların yuxarıda deyilənlər haqqında düşünmək arzusunda olmamalarıdır. Onların qayğısızlığı daim davam edir və bu onların vaxtını tam məşğul edir, nə qədər ki, onların arzuları bir-birinin ardınca gəlir – bu məhz belə də baş verir, – digər heç bir şey haqqında düşünmürlər. Və onları bu laqeydlikdən ancaq təmiz qəlbli ustad qopara bilər. Lakin beləsi yer üzündə yoxdur, hətta əgər olsa da, ona heç kim qulaq asmır, qulaq assa da belə, dərhal çox mütəəssirlənir, bu ona təsir edir və o, bütünlüklə özünü xeyirxah əməllərə həsr etmək qərarına gəlir, lakin həmin an qəlbindəki arzularından biri ona sahib olur, həmin arzu bütün öyüd-nəsihətləri məhv edərək biganəlik pərdəsini onun üstünə çəkir və ağıl sahibi olan bu insan yenidən onu qorumaq istədiyimiz şeyə qaytarır və bu hal onların hər biri bu dünyadan köçənə tövbədən başqa heç bir şey qalmayana qədər davam edir, vaxt isə ötüb keçmişdir və tövbə də artıq kömək edə bilməz.

Bütün bədbəxtliklərin ilkin səbəbi olan biganəlikdən bizi qoruması üçün Allahdan (121) kömək diləyirik!

# ELMİN VƏ ƏMƏLLƏRİN XOŞBƏXTLİYƏ APARAN YOL OLMASI HAQQINDA

Əgər sən söyləsən: «Səadət yolu ilə hərəkət etmək ağıllı insanların ləyaqəti, buna münasibətdə yüngülxasiyyətli olmaq axmaqların səhvi olması mənə aydın oldu, lakin nə etmək lazım olduğunu bilməyən şəxs bu yolla necə gedə bilər? Nəyin köməyi ilə?» – onda bil ki, elm və əməl məhz həmin yoldur və bunu öyrənməyin iki üsulu vardır: birincisi – ümumi yoldur və xatırlatdığımız üsula uyğun gəlir, bu, bütün üç qrupun yekdil olduğuna müraciətdir, çünki müvəffəqiyyətin və xilasın yalnız elm və əməllərin birləşməsi ilə mümkün olması fikrində onlar bir-birilə həmrəydirlər, əlavə olaraq onlar düşünürlər ki, elm əməldən daha yüksəkdə durur və əməl elmin davamıdır, elm müəyyən məqsədə çatana qədər əməli çəkib aparır və buna görə də Allah-Təala buyurur: «Pak söz Ona tərəf yüksələr və pak sözü də yaxşı əməl qaldırar» (35:10). Öyrənilmə zamanı bilikdən xeyirxah söz yaranır, məhz həmin söz Allah dərgahına yüksəlir və öz yerini tutur. Əməl isə – onun xidmətçisi kimi – onu qaldırır və aparır. Bu, biliyin yüksək mövqeyinin göstəricisidir.

Birinci qrupun fikri – bu, şəriətin mahiyyətinin ilk anlayışının tərəfdarlarının fikridir, burada bilik və əməllərlə xilas əlaqəsi açıq-aşkardır və bu haqda sonsuz danışmaq olar. Allaha (121) və Məhşər gününə inanan sufilər və filosoflar Onun keyfiyyətləri və Günün əlamətləri, xüsusiyyətləri haqda müxtəlif mülahizələr irəli sürsələr də, biliyin və sitayişin məhz səadət olduğunu həmrəyliklə müdafiə edirlər. Doğrudan da, bəzi adamların bu ümumi fikirlə razılaşmayaraq elmin və əməllərin bütün incəliklərinə baş vurması axmaqlıqdır. Əgər kimsə xəstələnibsə, tibbi kitablarda xəstəliyinin diaqnozuna münasibətdə yekdilliyi və bu xəstəliyin müalicəsi üçün lazım olan dərmanların təyinində fikir ayrılığını müəyyən etmişdir (bəziləri müəyyən içməli dərmanı daha müalicəvi sayır, digərləri isə yox), belə halda xəstənin tərəddüd etməsi axmaqlıqdır, çünki ağıl həmin dərmanı tələb edir. Ola bilər ki, xəstə müalicənin üsulunu digərlərini təqlid edərək deyil, əgər heç kimdən asılı olmayaraq, özü qərar verərsə, xəstəliyin səbəblərini və həmin xəstəliyin müalicəsi üçün məhz həmin dərmanın uyğun gəldiyini təyin edərək tapar və bu da düzgün qərar olar, bununla da təqlid etməkdən və digərlərin arxasınca getməkdən qurtularaq bəsirət

zirvəsinə qalxar – sufizmin və digər cərəyanların tərəfdarları məhz belə hesab edirlər: onların fikrinə görə, həmin zirvəni ölümün mahiyyətini anladığın zaman, yəni onun gəlişi ilə alətin (bədənin) faydasız hala düşdüyünü və istifadə edənin (ruhun) heç də yox olmamasını başa düşdüyün zaman təxəyyülün və dərin biliyin vasitəsilə fəth edə bilərsən.

Daha sonra sən bilməlisən ki, hər bir yaradılmışın xoşbəxtliyi, rifahı və asudəliyi onun kamilliyə çatmasındadır. Və bil ki, insanın kamilliyi bütün dərk olunan şeylərin mahiyyətini tam həqiqi şəklində, heç nə uydurmadan və insanı heyvanla eyniləşdirən hisslər olmadan anlamasındadır. Bunu da bil ki, ruh öz mahiyyəti ilə bu cür dərketməni arzulayır və öz təbiəti ilə buna hazırdır, lakin o, bədənin daim ona mane olan arzularının təsiri altında olduğundan bu da onu yayındırır. Arzular insanı öz təsiri altına salmağa başladığı andan insan öz idrakını onların əsirliyindən və qulluğundan azad edərək, özünü bütünlükdə təkcə yer və səma aləmi haqqında düşüncələrə və müşahidələrə deyil, həm də özü haqqında və özündə xəlq olunmuş möcüzələr haqqında düşünməyə sərf edərək həmin arzularla mübarizəyə başlamalıdır, yalnız bununla o, mükəmməlliyə və axirət dünyasındakı xoşbəxtliyə çata bilər, zira xoşbəxtliyin mənası mükəmməlliyin dərəcələrinin saysız-hesabsız olmasına baxmayaraq, insanın mümkün qədər özünə qalib gəlməsindən ibarətdir. Lakin nə qədər ki, insan, məsələn, mahir aşpazın narkotika əlavə edərək hazırladığı yeməkdən dadıb, bu səbəbdən sonradan özündə bu yeməyə qarşı güclü həvəs hiss edən şəxs kimi, öz hissləri və təsəvvürləri, ruhi maneələri ilə məhdudlanıb, bir o qədər də o, bu zövqü dərk edə bilməyəcəkdir. Və ölüm də narkotikanın yox olması kimidir. Mən eşitmişəm ki, sufizmin ilk ardıcıllarından biri aşkar şəkildə bildirmişdir ki, Allah-Təalaya doğru gedən şəxs əgər bacararsa, Cənnəti elə bu dünyanın özündə görə bilər və Cənnət yeməklərini də öz qəlbində hiss edər. Lakin yalnız dünyəvi həyata bağlılıqdan tam qurtarmaqla və öz qəlbini paklaşdırdıqdan sonra ilahi bir təb onun qarşısında əsl Mahiyyəti açana qədər özünü Allah haqqındakı düşüncələrə sərf etməklə Cənnəti qazanmaq olar. Buna çatmaq xoşbəxtliyin özüdür və əməlsə bu işdə ona kömək edir. Və bu qrupa aid olanlar belə hesab edirlər ki, onlar elmin və əməlin xoşbəxtliyə münasibətini anlamışlar, bu isə imana yetişmənin ikinci yoludur. Onların söylədikləri doğrudur və Allahın (121) buyurduğu «Bizim uğrumuzda ci-

had edənləri öz yollarımıza (Bizə tərəf gətirib çıxaran behişt yollarına) qovuşduracağıq» (29:69) surəsində olduğu kimi, yalnız ardıcıl mübarizə və özünütərbiyələndirmə vasitəsilə əldə oluna bilər. Əgər sən də buna nail olmaq istəyirsənsə, onda mübarizə aparmalı və özünü bütünlüklə bu məqsədə çatmaq üçün sərf etməlisən. Ola bilər ki, o zaman sənin də qarşında inkar və ya təsdiq vasitəsilə həll olunan məsələnin həqiqi vəziyyəti açılacaq və onda bu da, məsələn, xəstənin məqsədi bütün həkimlərin yekdil olaraq təsdiqlədikləri xəstəlikdən heç bir mübahisə etmədən qurtulmağa səy göstərməsi kimi, əgər sənin də mənə verdiyin sual mübahisə üçün deyil, müvəffəqiyyətə yetişməyə səy göstərmək məqsədilə verilibsə, haqqında bütün üç qrupun fikirlərinin üst-üstə düşdüyü şeyin icrasında işi və əməli başlamaq üçün kifayət edər.

## ÖZÜNÜTƏRBİYƏ, ONUN GÜCÜ VƏ QAYDALARI (NÜMUNƏ VƏ ÜMUMİLƏŞDİRMƏ TƏRZİNDƏ)

Əgər sən desən ki, «Mənə aydın oldu ki, bilik qazanmaq və xeyirxah əməllər həyata keçirmək mütləq lazımdır, lakin elm çox böyük saydadır», onda bil ki, əməllər də əvvəl keyfiyyətinə, sonra isə kəmiyyətinə görə bir-birindən fərqlənirlər. Xəstəliyin müalicəsi üçün dərmanın növünü, miqdarını və istifadə zamanını, onun həmişə, yoxsa fasilələrlə qəbul edilməli olduğunu və digər xırda-para şeyləri də bilmirsənsə, onda təkcə müəyyən dərmanın uyğun gəlməsini bilmək kifayət etmir və bütün bunları bilmək xəstə üçün zəruridir. Bil ki, bütün insanlar sənin verdiyin suala münasibətdə iki qrupa bölünürlər: birincilər təqlidlə kifayətlənəndirlər – onların axtarışlara ehtiyacı yoxdur və təqlid etdikləri insanların göstərdikləri yolla hərəkət edirlər, ikincilər isə öz həkiminə qulaq asan və eyni zamanda özünün də həkim olmasına çalışan xəstələr kimi heç təqlid etmirlər. Bu yol çox təhlükəlidir və uzun zaman tələb edir, bunun üçün tək, vahid və təkrarolunmaz şəraitsə uzun illər ərzində yalnız bir dəfə yaranır. Biz isə səni təqlid uçurumundan çıxardaraq digər bir yola istiqamətləndirən şeyi nişan verəcəyik. Əgər Allah-Təala (121) istəsə və sənin qəlbin bu işi, həqiqətən də, sona çatdırmağa səy göstərərsə, onda cihad[5] edərək bunu əldə edə bilərsən. Və sən nə istədiyini bilməyəcəksən – əvvəlcə sən öz ruhunun, onun gücünün və xüsusiyyətlərinin olduğunu öyrənməlisən.

Zeydi tanımayan şəxs onu başa düşə bilərmi? Cihad isə ruhun müvəffəqiyyət qazanması üçün onun təmizlənməsi və ancaq bu yolla şəfa tapmasıdır və bu barədə Allah-Təala (121) buyurub: «Nəfsini təmizləyən mütləq nicat tapacaqdır. Onu batıran isə, əlbəttə, ziyana uğrayacaqdır» (91:9-10). Paltarın nə olduğunu bilməyən şəxs aydındır ki, onu necə təmizləməyi də bilməyəcəkdir. Burada ən başlıcası ruhun mahiyyətinin başa düşülməsidir. Allah-Təala (121) ona çox böyük əhəmiyyət vermiş və onu xüsusi qiymətləndirmək, ehtiram göstərmək istədiyi üçün özünə aid etmişdir. Allah-Təala (121) buyurur: «Mən onu tamamlayıb (insan şəklinə salıb) öz ruhumdan (özümün yaratdığım ruhdan) üfürən kimi ona (hörmət əlaməti olaraq) səcdə edin». Bununla, O göstərir ki, insan gözlə görünə bilən bədəndən, idrak və fəhmlə anlanılan ruhdan təşkil olunmuşdur – O, insanın bədənini torpağa, ruhunu isə özünə aid etmişdir. Ruh[6] dedikdə, O, bizim qəlb, can dediyimiz şeyi nəzərdə tutmuşdur və insanların diqqətini bununla ona yönəldir ki, insani ruhun İlahi əsası vardır və o dünyəvi, rəzil bədəndən yüksək və əzəmətlidir, buna görə də Allah (121) buyurur: «(Ya Məhəmməd!) Səndən ruh (ruhun mahiyyəti və keyfiyyəti) haqqında soruşarlar. De ki: "Ruh Rəbbimin əmrindəndir..."» (17:85). Belə deyirlər ki, Allah (121) tərəfindən göndərilən kitabların birində deyilir: «Özünü dərk et, onda öz Tanrını da dərk edərsən». Bizim peyğəmbərimiz (122) də buyurmuşdur: «Özünü hamıdan yaxşı tanıyan şəxs öz Allahını da hamıdan yaxşı tanıyır». Allah (121) buyurur: «Allahı unutduqları üçün Allahın da onları özlərinə unutdurduqları (xeyirlərini başa düşməyən) kimsələrə bənzəməyin» (59:19) və bununla da bu iki şey arasındakı qarşılıqlı bağlılığa və insanın bir şeyi unutduğu zaman digərini də unutmağa məhkum olduğuna nəzər-diqqəti cəlb edir və buna görə də Allah (121) buyurur: «Biz öz qüdrət nişanələrimizi onlara həm xarici aləmdə (kainatda, göylərin və yerin ətrafında), həm də onların öz daxilində mütləq göstərəcəyik» (41:53). Allah (121) həm də buyurmuşdur: «Sizin özünüzdə də (Sizi yaradanın birliyini sübut edən) əlamətlər vardır» (51:21). O, bununla nəinki insanların, hətta heyvanların da görə bildikləri bədəni nəzərdə tutmur. Ümumiyyətlə isə, özünü tanımayan bir şəxs başqasını da tanıya bilməz. Allahın (121) öz qullarına rəhmindəndir ki, insanın çox kiçik olduğuna baxmayaraq, onda, bütün dünyanın möcüzələri ilə müqayisə oluna bilən bu qədər möcüzələr yaratmışdır və insan sanki dünyanın xırdaca bir su-

rətidir. O, bunu ona görə etmişdir ki, insan düşünərək Allahı (121) dərketməyə qədər yüksələ bilsin.

Əgər sən: «Əgər sənin bütün təfərrüatı ilə və uzun söhbət vasitəsilə danışmaq imkanın yoxdursa, onda mənə ruhu qısaca olaraq elə təsvir et ki, bu qısa təsvir məndə bütün təfsilatı ilə öyrənmək arzusu oyatsın», - deyərək müraciət etsən, onda bil ki, canlıların ruhunda iki qüvvə birləşir ki, bunlardan biri hərəkətləndirici, digəri isə dərkedən qüvvədir. Hərəkətləndirici qüvvə də təhrik edən və icra edən qüvvə kimi iki növə bölünür. İcra edən qüvvə əzələlərin uclarında olan əsəb sinirlərində yaranan qüvvələrdir ki, onların da vəzifəsi özünün başlanğıc vəziyyətinə qayıtması üçün həmin əsəb sinirləri ilə əlaqəli olan vətərləri və sinirləri özünə tərəf çəkən əzələləri gərmək və ya onları boşaltmaqdır, bu zaman sinirlər isə bağlarla birlikdə başlanğıc yerinin əksi olan tərəfə istiqamətlənəcəklər və bu da öz növbəsində - meyl və istək qüvvələri olan - təhrik edici qüvvəyə qulluq edir. Təsəvvürdə arzu olunan şeyin şəkli yaranan kimi təhrikedici qüvvə hərəkətə rəvac verir - bundan da qorunmaq lazımdır – və o, icraedici qüvvəni hərəkətə sövq edir, buna görə də təhrikedici qüvvə iki hissəyə bölünür: o, bunlardan istək qüvvəsi adlanan birincisini insanın düşüncəsinə görə, həzzə çatmaq üçün ona zəruri və faydalı olan şeylərə həmin insanı yaxınlaşdıran hərəkətə və qəzəb qüvvəsi adlanan digərini isə öz sahibi olan insana, onun fikrincə, özünə ziyan gətirən və onu qələbəyə çatmağa mane olan şeyləri kənarlaşdırmağa imkan yaradan hərəkətə istiqamətləndirir. Dərkedici qüvvə də öz növbəsində iki - xarici və daxili qüvvəyə bölünür. Xarici qüvvə beş hissdən ibarətdir və biz onlar haqqında çox danışmaq mümkün olsa da, uzun-uzadı mülahizələr irəli sürməyə girişməyəcəyik, çünki məqsədimiz bütün bunları ümumiləşdirərək danışmaqdır. Daxili qüvvə də beş tərkibdən ibarətdir ki, bunlardan birincisi gözlərimizi yumduğumuz anda təsəvvürümüzdə qalan şeylərə təsir edən qüvvədir və bu, dərk olunan şeyi bütün beş hiss tərəfindən qəbul etdiyi üçün toplayıcı adlanan həmin qüvvədir ki, görünən şeyin təsvirində qalır. İkinci qüvvə bunu qoruyub saxlayan qüvvədir, zira insanın hər hansı bir təsviri əldə etmək üçün istifadə etdiyi qüvvə onu qoruyub saxlamaq üçün istifadə etdiyi şeydən fərqlənir, məsələn, şam öz quruluğunun sayəsində müəyyən şəkli ala bilir, lakin öz nəmliyinin hesabına həmin şəkli qoruyub saxlayır, su isə onu mənimsəmir, yalnız saxlayır. Bu iki qüvvə isə – dərk olunanı

beş hiss vasitəsilə qəbul edən və onu qoruyub saxlayan – beyinin orta hissəsində yerləşir. Onların yeri oradır və tibbin köməyi ilə məlum olmuşdur ki, əgər həmin hissəyə ziyan vurularsa, bu qüvvələr zəifləyər. Üçüncü, dərk edən qüvvə beyinin orta boşluğunun uc hissəsində yerləşir, o, naməlum düşüncəni məlum kimi dərk edir və bu həmin qüvvədir ki, qoyuna canavardan qaçmaq, balasını isə sevmək lazım olduğunu göstərir. İkinci qüvvənin surəti qoruyub saxladığı kimi, dördüncü qüvvə də bu toxunmaqla hiss edilə bilinməyən mənaları qoruyub saxlayır, o, düşüncəni, mənanı qoruyub saxlayır və beyinin son boşluğunda yaşayır. Bu qüvvə yaddaş adlanır. Beyin boşluğunun ortasında isə surətin qorunub saxlanması və mənaların qorunub saxlanması arasındakı səviyyədə olan düşüncə qüvvəsi yerləşir; o, təsəvvürdə mövcud olan şeylərin hissələrini bir-biri ilə birləşdirir və dərketmə qüvvəsinin qərarına və qaydalarına uyğun olaraq onları bir-birindən ayırır. Yaxşı olar ki, hərəkətverici qüvvələrlə birlikdə o da qeyd olunsun, ona görə ki, o, hərəkət növlərindən istifadə edərək təsəvvürdə ayrı olaraq mövcud olanları birləşdirir və birlikdə olanları ayırır və o, birləşdirməklə və ayırmaqla təsəvvürdə hal-hazırda mövcud olmayan nəsə yeni bir şeyi yaratmağa qabildir. Təkcə insanda olan düşünmə qüvvəsindən başqa, haqqında danışdığımız bütün qüvvələr həm insanda, həm də heyvanlarda eyni cür olaraq mövcuddur, lakin heyvanlarda təsəvvür adlanan elə bir şey də vardır ki, onun qüvvəsi insanda mövcud olan düşünmə qüvvəsinin hüdudlarına qədər çata bilir.

İnsanın ruhunun qüvvələri isə dərketmə qüvvəsi və fəaliyyət qüvvəsi kimi iki hissəyə bölünür və bunların hər ikisini idrak adlandırmaq olar, lakin onların ancaq adları ümumidir, çünki fəaliyyət qüvvəsi yalnız ona görə idrak adlanır ki, o, dərketmə qüvvəsinə xidmət edərək onun əmrlərini və qərarlarını yerinə yetirir. Fəaliyyət (qüvvəsi) – bu, ruhun mənası və gücüdür, bu, dərkedən nəzəri qüvvənin – bu barədə hələ söhbət açacağıq – fərziyyəsilə ağılın və düşüncənin təyin etdiyi bu və ya digər fəal işi yerinə yetirmək üçün bədənin hərəkətə başlamasıdır. Fəaliyyət qüvvəsindən başqa, bütün qüvvələr asılı və ram edilmiş olmalıdırlar. Fəaliyyət qüvvəsi heç bir təsirin altında olmamalıdır, digər qüvvələr isə sakit olmalı və fəaliyyət qüvvəsinin qərarlarına müvafiq hərəkət etməlidir. Əgər fəaliyyət qüvvəsi asılı olsa, bu zaman onda arzularla məhdudlanmış formalar yaranar ki, bu da yaramaz key-

fiyyətlər adlanır, əgər o, liderlik edərsə, bu zaman onda xeyirxah və ya tərifəlayiq keyfiyyətlər üstünlük təşkil edər. Ola bilər ki, başqalarını asılı edən və başqalarını izləyən və ya başqalarını idarə edən və onları özünə tabe edən bütün istək və qüvvələrdən əmələ gələn şeyləri ruhi keyfiyyətlər adlandırırlar. Lakin ümumiyyətlə desək, bir ruhi keyfiyyətin iki tərəfinin mövcud olması mümkündür, zira bu qüvvədə olan başqalarına tabeolmanın başqaları tərəfindən idarəolunma ilə qırılmaz bağlılığı vardır və bu da ləyaqət adlanır.

Bütün dediklərimizi ümumiləşdirərək bunu qeyd etməliyik ki, ruh beş hisslə dərk oluna bilən şeylərdən daha yüksəkdə durur, lakin o, ondan sonra qalan və onun fəaliyyətini nişan verən şeylər haqqında irəli sürülən mühakimələrin sayəsində idrak vasitəsilə dərk olunur. Ruh iki tərəfdən – özündən aşağıda duranla və özündən yuxarıda duranla – əlaqəyə malikdir. Və onun hər bir tərəf üçün özünün bu tərəflə əlaqəsini idarə edən qüvvəsi vardır. Aşağı tərəflə (bədənlə) əlaqəni idarə edən qüvvə əməli qüvvədir və bu, bədənin idarəçiliyi və ona rəhbərlikdir. Lakin nəzəri dərkedici qüvvə isə ruhdan yüksəkdə duran tərəfə aiddir və bu qüvvə həmin tərəflə əlaqəni yaratmaq və ondan mənfəət əldə etmək üçün nəzərdə tutulmuşdur. Mən bu tərəf dedikdə, insanın ruhuna Bilik axıtmaq üçün ona istiqamətlənən mələkləri nəzərdə tuturam, çünki bu Bilik insana Allah-Təaladan (121) birbaşa gəlmir. Allah (121) buyurur: «Heç bir bəşər övladına Allahla danışmaq müyəssər olmaz. Allah onlarla ancaq vəhylə və ya pərdə arxasından danışar. Və ya bir elçi göndərər, o da Allahın izni ilə Allahın istədiyini vəhy edər» (42:51). Və ruhun sanki iki tərəfi var, bunlardan biri bədənə yönəlmişdir və ruh bu tərəfin vasitəsilə heç bir şeyə baxmadan və bədəndən, onun arzularından asılı olmadan hökm verməlidir, digər yüksək və nəcib tərəfdən isə ruh hər bir zaman onun təsiri altına düşərək qəbul etməlidir, çünki xoşbəxtliyin özü də məhz bundadır. Və bu ruhi dərkedici qüvvə ümumi təsəvvürləri onları dərk olunan və fərdi edən – eyni ilə «Biliyin meyarı» kitabında ümuminin nə olduğunu dediyimiz kimi – əlamətlərindən asılı olmayaraq mənimsəyir.

Daha sonra peyda olan biliklərə münasibətdə bu qüvvə üç səviyyəyə ayrılır. Bunlardan birincisi uşağın yazıya olan münasibətinə bənzəyir, çünki uşağın yazmağa gücü və bacarığı çatsa da, bu fəaliyyətdən çox uzaqdır və bu həm də idrak qüvvəsinə aiddir.

İkinci səviyyə artıq bir qədər böyümüş, nə isə bir şey anlayan və həddi-buluğa çatmış uşağın vəziyyətinə oxşayır ki, onda müəyyən miqdarda ilkin zəruri təsəvvürlərin olması özünü göstərir; bu elə bil ki, mürəkkəbqabının, qələmin və ayrı-ayrı hərflərin nə olduğunu bilən, lakin bütün bunları necə birləşdirmək lazım olduğunu bilməyən uşağın bacarığına bənzəyir, doğrudan da, o daha körpə olduğu vaxt belə deyildi, çünki o zaman onun fəaliyyətdən uzaq olan yalnız yazıya olan bacarığı və gücü var idi. Üçüncü səviyyə lazım olan bütün əməli olaraq əldə edilmiş təsəvvürlərin təzahür etməsidir ki, bunlar da onda qorunub saxlanır və sonradan əgər istəsə, o, bunlara qayıda bilər, qayıtdığı hər bir anda da dərk etdiyi bu təsəvvürlərdən çox gözəl istifadə edə bilər. Elmlərə münasibətdə indi onun vəziyyəti – hal-hazırda yazmayan, lakin buna tam hazır olan bir mirzənin vəziyyətinə bənzəyir. Bu, insanın sonuncu səviyyəsidir, lakin bunun özünün də çoxlu səviyyələri vardır ki, onlar da biliklərin səviyyəsinə, yüksəkliyinə və alçaqlığına, əldə olunan yollarına görə fərqlənirlər, çünki onlar Allah (121) tərəfindən verilən ilham vasitəsilə, təhsil vasitəsilə və ya təcrübə vasitəsilə gələ bilər, onlar sürətli və ya yavaş tərzdə əldə oluna bilər. Və bu biliklərdə alimlərin rolu da fərqlənir, bunda yüksəlmə səviyyəsi saysız-hesabsızdır və hüdudsuzdur, ən yüksək dərəcə isə peyğəmbərlik dərəcəsidir ki, onun üçün bütün həqiqətlər və ya onların çoxu çox qısa müddət ərzində, heç bir şey və əmək sərf etmədən, yalnız ilahi vəhylərin köməyi ilə açılır. İnsanın səadəti də Allah-Təalaya (121) məkanda və məsafədə deyil, mahiyyətcə və həqiqətlə yaxın olmaqdadır. Burada yaxşı olar ki, izahımızı başa vuraq, çünki belə düşünən insanlar var ki, dediyimiz yaxınlaşmadan sonra birləşmə gəlir və onlardan kimsə demişdir: «Mənə eşq olsun! Mən necə də böyüyəm!». Digər kimsə demişdir: «Mən mütləq həqiqətəm». Başqaları təcəssüm haqqında söhbət edirlər, xristianlar Allah və insan əsaslarının birləşməsindən danışaraq hətta o yerə qədər gəlib çatıblar ki, İsanın (123) yarımallah olduğunu iddia edirlər. Allah (121) bu cür imansız mülahizələrdən olduqca yüksəkdə dayanır.

Bütün bunları ümumiləşdirərək söyləmək olar ki, Allaha (121) doğru hərəkət edən pillələr saysız-hesabsızdır və bu istiqamətdə gedən hər bir şəxsin çatdığı pilləni həmin insanın davranışları ilə bilmək olar – onun artıq keçdiyi pilləni biz belə təyin edə bilərik, hal-hazırda durduğu pilləni isə bu zaman bizim görmədiy-

imiz şeylərə inanaraq ümumən bilmək olar, çünki peyğəmbərdən qeyri heç bir kəs peyğəmbərlik həqiqətlərini bilə bilməz. Rüşeym yeni doğulmuş körpənin nə olduğunu bilmədiyi kimi, uşaq yeniyetmənin və ona verilən zəruri biliklərin nə olduğunu bilmədiyi kimi, yeniyetmənin isə dərrakəli insanın və onun əldə etdiyi nəzəri biliklərin nə olduğunu bilmədiyi kimi, dərrakəli insan da Allahın (121) öz yaxınlarına və peyğəmbərlərə əta etdiyi lütfünün və mərhəmətinin xüsusiyyətlərinin nə olduğunu bilə bilməz. Allah (121) bu barədə buyurur: «Allahın insanlara əta etdiyi mərhəmətə heç kəs mane ola bilməz» (35:2). Bu mərhəmət isə ilahi səxavətin nəticəsidir, O heç bir kəsdən bunu əsirgəmir, lakin onu qəbul etmək üçün qəlbin təmizlənməsi və ruhun bütün murdar və natəmiz şeylərdən qurtulması lazımdır. Bu əlvan rəngli şəklin pis bir dəmir parçası üzərində nəqşini salmaq olar, lakin buna dəmirin nöqsanı, yəni pis keyfiyyəti olan paslı və qeyri-cilalı olması mane olur, buna görə də həmin dəmir parçasının səthi təmizlənməli və kirdən azad edilməlidir. Sən də elə bu cür bilməlisən ki, nöqsan sənin özündədir, ilahi mərhəmət tərəfindən deyil. Buna görə də bizim Peyğəmbər (122) demişdir: «Həqiqətən də, Allahın sizə əta etdiyi hədiyyə sizin kirpiklərinizdədir, onda onu əldə etməyə çalışın!» Və buna görə də ilahi səxavətinin və Onun ənamlarının hüdudlarını elə təsvir edir ki, bu təsvirlə arzuların və səylərin ən dəqiq ifadəsini verərək peyğəmbərimiz deyir: «Allah hər gecə bu gecənin sonuncu üçdə birində ən aşağıdakı səmaya enir və soruşur: "İltimas edən varmıdır, Mən onun xahişini yerinə yetirim və ya da mərhəmətə ehtiyacı olan varmıdır, Mən ona mərhəmət əta edim?"» Allah (121) buyurub: «Mənim mömin qullarım Mənimlə görüşmək üçün darıxmışlar, lakin Mənim onları görmək arzum daha böyükdür». Allah (121) bunu da buyurub: «Mənə bir qarış yaxınlaşan şəxsə Mən bir qulac yaxınlaşıram, Mənə tərəf addım-addım gələn şəxsə Mən qaça-qaça yaxınlaşıram». Bu cür kəlamları sən özün Quranda axtarıb tapmalısan, çünki onları bir-bir saymaq və ifadə etmək mümkün deyil.

# RUHİ QÜVVƏLƏRİN QARŞILIQLI ƏLAQƏSİ HAQQINDA

Bil ki, bu qüvvələr öz dərəcələrinə görə müxtəlifdir, belə ki, onlardan bəziləri özü üçün, bəziləri isə digərləri üçün yaranmışdır, onların bir hissəsi xidmət edir, digərlərinə isə başqaları xidmət edir və bunlardan ən böyüyü özü üçün yaranandır, qalanları isə bunun üçün yaranmışlardır. Bu ən böyüyü isə Allaha (121) və peyğəmbərlərə yaxın olanların dərəcələrini fərqləndirir, çünki insan yalnız özünə məxsus olan xüsusiyyətinin naminə yaradılmışdır, digər xüsusiyyətlər isə insanlarda və heyvanlarda eynidir, ona görə də insan heyvanlarla mələklər arasındakı mövqeni tutur. Onu bir neçə qüvvə və xüsusiyyət fərqləndirir, qidalanmasına və çoxalmasına görə o, bitkidir; hissiyyatının olduğuna və hərəkət etdiyinə görə o, heyvandır; əgər onun xarici görünüşünə və surətinə baxsaq, o, divarda çapılmış bir şəkildir; insan məhz yalnız özünün idrak qüvvəsi və şeylərin mahiyyətini anlaması xüsusiyyəti naminə yaradılmışdır.[1] O şəxs ki özünün bütün gücünü biliklərin qazanılmasına və xeyirxah əməllərin həyata keçirilməsinə sərf edir, o şəxs mələklərlə eynidir və onlarla birlikdə olmağa, mələk adlanmağa layiqdir. Allah (121) buyurub: «Bu ancaq Allah yanında əziz olan bir mələkdir» (12:31). Lakin o şəxs ki bütün gücünü öz arzularının təmin edilməsinə sərf edir, heyvanlar kimi qidalanır, o, heyvan səviyyəsinə enir və öküz kimi qudurğan, donuz kimi acgöz, it kimi acıqlı, dəvə kimi kinli, pələng kimi təkəbbürlü, tülkü kimi hiyləgər olur və ya bütün bu xüsusiyyətləri özündə toplayaraq Allaha (121) qarşı üsyan etmiş şeytana çevrilir.

Haqqında danışdığımız qüvvələri gözdən keçirən şəxs onlardan ən yüksəyinin ağıl olduğunu bilər və bu qüvvələrin bir-birinə necə möcüzəli şəkildə xidmət etdiklərini görər, zira onlar belə yaranmışlar və Allah-Təalanın (121) əmrinə qarşı gedə bilməzlər. Doğrudan da, idrak – hər şeyin xidmət göstərdiyi bir hakimdir və ona ən yaxın olan vəziri də, yəni bədəni idarə edən praktiki ağıl da ona xidmət göstərir, bədən isə ruhun silahı və onun hərəkət etməsi üçün bir vasitədir. Praktiki ağıl isə hisslərin köməyi ilə elmin əsaslarını dərk edir və sonradan bunun vasitəsilə də şeylərin mahiyyəti haqqında nəticə çıxarır. Daha sonra praktiki ağıla təxəyyül də xidmət edir, iki qüvvə təxəyyülün xidmətindədir: birincisi – ona qədər, ikincisi isə ondan sonra. Bu sonuncu qüvvə dərk olunan

və haqqında nəticə çıxarılan şeyləri qoruyub saxlayır, ona qədər olan qüvvə isə sıralanması haqqında sonra danışacağımız bütün heyvani qüvvələrdir və onların arasında iki müxtəlif qüvvənin xidmət göstərdiyi təsəvvür qüvvəsi də vardır. Təhrikedici qüvvənin təyinatı hərəkəti başlamaqdan ibarətdir və o, öz hərəkətini isə təsəvvürdən və düşüncələrdən başlayır. Ümumi təsəvvürlərdə mövcud olan surətləri qoruyub saxlayan qüvvə ona onda mövcud olan surətlərin sintezi və təhlili vasitəsilə xidmət göstərir, sonra bu qüvvələr iki qrup qüvvəni idarə edir. Həmin surətlərin – qorunub saxlanılması anına qədər – inkişaf etdirilməsi üçün surətləri qoruyub saxlayan qüvvəyə müəyyən qüvvə xidmət göstərir. Həvəs qüvvəsinə isə iştaha və qəzəb xidmət edir və bunlara da öz növbəsində əzələləri idarə edən qüvvə xidmət göstərir. Burada heyvani qüvvələr başa çatır. Heyvani qüvvələrə, ümumiyyətlə, üç cür bitki qüvvəsi xidmət edir ki, bunlar da törədən, yetişdirən və qidalandıran qüvvələrdir. Bunlardan ən əsası törədən qüvvədir, ona yetişdirən qüvvə, yetişdirən qüvvəyə isə qidalandıran qüvvə qulluq edir. Bu qüvvələrə isə digər dörd qüvvə – cəzb edən, tutub saxlayan, qidanı həzm edən və kənar edən qüvvələr xidmət edir, çünki bitkiyə qidanı cəzb edən və cəlb edən qüvvə lazımdır, sonra isə qidanı tutub saxlayan qüvvə, tutulub saxlanılan qidanı həzm edən qüvvə, daha sonra isə həzm olunan qidadan qalanını kənarlaşdıran qüvvə tələb olunur. Kənarlaşdıran qüvvə qulluqçudur və onun digər heç bir xidməti yoxdur, o sanki dövlətin süpürgəçisidir. Həzm edən, cəzb edən, tutub saxlayan və kənarlaşdıran qüvvələrə daha sonra isti və soyuq, nəmlik və quruluq xidmət göstərir və bu da bədən qüvvələrinin ən son pilləsidir.

İnsanların daha yaxşı başa düşmələri üçün bu qüvvələri bədii surətdə bu cür ifadə etmək olar: təfəkkür qüvvəsi haqqında deyilmişdir ki, şah öz dövlətinin mərkəzində yaşadığı kimi, bu qüvvə də beyinin mərkəzində yerləşir. Təxəyyül beyinin qabaq hissəsində yerləşir və o, elə bil ki, şahın poçt müdiridir, çünki bütün yeni xəbərlər onda toplanır, beyinin arxa hissəsində yerləşən qoruyucu qüvvə isə xidmətçiyə bənzəyir. Danışan qüvvə şahın mütərciminə, fəaliyyətli qüvvə isə mirzəsinə oxşayır. Hissləri casuslara və gerçək xəbərləri bilən və bildirdiyi şeylərdə heç bir vaxt aldatmayan insanlara bənzətmək olar. Onların hər biri xəbərləri cavabdeh olduğu yerlərdən alır: görmə rənglər dünyasına, eşitmə isə səslərə cavabdehdir və s. Onlar xəbərləri poçta cavabdeh olana

ötürürlər, o isə lazım olmayan şeyləri kənarlaşdırıb qalanlarını şaha ötürür ki, o da bu xəbərləri bölüşdürərək özünə faydalı olanı götürür və zərər verəni isə öz qulluqçusuna qorumaq üçün ötürür ki, o da onları lazım olan ana qədər qoruyur və lazım olanda tapıb çıxarır. Şahın məşğul olduğu iş bundan ötrü istifadə etdiyi öz qulluqçularının işlərindən yüksək olduğu kimi, təfəkkürün köməyi ilə insan ruhunun məşğul olduğu işlər – düşünmə, müqayisə, götür-qoy etmə və məlum olmayanın tapılması – bunlardan ötrü istifadə etdiyi öz qulluqçularının işlərindən daha nəcibdir. Bu, eynilə bir şəxsin dediyinə bənzəyir: «Bir dəfə mən Aişənin[7] yanına gəldim və o, mənə dedi: "İnsanın gözləri düzəngah, qulaqları qıf, dili mütərcim, əlləri qanad, ayaqları qasid, ürəyi isə hökmdardır və əgər o, yaxşı olsa, onun tabeliyində olanlar da onun kimi olar". Sonra əlavə etdi: "Mən bunu Allahın (121) elçisindən eşitdim"».

Bütün bunlar ruhun vəziyyəti haqqındadır. Biz sənə onlar haqqında sıra ilə və qısa şəkildə danışdıq və həqiqətən də, bunlar ruhun möcüzələrinin yalnız bir hissəsidir. Əgər sən insan bədənini yarıb ona baxsan, qan damarlarını, sinir ucluqlarını, əzələləri, sümükləri, kapillyarları və venaları tədqiq etsən, daha sonra qidanın çatdırılması üçün, onun həzm olunması üçün, sonra isə onun kənar olunması üçün, nəslin artırılması üçün yaradılmış orqanlara – ruhun alətləri olan bədənin hissələrinə tamaşa etsən, görərsən ki, onlar bir-birlərinə necə kömək edirlər. Yarılmış bədəni öyrənib qurtardıqdan sonra təbiət elmlərinin nailiyyətlərindən istifadə edərək bədənin qüvvələrinin dərindən və əsaslı surətdə tədqiq olunması ilə məşğul ol və onda daha böyük möcüzələrin şahidi olarsan. Allaha (121) inanmaq istəməyənlər və Onun bu sözlərinə qulaq asmayanlar qoy bədbəxt olsunlar: «Yerdə (Allaha) tam yəqinliklə inananlar üçün (Onun əzəmətinə və qüdrətinə, vəhdaniyyətinə dəlalət edən) əlamətlər vardır. Sizin özünüzdə də (sizi yaradanın birliyini sübut edən) əlamətlər vardır. Məgər siz bunları görmürsünüz?» (51:20 – 21). Axı hər bir şeydə Onun tək olduğunun sübutları vardır. Allaha (121) ümumiyyətlə inanmayanlar ağıllı insanlar sırasında deyillər və onlar bu cür müraciətə layiq deyillər. Biz sözlərimizlə inanan şəxsə müraciət edirik və onu Allahın (121) yaratdıqlarını öyrənməyə dəvət edirik ki, bununla da etiqadı, inamı daha da möhkəmlənsin, Onu daha da göylərə qaldırsın və Onun qarşısında daha çox sitayiş etsin. Hisslərlə qavrana bilməyən şeylərin hamısı Onun əlamətlərinin öyrənilməsi sayəsində idrakla

qavranılır. Onu mükəmməl dərk etmək üçünsə bu əlamətləri dərindən öyrənmək lazımdır.

Biz bütün bu yaradılanları anlamağa kömək məqsədilə misal göstərək. Əbu Hənif, Əş-Şəfai kimi alimlərin yüksək mövqe tutduqlarına, şöhrət və tərif sahibi olduqlarına şübhə edən elə bir fakih yoxdur və bu həm də bütün insanlara aiddir. Lakin onların hər hansı birinin əsərlərini vərəqləyən və orada bu insanın yaratdığı möcüzələri, onun yüksək ustalığını görən hər bir kəs buna tam əmin olur. Onun sözlərinin, əsərlərinin və şeirlərinin qeyri-adiliyinə getdikcə daha da əmin olmaqla bu şəxs ona daha artıq bir inamla daha çox hörmət edəcəkdir. Məgər onun inamını onun əsərlərini oxuyan və onun əsərlərində gözəlliyi hiss edən, onun əsərlərini öyrənən və həmin əsərlərdə bir çox qəribəliklər görən şəxsin inamı ilə müqayisə etmək olarmı? Bu şəxs sübutlara və öz idrakına əsaslanaraq Onun böyüklüyünə yüksək mövqe tutmasına əmin olmuşdur. Lakin Zeydin kitabını oxumayan digər bir şəxsin əmnliyi bundan daha zəifdir, çünki o, bu əminliyə özünün şəxsi dərketməsi ilə və sübutlar vasitəsilə çatmamışdır, bu isə təkcə bu suala münasibətdə adi insanların və bu məsələyə tam bəlli olanların arasındakı fərqdir, dünya isə özündə çoxlu möcüzələri – Onun yaratdıqlarını, əsərlərini, törətdiklərini və ixtiralarını – yaşadır; ruh isə bu dünyanın bir hissəsidir və dünyanın hər bir hissəsi möcüzələrlə doludur. Onu öyrənən şəxs isə Allahın mövcudluğuna (121) inamın və əminliyin möhkəmlənməsi formasında olan mənfəəti fasiləsiz olaraq əldə edir və buna görə də Allah (121) öz sözlərilə insanları ruh haqqında, bu dünya, yer və göy səltənətləri haqqında düşünməyə həvəsləndirir.

# ƏMƏLLƏRLƏ BİLİKLƏRİN MÜNASİBƏTİ VƏ DİGƏR QRUPLARA AİD OLAN TƏDQİQATÇILARIN KÖMƏYİ İLƏ SUFİ ALİMLƏRİNİN GƏLDİKLƏRİ ÜMUMİ BİR FİKRƏ GÖRƏ, ƏMƏL VƏ BİLİYİN İNSANLARI XOŞBƏXTLİYƏ APARMALARI HAQQINDA

Doğrudan da, bütün lazımsız şeylərdən təmizlənmə prosesinə və biliklərin əldə olunması yolundakı hərəkətə, yəni lazım olan şeylərin əldə olunmasına və lazım olmayan şeylərdən qurtulmağa əməllərin təsiri zəruri olanlardan ötrü yerin boşaldılması üçün əsas şərtdir. Şərtləşdirilmiş şey elə məqsədin özüdür və o, şərtin özündən daha yüksəkdir. Məsələn, hər hansı bir şəxs xəstəliyə tutulmuş və bu xəstəliyə görə öz körpəsini döşü ilə əmizdirmək iqtidarında olmayan qadının doğmasını istəyirsə, onda o, iki şeyi həyata keçirməlidir: birincisi – qadına döşlə əmizdirməyə imkan verməyən və bununla da hamiləliyə mane olan səbəbi aradan qaldırmalıdır, ikincisi isə bu səbəbi aradan qaldırdıqdan sonra qadını mayalamalıdır. Bunların birincisi ikinci üçün şərtdir, ikincisi isə həmin şəxsin can atdığı məqsəddir.

Şahın gəlişindən əvvəl onun üçün tikilmiş, lakin meymunlar və donuzlar tərəfindən tutulmuş bir saray təsəvvür et. Onun gözəlliyi və mükəmməlliyi iki şeydən – bu sarayı həyasızcasına ələ keçirmiş meymunların səs-küyündən və kimin üçün tikilmişsə, həmin şəxsin gəlişindən asılıdır. Əgər səthi pasla bağlanmış və parlaqlığı kirlə örtüldüyündən cisimləri əks etdirməyən güzgü təsəvvür etsək, onda güzgünün mükəmməliyini qaytarmaq üçün onun cisimlərin surətlərini qəbul etməsi və onları olduğu kimi əks etdirməsi xüsusiyyətini bərpa etmək lazımdır. Bunun üçün iki şeyi həyata keçirmək lazım gəlir. Birincisi – təmizləmə və cilalama, daha doğrusu, güzgünü lazım olmayan çirklərdən təmizləmək lazımdır. İkincisi isə – güzgünü onda əks olunmalı olan cismə istiqamətləndirmək lazımdır. İnsanın ruhu da həqiqətə istiqamətlənmiş bir güzgüyə bənzəyir və bir tərəfdən, elə bil ki, onlar eyni bir şeydir, digər tərəfdən, güzgü və təsvir kimi, onlar tamam başqa-başqa şeylərdir. Bu xüsusiyyət insanın ruhunu ondan daha aşağı pilləni tutan heyvan ruhundan ayırır, çünki insandan başqa, bütün canlılar sanki torpaq və ağac kimidirlər və onlar cisimləri əks etdirmək, maddi şeylər üçün güzgü rolunu oynamaq qabiliyyətinə malik deyillər. Mələklər xüsusi əksetdirmə bacarığına malik olan

təmiz su kimi qüvvə formasındakı bu cür qabiliyyətə malikdirlər. Fəaliyyət kimi deyil, bir qüvvə kimi, daha doğrusu, təzahür kimi deyil, bir ehtimal kimi bu cür bacarıq insanda da mövcuddur. Və insan əgər mübarizə aparарsa, onda o, mələklər səviyyəsinə qalxa bilər. Lakin onun qəlbinin güzgüsünü hər an daha çox natəmiz edən hərəkətlərində davam edərsə və öz istəklərinin ardınca gedərsə, onda onun ürəyi daha çox tutqunlaşacaq, qəlbini kölgə örtəcək və onun bu qabiliyyəti bütövlükdə yoxa çıxacaq – o, heyvan səviyyəsinə enərək xoşbəxtlik və kamillikdən məhrum olacaqdır və sonradan bunu düzəltmək daha mümkün olmayacaqdır.

Beləliklə, əməllərin mənası arzularla mübarizə apararaq, ruhunu nöqsanlardan və onu aşağı tərəflə bağlayan rəzil əlaqələrdən təmizləmək üçün bu əlaqələr tam yox olana qədər və ya heç olmasa zəifləyənə qədər öz qəlbini bu istəklərə deyil, Allah (121) tərəfə yönəltməkdədir. Daha sonra o öz qəlbini ilahi həqiqətlərin öyrənilməsinə yönəltməlidir və o zaman Allah-Təala (121) tərəfindən övliyalara və peyğəmbərlərə göndərilən ucalıq ona da əta olunacaqdır – bu, göstərilən səylərə görə verilən elə bir mükafatdır ki, insanın göstərdiyi cəhdlərin əsası nə qədər kamildirsə, bir o qədər də bunun əvəzi çox olur. Ovçuya ov necə verilirsə, ticarətdə qazanc necə əldə olunursa, ruhda da eynilə bu cür baş verir: çox az sayda insan - əgər onların qəlbləri təbiətən təmizdirsə - öz səyləri ilə lazımi hüdudlara çata bilər, lakin qəlblər lap əvvəldən təmizliyi ilə bir-birindən çox fərqlənir. Elə səylərin özü də çox fərqli olur və axirət dünyasındakı səadətin və Allahın (121) insanın ölümündən sonra onun ruhuna əta etdiyi mərhəmətin sonsuz sayda fərqli səviyyələrdə olması bundan irəli gəlir, lakin insan bunun üçün mütləq istək yolundan kənar olmalı və arzuların ardınca sürünməkdən onda əmələ gələn rəzil keyfiyyətlərdən qurtulmalıdır.

Deməli, bu məsələ bütünlükdə daxildə aparılan mübarizədən və özündə olan bütün lazımsız şeylərin təmizlənməsindən asılıdır. Əgər bunu arzuların ardınca getməklə əlaqələndirsək, onda bir şəxsin ləyaqəti və digərinin isə alçaqlığı tam aydın olar. Əgər bunu zəruri olanın əldə olunması ilə əlaqələndirsək, onda buna münasibətdəki mübarizə və paklanma şərtin şərtləndirilmişə münasibəti kimi, ya da nökərlərin öz ağasına olan münasibəti kimi və ya başqası üçün yaranan şeyin özü üçün yaranan şeyə münasibəti kimi olacaqdır. Peyğəmbərimiz (122) buna işarə edərək buy-

urmuşdur: «İman yetmiş iki cür olur və onların ən kiçiyi gedilən yolu maneələrdən təmizləməkdir». Lakin Allaha (121) sitayiş etməkdən keçən daxili mübarizə yoldan maneələri kənar etməkdən daha vacibdir. Əgər kimsə bu hədisin mənasının məhz yolun qırıntılardan, sümüklərdən və daşlardan təmizlənməsindən ibarət olduğunu deyərsə, onda elə çoxları hədisi məhz bu cür başa düşürlər. Digəri isə deyə bilər ki, insanlar bu sözlərin mənasını müxtəlif cür anlayırlar, axı onların özləri də müxtəlifdirlər və buna görə də Peyğəmbər (122) buyurub: «Allah mənim sözlərimi eşidən və başa düşən, sonra isə eşitdiyi kimi başqasına ötürən şəxslərə qələbə əta edər». Axı doğrudan da, bilənlərin bəziləri bilmirlər, bəziləri isə özlərindən daha artıq bilənlərə və başa düşənlərə bilik verməyə çalışırlar. Əgər bilməyən şəxslərin bu sözləri bilən şəxslərin başa düşdüyü kimi deyil, tamam başqa cür başa düşdüyünü bilməsəydi, o, bu barədə heç bir şey söyləməzdi. Bir də axı həqiqətin bilənlər tərəfində, yoxsa çoxluq tərəfində olduğunu necə bilmək olar? Bunun çox nadir hallarda baş verdiyi şübhəsizdir, lakin bir çox hallarda tamam əksinə olur. Adətən, həqiqət sadə adamların anlayışından kənar keçərək başa düşən və bilən, ya da daha çox bilən və anlayan insanlara tərəf istiqamət alır və bu ən çox hər hansı bir sözün dəqiq təyin olunmadığı hallarda baş verir: «maneə» sözü və o cümlədən «yol» sözü də ümumidir. Əgər nə isə müəyyən bir şey nəzərdə tutulsaydı, onda o, bunu qırıntı, daş adlandırardı və misalda da bunu göstərərdi, lakin bu aşkar şey də ümumiyə daxildir, çünki insan bunu icra etdikcə islah olunur, öz xarakterini tərbiyə edir və öz qəlbini laqeydlik, qəddarlıq və təkəbbür nöqsanlarından təmizləyir, lakin biz bütün bunlar haqqında pis və yaxşı xarakterlər barədəki söhbətimizdə daha geniş izahat verəcəyik. Beləliklə, sən öyrəndin ki, ruhun xoşbəxtliyi və onun kamilliyi məhz İlahi əməllərin həqiqətlərini özündə təcəssüm etdirməyində və onların vasitəsilə daha da itilənməyindədir, sanki onun qəlbi elə bu həqiqətlərin özüdür, bu isə qəlbin səbəbi arzular və kin olan rəzil əlamətlərdən və qüsurlardan təmizlənmə prosesindən keçərək mümkün olur. Bu da daxili mübarizə və xeyirxah əməllərin icrası sayəsində baş verir, çünki əməllər paklanma üçün nəzərdə tutulmuşdur, paklıq isə ruhun kamilləşməsi üçün əsas şərtdir. Buna görə də Peyğəmbər (122) buyurur: «İslam paklığa əsaslanır».

## BİLİYƏ DAİR MƏSƏLƏLƏRDƏ SUFİZMİN DİGƏR CƏRƏYANLARDAN FƏRQİ HAQQINDA

Bil ki, əməllər məsələsində bütün alimlər vahid bir fikrə gəlmişlər və bu da ondan ibarətdir ki, əməllər nöqsanlardan qurtulmağa və qəlbin pis keyfiyyətlərdən təmizlənməsinə yönəlmişdir, lakin bilik məsələsində həmin alimlərin fikirləri parçalanmışdır. Və sufilərin fikirləri də digər təriqətlərin fikirlərindən fərqlənir, ona görə ki, sufilər biliyin əldə olunmasına və elmlərin, şeylərin mahiyyətini öyrənən alimlərin yazdıqlarının öyrənilməsinə təhrik etmirlər, lakin hesab edirlər ki, bu məqsədə çatmaq üçün mənfi keyfiyyətlərdən qurtulmağa və bütün yollardan kənarlaşmağa yönəli mübarizə aparmaq və özünü bütövlükdə Allah-Təalaya (121) həsr etmək lazımdır. Bu baş verən zaman axtarışda olan şəxsə mərhəmət əta olunacaq, kainatın sirləri ona əyan olacaq və o, həqiqəti görəcəkdir. Bunun üçün özünü tam pak vəziyyətdə, təmiz niyyətlə, həqiqi arzularla, Allah-Təalanın (121) mərhəmətinə həsrətli olaraq hazırlamaq tələb olunur, çünki övliyalar və peyğəmbərlər mükəmməlliyə təlim vasitəsilə deyil, dünyəvi həyatdan kənarlaşdıqlarına, bu həyatla olan bütün əlaqələrdən inkar etdiklərinə və əl çəkdiklərinə görə, özlərinin varlıqlarını bütövlükdə Allah-Təalaya (121) həsr etdiklərinə görə nail olmuşlar və bütün bunlara görə onlara hər şey əyan olmuşdur, onların ruhuna əbədi səadət nəsib olmuşdur. Kim Allaha (121) üz tutmuşsa, Allah (121) da onun tərəfindədir və mən ürəkdən bu yolla getmək istədikdə, çoxlu sayda ardıcılları olan bir sufidən mənə Quranın daim mütaliə edilməsi barəsində məsləhət verməsini xahiş etdim və o mənə bunu qadağan edərək bildirdi ki, buna nail olmaq üçün dünyəvi həyatla bütün əlaqələri kəsmək lazımdır, insanın ürəyi nə ailəyə, nə uşaqlara, nə var-dövlətə, nə vətənə, nə bilik almağa, nə hakimiyyətə yiyələnməyə bağlanmalıdır, həmin səviyyəyə çatmaq üçün bütün bunların olub-olmaması heç də vacib deyil. Sonra yalnız zəruri və təyin olunmuşları götürərək xəlvət bir guşədə özünlə baş-başa qal, heç bir şey barədə düşünmədən bütün səyini Allah-Təalanın (121) anılmasına yönəldərək otur. Əvvəlcə ürəyinin iştirakı ilə və anlaqlı vəziyyətdə fasiləsiz olaraq «Allah, Allah» kəlməsini təkrar edərək Allah-Təalanı (121) öz dilinlə an və elə bir hala düşənə qədər bunu təkrar et ki, əgər dilini saxlasan və onu bu sözləri söyləməyə məcbur etməsən

də, sənin dodaqlarından həmin kəlmənin öz-özünə çıxdığını hiss edəcəksən. Sonra dilin öz hərəkətini saxlayana qədər qəlbində Allahı (121) anmaqda davam et və bu zaman görəcəksən ki, dilin iştirakı olmadan belə sənin qəlbin və ürəyin Allahı (121) anmaqda davam edir. Daha sonra ürəyində bu kəlmənin mənası qalana qədər belə davam et və o zaman bu kəlmə nə hərflər şəklində, nə də surət şəklində xəyalına gələcəkdir, sənin ürəyində isə bu sözün orada həmişəlik möhkəmlənmiş mənası qalacaqdır. Bu ana qədər sənin seçim imkanın olacaqdır, lakin sonra sənin heç bir seçimin qalmayacaqdır – qəlbində yalnız yayındırıcı təhriklərlə mübarizə etmək və elə bir şeyi gözləmək qalacaqdır ki, bu, vəhy yolu ilə övliyalara əta olunandır və peyğəmbərlərə əta olunanların yalnız az bir hissəsini təşkil edir. O, ani bir şimşək kimi zahir olacaq və uzun davam etməyəcək, lakin sonra yenidən qayıdacaqdır, ancaq ola bilər ki, o gecikər və əgər qayıdarsa, həmişəlik qala bilər və ya bir anlıq zühur edər və əgər o, səbatlı olarsa, onda bu daim davam edəcəkdir. Bunun nümunələri fasiləsiz olaraq bir-birinin ardınca gələ bilər, ola bilər ki, bir növlə məhdudlaşmasın və məhz buna görə onların keyfiyyətlərinin və xarakterlərinin arasında olan saysız-hesabsız fərqlərin nəticəsində Allaha yaxınlıq dərəcələri mövcuddur. Bu, sufilərin baxışıdır. Onlar hər şeyin əsasını sənin təmizlənməyində görürlər, bundan sonra hazırlıq və sadəcə olaraq gözlənti gəlir.

Bu məsələni dərindən öyrənənlər belə bir üsulun mövcud olduğunu və onun məqsədə gətirib çıxaracağını inkar etmirlər, çünki övliya və peyğəmbərlərlə ən çox məhz bu cür olur. Lakin onlar belə hesab edirlər ki, bu yol hamar deyil və o heç də həmişə arzu olunana gətirib çıxarmır. Onların fikrinə görə, ciddi-cəhd nəticəsində bütün hər şeylə əlaqələri bu dərəcədə kəsmək, demək olar ki, mümkün deyil və əgər hansısa bir formada mümkün olsa da belə, onun davamı əsla mümkün deyil, çünki iblisin təhrikləri və istəklərin yaratdığı əngəllər çox yaxındır. Bu mübarizə zamanı əhval-ruhiyyə korlana, ağıl dumanlana, bədən isə xəstələnə bilər ki, bunlar da öz növbəsində ruh düşkünlüyünə gətirər. Və əgər insanın ruhu həqiqi, dəlillərə əsaslanan elmlərlə məhdudlaşmazsa, onda həmin elmlərin yerini fantaziyalar tutacaqdır ki, həmin şəxs bunları həqiqətlərdən ibarət olan kimi qəbul edəcəkdir. Nə qədər sufilər onillərlə ondan can qurtarana kimi bir fantaziyanın təsiri altında olmuşlar və əgər insan lap əvvəldən elmlərə kamil şəkildə

yiyələnsəydi, onda bu fantaziyadan həmin anda qurtulardı. Və elmlərə biliyin meyarı və dəqiq sübutlar vasitəsilə yiyələnmək daha vacibdir, çünki insanın öz ruhunu anlamaq səyləri məqsədinə necə çatdırırsa, bu da onu məqsədə daha dəqiq şəkildə gətirib çıxarar. Və Peyğəmbər (121) öz ruhunu heç bir güc sərf etmədən anlamışdı və əgər məsləkdaş da özünütərbiyə vasitəsilə bu səviyyəyə çatmaq istəyirsə, o, bu zaman həqiqətdən uzaqdır: insan mümkün qədər axtarışda olaraq və öz sələflərinin gəldikləri nəticələri öyrənərək ruhunu həqiqi elmlərlə zənginləşdirməlidir. Ancaq bundan sonra İlahi məsələlərlə məşğul olan insanlara açılmayan suallara müraciət etmək olar, çünki açılmayan sirlər açılanlardan daha çoxdur. Elə bunda iki qrupun fikirləri bir-birindən fərqlənir.

Mənim ağlıma bir misal gəlib və ola bilər ki, bu misal zəif olanlara və birbaşa anlanılan misallara ehtiyac duyanlara əqli həqiqətləri başa düşməkdə və iki qrup arasındakı fərqləri aydınlaşdırmaqda kömək edər. Belə deyirlər ki, bir dəfə çinlilər və romalılar özlərinin oyma sənətində daha mahir usta olduqları barədə bir hökmdar qarşısında lovğalanırlar. Hökmdar da onlar üçün qaya parçası ayrılması haqqında əmr verir ki, onun da bir tərəfini çinlilər, digər tərəfini isə romalılar rəngləməli idilər və bir-birlərini görməmələri üçün aralarında arakəsmə düzəldilməli idi. Onlar öz işlərini görüb qurtardıqları zaman arakəsmə götürülməli, hər iki işə baxılmalı və ancaq bundan sonra hansının qələbə qazandığı məlum olmalı idi. Belə də edirlər. Romalılar özləri ilə çoxlu miqdarda görünməmiş boyalar gətirirlər. Çinlilər isə heç bir boya götürmədən arakəsmənin arxasına keçirlər və öz tərəflərini təmizləmək və pardaxlamaqla məşğul olmağa başlayırlar. Adamlar onların özləri ilə boya götürmədiklərinə çox təəccüblənirlər və soruşurlar: «Siz işi necə görüb qurtaracaqsınız, axı sizin boyanız yoxdur və heç nə çəkməmisiniz?» Çinlilər isə belə cavab verirlər: «Bu, sizin işiniz deyil. Arakəsməni qaldırın və biz öz sözlərimizdə haqlı olduğumuzu göstərək». Arakəsməni götürürlər və onlar həmin tərəfdə görünməmiş roma rənglərinin əks olunduğunu görürlər – onların tərəfi daha gözəl və təmiz olmuşdu, səylə pardaxlandığına görə qaya parçası güzgüyə bənzəyirdi və onda başqalarının üzərində çalışdıqları şeylər əks olunurdu. İndi isə təsəvvür et ki, insanın qəlbi İlahi elmlərin rəsmləri üçün bir yerdir və sən buna nail olmaq üçün iki yoldan biri ilə getməlisən. Romalılar kimi rəsmi

özün çəkə bilərsən və bu rəsmi zahirdən qəbul etmək üçün özünü hazırlaya bilərsən, lakin bu rəsm indiki halda mühafizə olunan lövhə və mələklərin bilikləridir, zira əgər sən Quranı əzbərdən bilirsənsə, onda sənin idrakın Quranla naxışlandığı kimi, onlar da, həqiqətən, doğru biliklərlə naxışlanmışlar və sənin biliklərin toxunula və görülə bilən bir şəkil deyildir, rəsmin surəti ağıldadır, bu isə hissiyyatlarla kifayətlənən və bunda yüksəyə qalxa bilməyənlərin rəzil qəlbləri tərəfindən inkar olunur.

## HANSI FİKRİN DÜZ OLMASI HAQQINDA

Əgər sən soruşsan: «Sən xoşbəxtliyə doğru iki yol saldın, bəs sən özün bu yolların hansına daha çox üstünlük verirsən?» onda bil ki, belə məsələlərdə qərar qəbul etmək hər bir kəsin şəxsi işidir və bu qərar da onu qəbul edən insanın vəziyyətindən və tutduğu mövqedən asılıdır. Mən belə hesab edirəm ki, – əslində, həqiqi biliklər yalnız Allahındır (121) – bu məsələdə qəti mənfi və ya müsbət qərar vermək səhv olardı, lakin o, müxtəlif insanlara və şəraitə münasibətdə müxtəlif olmalıdır. Və özü üçün yol seçən hər bir şəxs öz mövqeyini həddindən artıq şişirdir. Lakin sufilərin yolu ilə, fasiləsiz sitayiş və bütün dünyəvi əlaqələrin kəsilməsi yolu ilə getmək daha yaxşıdır, ona görə ki, əldə etmək mümkün olan bütün biliklərin ruhun xüsusiyyətlərinə bir dayaq olması üçün qazanılması asan deyil və yalnız gənclikdə mümkündür. Uşaqlıq dövründəki təhsil qaya üzərində qazılmış rəsm kimidir, lakin onlara təlim keçmək qocalara tədris etməkdən çox çətindir. Tanınmış bir insana müraciət etdilər: «Ahıl yaşına çatmış şəxs təhsil almaq istəyirsə, yaxşı olar ki, bunu etməsin». O isə belə cavab verdi: «Köhnə paltarı yu, ola bilər ki, ağarsın». Buradan belə nəticə çıxır ki, insanların çoxu yaxşı olar ki, xeyirxah əməllərlə məşğul olsunlar və əməl üçün lazım olan biliklə kifayətlənsinlər, çünki insanlar gənc yaşlarında biliyə o qədər də əhəmiyyət vermirlər. Əgər hər hansı bir cavan buna fikir verərsə, onda onun xarakterinə və ağlına diqqət etmək lazımdır və əgər o, dəqiq mücərrəd həqiqətləri qəbul etməyə hazır deyilsə, onda yaxşı olar ki, işlə məşğul olsun, çünki onun nəzəri bilikləri öyrənməyindən heç bir mənfəət olmayacaqdır. Beləlri bizim tədqiq etdiyimiz az bir qisim insanlardan daha çoxdur. Əgər o, ağıllıdırsa, bilikləri qavrama qabiliyyəti

varsa və əgər o, nəzəri biliklərə münasibətdə öz ölkəsinin və öz əsrinin oğlu deyilsə, onda o özünə qədər olanları təqlid etməkdən yüksəkdə durur. Yaxşı olar ki, o da işlə məşğul olsun, ona görə ki, müəllimi olmadan bilikləri əldə etmək olmaz, çünki bir insan uzun müddət ərzində ancaq çox az şeyə nail ola bilər. Buna görə də əgər təbabət elmi nizamlı və bölgülü şəkildə olmasaydı, uzun zaman ərzində bir-birinə əsaslanan fikirlərlə təkmilləşməsəydi, onda ən tanınmış idrak sahibləri uzun ömürləri boyu bütün xəstəliklər deyil, yalnız bir xəstəliyə aid dərmanın kəşfinə ehtiyac hiss edərdilər. Dövlətlərin çoxunda isə bu cür müstəqil alim yoxdur. Belə olduqda azdan az ağıllı adam qalır ki, həm gənc yaşlarından bilik qazanmağın qayğısını çəksin, həm onda bilikləri qavramaq qabiliyyəti olsun, həm də bir çox alimlərdəki kimi zahiri görünüşcə deyil, mahiyyətinə görə elmdə müstəqil olan müəllim tapa bilsin. Korun ardınca gedən adam bilməlidir ki, koru və onun ardıcıllarını təqlid etməkdə heç bir yaxşı şey yoxdur. Ola bilər ki, biliklər əldə edərək böyümüş bir gənc qəlbən təmizdir və müxtəlif cür elmlərlə məşğul olduqdan sonra sufilərin fikirlərinə müraciət etmişdir. Belə bir şəxs hər iki yolla irəliləməyə hazırdır. O, əvvəlcə yaxşı olar ki, təhsil alma yolu ilə gedərək çalışsın və dəlillərə əsaslanan elmlərdən insanın öz ilkin qüvvəsi sayəsində qazana biləcəyi şeyləri öyrənsin və onun sələfləri tərəfindən hasil edilmiş biliklərdən elə bu da kifayət edər. Əgər o öz imkanı daxilində elə etsə ki, onun təhsil almadığı elm sahəsi qalmasın, onda daha sonra o, cəmiyyətdən uzaq bir tənhalıq seçməli, dünyəvi həyatdan əl çəkməli və yalnız Allaha (121) tapınmalıdır. Bütün bunları fasiləsiz olaraq həyata keçirməklə yalnız bundan sonra belə bir yolu seçən digər insanlardan gizli olan sirlərin onun üçün açılmasını gözləməlidir. Mən belə düşünürəm, lakin düzünü Allah (121) bilir. Buradan o nəticə hasil olur ki, insanların çoxunun əməli işlə məşğul olması daha düzgündür. İşdən isə əməli bilgilər alınır, yəni mən onu nəzərdə tuturam ki, əməli bilgi işlərin necəliyini öyrənməyə kömək edir, lakin əməli bilgilər işdən yüksəkdə deyil, hətta aşağıda durur, ona görə ki, əməli bilgi işlərdən ötrü nəzərdə tutulur və bu mənada əməli bilgilər başlıca məqsədi Allah (121), onun keyfiyyətləri, mələklər, kitablar, elçilər, ruh və onun keyfiyyətləri, göy və yer səltənəti haqqında bilgilərin dərk edilməsi olan biliklərdən tam fərqlənir. Bu isə əməli bilgilər deyil, nəzəri – bu biliklər xeyirxah əməllərin həyata keçirilməsində faydalı olma-

larına baxmayaraq, əsas deyildirlər – biliklərdir. İnsanların çoxuna görə həqiqət əməli işlərdə gizlənmişdir və buna görə də Peyğəmbərimiz (122) bu işləri nə təfsilat, nə əsası buraxmadan diqqətlə təsvir edir, hətta bayıra çıxandan sonra yuyunmağın vacibliyini və bunu necə etmək lazım gəldiyini insanlara öyrədir. Lakin o, nəzəri biliklər sahəsinə münasibətdə ümumiləşdirilmiş şəkildə, təfsilata varmadan danışır və Allahın (121) keyfiyyətləri haqqında yalnız «Allahın (121) oxşarı yoxdur» və «O – Eşidən və Görəndir» ifadələrindən başqa heç bir söhbət açmır.

Ümumi xatırlatmadan sonra Peyğəmbər (122) elmin böyüklüyü və onun əməldən çox yüksəkdə durduğu haqqında saysız-hesabsız kəlamlar işlətmişdir, məsələn, o, söylədiyi «Bir saat elmlə məşğul olmaq bir illik sitayişdən daha qiymətlidir» və ya «Alimlə sitayiş edən arasındakı fərq Qüdrət gecəsi ayının digər gecələrdəki aylarla fərqi kimidir» və bizə gəlib çatmış digər kəlamları buyurmuşdur.

Əməllərdən yüksəkdə duran həmin biliklər daha sonra ya məsələn, fiqh[10] və digər sitayişlər kimi əməllər haqqında, ya da başqa növ bilik olacaqdır. Belə düşünmək iki səbəbdən düzgün olmazdı ki, burada (yəni misal göstərdiyimiz mülahizələrdə) birinci növ nəzərdə tutulur və bunlardan birincisi alimin sitayiş edəndən daha üstün olmasıdır, sitayiş edən şəxs isə sitayiş haqqında hər şeyi mütləq bilməlidir, yoxsa o, əxlaqsız və günahkarlardan olacaqdır. İkincisi isə, sitayiş haqqında bilgilər əməllərdən daha xeyirxah ola bilməz, ona görə ki, əməli bilgilər öz-özlüyündə məqsəd deyildir və o, əməllərdən ötrü nəzərdə tutulmuşdur, digər bir şeydən ötrü nəzərdə tutulansa, həmin şeydən yüksəkdə dura bilməz.

## HANSI ELMİN VƏ ƏMƏLİN CƏNNƏTƏ DOĞRU APARDIĞI HAQQINDA

Əgər sən soruşsan: «Elm və əməl müxtəlif olur, onların heç də hamısı xeyirli deyil, bəs onda bunların hansı ilə məşğul olmaq lazımdır?» - onda sənə bu cavabı verərəm ki, elmlər əməli və nəzəri kimi iki yerə bölünürlər. Nəzəri biliklər həddindən çoxdur və onlar müxtəlif ölkələrdə, müxtəlif zamanlarda cürbəcür olurlar, onlar irsən keçmirlər və uzun əsrlər boyu qəlblərdə qalmırlar. Bu

elmlərdən bizə yalnız o biliklər lazımdır ki, kamilliyin əzəmətindən və gözəlliyindən fərəhlənərək ondan həzz almaq üçün ruha bu mükəmməlliyə çatmaqda kömək etsin. Bu təyinat dillər və səslər haqqındakı elmlərə, sintaksisə, şeir sənətinə və leksikologiyaya aid deyildir və əgər kiməsə bunlardan nəsə lazımdırsa, onda onu öyrənsin, lakin əsas məqsədə çatmaq üçün yalnız həqiqi elmlər vasitə ola bilər. Biz indi o elmlərdən danışırıq ki, məqsəd olmalıdırlar və əgər, məsələn, həcc[11] haqqında söhbət ediriksə, bu, o demək deyildir ki, həcc üçün zəruri olan ayaqqabıdan və yuyunmaq üçün olan qabdan danışmalıyıq. İndi isə o elmləri müəyyən etməliyik ki, bunlarda mövcud olan məlumatlar itmədən və dəyişmədən əbədi qalır, yəni onlar müxtəlif xalqlarda və müxtəlif zamanlarda sabit olaraq yaşayır. Bu, Allah (121) haqqında, Onun keyfiyyətləri, mələklər, kitablar, elçilər, göy və yer səltənətləri, insandakı və heyvanlardakı möcüzələr və bütün bunların öz-özünə deyil, Allahın (121) təzahürləri olduğu barəsindəki biliklərdir. Ən əsas məqsəd isə Allah (121) haqqındakı biliklərdir. Allahın (121) mələklərini biz tanımalıyıq, çünki onlar Allahla (121) peyğəmbər arasındakı əlaqə həlqəsidir. O cümlədən peyğəmbərlik və peyğəmbərlik barəsindəki bilgilər də vacibdir, ona görə ki, mələklər Allah (121) və peyğəmbər arasındakı həlqə olduğu kimi, peyğəmbər də mələklər və mövcudat arasındakı həlqədir. Nəzəri elmlərin sonuncusuna kimi belə davam edir. Bunların məqsədi və təyinatı Allah (121) haqqında olan bilgilərdir və onlar haqqında çox danışmaq olar, çünki onlardan biri digərinə tərəf aparır və bu zaman çoxlu miqdarda detallar və təfərrüatlar əmələ gəlir.

İkinci növ olan əməli elmlər üç cür olur. İnsanın ruhu, onun keyfiyyətləri və xarakteri, öz-özünə inkişaf, nəfslə mübarizə bu kitabın başlıca predmetləridir. Daha sonra bu elm qohumlarla, uşaqlarla, nökər və qullarla necə münasibət yaratmaq haqqındadır, ona görə ki, öz gözlərin, əl-ayağın və gücün kimi, onlar da sənin qulluqçularındır. Arzulara, qəzəbə və s. qarşı öz bədəninin gücünü necə idarə etməlisənsə, eynilə bu cür də onları idarə etməlisən. Bu həm də ölkənin və ya hər hansı bir vilayətin əhalisinin necə idarə edilməsi haqqındakı elmdir. Bunun üçün başlıca olaraq fiqh, özü də onun ruhla bağlı sitayişləri olmayan hissəsi vacibdir. Onlardan isə məhkəmə işlərinin aparılması qaydalarını – nikah, ticarət və vergilər haqqında olan qaydaları yaxşı bilmək lazımdır. Əməli elmlərin üçündən ən əsası – ruhun idarə edilməsi və bədənin idarə

edilməsi, həmçinin haqqın qorunmasının qeydinə qalmaqdır, çünki hər bir şey tarazlıqda olarsa və haqq yerini tutarsa, onda bu, əvvəlcə ailəndən və uşaqlarından daha uzaq olan rəiyyətlərinə, sonra isə bütün ölkənin əhalisinə sirayət edər, zira buyurulmuşdur: «Siz hamınız qəyyumsunuz və hər biriniz öz qəyyumluğunuz altında olanlar üçün cavabdehsiniz». Bundan qeyrisi isə zəkatın[12] əmlak senzinə, işığın günəşə, kölgənin ağaca olan münasibətinə oxşayır: əgər ağac əyridirsə, onda kölgəsi necə düz ola bilər? Əgər kimsə özünü idarə edə və özünə hədd qoya bilmirsə, onda o şəxs başqalarını necə idarə edə bilər? Bütün bunlar ümumi olaraq əməli elmlər haqqındadır.

İndi isə gəlin idarəetmə haqqındakı elmlərə nisbətən daha dəqiq olan bəzi elmlər barəsində danışaq. Bir neçə qüvvə vardır ki, onların üzərində mütləq işləmək lazımdır və bunların sayı üçdür: idrak qüvvəsi, istək qüvvəsi və qəzəb qüvvəsi. Əgər sən idrak qüvvəsini tərbiyə etsən və onu lazım olan səviyyəyə gətirib çıxartsan, onda sən özün müdriklik qazanarsan və bu barədə Allah (121) buyurur: «Kimə hikmət bəxş edilmişsə, ona çoxlu xeyir (əbədi səadət) verilmişdir» (2:269). Bu isə insana özünün etiqadında doğrunu yalandan, sözündə düzü qeyri-düzdən, əməllərində isə yaxşını pisdən ayırmağa kömək edər. Bunların heç biri onun üçün çətin olmayacaqdır, baxmayaraq ki, bu məsələ insanların çoxu üçün mürəkkəb olaraq qalır. Haqqında «Elmin meyarı» kitabında söhbət açdığımız şeylər bu qüvvənin islah edilməsi və tərbiyələndirilməsində böyük köməklik göstərə bilər. İkinci qüvvə istək qüvvəsidir, onun islah olunmasından əxlaq əmələ gəlir, qəlb özünü günahlardan qoruyaraq şəfqətliyə və tərifəlayiq iş olan başqalarını özündən üstün tutmağa doğru hərəkət edir. Üçüncü qüvvə isə qəzəbdir. Ona qalib gəlməklə və islah etməklə insan xeyirxahlığa, kamallılığa – insan öz qəzəbinin qarşısını aldıqda və ona vüsət almağa imkan vermədikdə – və cürətli olmağa – öz qəlbinə qorxu və tamahkarlıq hissini yaxın buraxmadıqda – qədəm qoyur ki, bu iki keyfiyyət Quranda təriflənir. Sən bu qüvvələri islah, onları necə lazımdırsa idarə və zəruri anda iki qüvvəni üçüncü qüvvəyə – idrak qüvvəsinə tabe etdikdə, o zaman hər şey tarazlığa gəlib çatır. Göylər də, yer də elə bu cür tarazlıqda və ədalətdə yaradılmışdır, bu uyğunlaşdırma şəriətin, qəlbin təmizliyinin və əxlaqın dəyərləridir, bütün bunları Peyğəmbərimiz (122) tərifləyərək buyurmuşdur: «Mən sizin aranızdan ən əxlaqlısını, başqalarına

qayğı göstərənini, sevəni və sevilənini ən çox sevirəm». Şəriət tərəfindən təriflənən keyfiyyətlər çoxdur və onların hamısı da bu üç qüvvənin islah olunmasından doğur. Allah-Təala (121) bütün bunları birləşdirərək buyurur: «Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən, (iman gətirdikdən) sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə vuruşanlardır! Məhz belələri (imanlarında) sadiq olanlardır!» (49:15). Allaha (121) və Onun Elçisinə (122) şəkk-şübhəsiz inam dedikdə, O, həqiqi biliyə və müdrikliyə işarə edir ki, bunlar da idrak qüvvəsinin tərbiyəsi olmadan mümkünsüzdür. Malı ilə vuruşmaq dedikdə O ruhun paklığına və alicənablığa işarə edir ki, bu da coşqunluğun idarə edilməsi və o, dinin rəhbərliyi altında hərəkət etdikdə ona tabe olması səbəbindən doğur. Allah-Təalanın (121) aşağıdakı sözləri də buna işarədir: «Sən bağışlama yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər!» (7:199). Peyğəmbərimiz (122) də bu ayəni[13] aydınlaşdıraraq deyir: «Bu, sənə qarşı ədalətli olmayanı bağışlamaqdır, səni aldadıb soyana özün verməkdir, səni unudanla əlaqəni kəsməməkdir, səni incidənə qarşı yaxşı davranmaqdır». Sənə qarşı ədalətli olmayanı bağışlamaq mülayimlikdən və igidlikdən daha yüksəkdir. Səni aldadıb soyana özün verməkalicənablıqdan ucadır. Səninlə əlaqəni kəsənlə münasibəti davam etdirmək isə xeyirxahlıqdan yüksəkdir.

## QARŞILIQLI MÜBARİZƏ EDƏN QÜVVƏLƏRLƏ RUHUN NƏYƏ BƏNZƏMƏSİ HAQQINDA

İnsanın bədənindəki ruh öz şəhərində hökmdarlıq edənə bənzəyir. Onun bədənə tabe olan qüvvələri və hissələri sanki işçilər və sənətkarlardır. İdrak qüvvəsi isə işarə verən müşavirə və ya dərrakəli vəzirə oxşayır. İstək – elə bil ərzaq gətirən səfeh bir quldur. Qəzəb – (hökmdarın) polis rəisidir, qida gətirən kölə isə – özünü müəllim kimi qələmə verən hiyləgər və alçaq yalançıdır. Lakin onun rəhbərliyi altında müalicəsi çətin olan xəstəlik və böyük bəla gizlənir bu isə vəzirə ziddir və vəzir də bir an dayanmadan fasiləsiz olaraq onunla mübahisə edir. Əgər öz şəhərinin hökmdarı özünün bütün işlərində vəzirlə məsləhətləşərək və bu alçaq qulun məsləhətlərinə məhəl qoymadan ona zidd olan qərarlarla hərəkət edərək polis rəisini özünə tabe edib, həm də vəzirə

qulaq asmağa, onun həmin rəzil və alçaq qulun, onun ardıcıllarının və tərəfdarlarının əleyhinə olan əmrlərinə tabe olmağa və qərarlarına əməl etməyə məcbur edərsə, yəni bu qulu idarəedən deyil, idarəedilən halda, tabe və rəhbərlik edən deyil, tabelikdə və rəhbərlik altında olan vəziyyətdə saxlayarsa, onda bu hökmdarın vilayətində hər şey qaydasında gedəcək və hamı ədalətin təşəkkül tapmasına çalışacaqdır. Buna görə də ruh öz coşqunluğunu tabelik altına salmaq və onu istəklərin üzərinə hakim qoymaq üçün, gələn dəfə isə istəkləri cəlb etmə və onu tədricən irəlilətmək vasitəsilə qəzəbdən yaranan təşəxxüs və lovğalığı məhdudlaşdırmaqdan ötrü, bəzən isə qəzəbi və qeyrəti gücləndirmək, məzəmmət etmək yolu ilə arzuları boğmaq və onları idarə etmək üçün idrakdan kömək istəyəcəkdir. (Bu zaman) onun (insanın) qüvvələri tarazlığa gələcək və əxlaqı daha yaxşı təkmilləşəcəkdir. Bu yoldan sapan insanlar Allahın (121) göstərdiyi hala düşəcəklər: «(Ya Peyğəmbər!) Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən (onu hələ yaratmamışdan gələcəkdə kafir olacağını bildiyi üçün) yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü?» (45:23). O sonra buyurur: «...o, yerə (dünyaya) meyl edib nəfsinin istəklərinə uydu. O elə bir köpəyə bənzəyir...» (7:176). Allah-Təala (121) öz istəklərinə qələbə qazananlar haqqında deyir: «Amma kim (Qiyamət günü) Rəbbinin hüzurunda durmaqdan qorxmuş və nəfsinə istəyini, şəhvəti qadağan etmişsə, həqiqətən, onun yurdu Cənnətdir!» (79:40-41). Məsələ heç də bir qrupun hesab etdiyi kimi, qəzəbi boğmaqdan və onu tamam məhv etməkdən, istəkləri boğmaqdan və onu tamam məhv etməkdən deyil, onları məhdudlaşdırıb idarə etməkdən ibarətdir, çünki idrak qəzəb olmadan tərbiyələndirə bilməz – o yalnız həqiqəti nişan verə bilər və o, bütün qüvvələrin ən nəcibidir. Yalnız onun sayəsində insan Allahın (121) torpağında Onun canişini olmuşdur, lakin idrak xeyirli olan şeyi göstərən həkim kimidir və əgər o, hədələməklə və sakitləşdirməklə insanın arzularını zəiflədən və onu baş əyməyə məcbur edən, ağıla xidmət edən qəzəb və qeyrətin köməyindən istifadə etməzsə, onda onun göstərişləri heç bir xeyir gətirməz, elə buna görə də qeyrəti olmayan insanın idrakının ləyaqəti nəzərə çarpmır, buna görə də qəzəb və qeyrət mütləq ağılın göstərişləri ilə fəaliyyət göstərərək tabeçilik altında olmalıdır. İstəklər də belədir – onu saxlamaq və imtina etmək (intim əlaqədən) çətindir, çünki belə olduqda insan nəslinin artımına

aparan çoxalma ləngiyər; qidadan imtina etmək də çətindir, çünki bu da insanın özünün mövcudluğuna son verə bilər, lakin o, qidalanmada israfçılıqdan çəkinməlidir, çünki yeməyin qəbul olunmasının məqsədi bu əməliyyatın özünün verdiyi həzz deyil, bilikləri qazanmaq və xeyirxah əməllər həyata keçirmək üçün lazım olan qüvvələrin yerini doldurmaqdır. Yemək zamanı o, cihaddan qabaq öz heyvanını yemləyən insana bənzəyir, axı o, bu heyvandan vasitə kimi istifadə edir və o, çox istəyərdi ki, hətta yemək qəbul etmədən bilik qazana və əməllərini həyata keçirə bilsin. Başqa bir misal: insan öz əhəmiyyətinə görə böyük, ölçülərinə görə isə kiçik yaradılmışdır. Onun bədəni şəhər, idrakı isə bu şəhəri idarə edən hökmdardır. Onun zahiri və daxili hissiyyatları içərisindən dərketmə qüvvələri – hökmdarın qoşunudur. Bədənin hissələri və üzvləri – onun təbəələridir. Nəfs isə pislik həyata keçirməyi əmr edəndir, yəni arzu və qəzəb onun şahlığını ələ keçirmək və təbəələrini qırmaq istəyən düşməndir. Onun bədəni sərhəd, ruh isə bu sərhədləri qoruyan mühafizəçidir. Əgər o, öz düşməni ilə vuruşub onu əsir götürərək özünə tabe etsə, hamı onu mədh edəcək və deməli, o, Allah-Təalanın (121) yanına qayıdacaq: «Allah malları və canları ilə vuruşanları evlərində əyləşənlərdən (cihada getməyənlərdən) dərəcə etibarı ilə üstün tutdu. Allah bunların hamısına (hər ikisinə) savab vəd etmişdir» (4:95). Əgər o, öz sərhədlərini və təbəələrini itirərsə, onu pis xatırlayacaqlar və buna görə də Allah-Təala (121) ilə görüşdüyü zaman cəzalanacaqdır. Allah-Təala (121) isə, bir hədisdə deyildiyi kimi, Məhşər günü deyəcək: «Sən pis himayəçisən, ət qəbul etmisən, süd içmisən, pisliyi inkar etməmisən və qəmə düçar olmamısan. Mən sənə əvəzini verəcəyəm». Bu mübarizə sanki sevinc gətirir və ruhun qidasıdır. Onun həyata keçirilməsi, əslində, ruhun çəkib çıxarılmasıdır. Bunu yalnız öz ruhundan bütün istəklərindən əl çəkməyi tələb edənlər bilirlər. Buna görə də Peyğəmbərin (122) silahdaşları deyirdilər: «Biz kiçik cihaddan böyüyünə qayıtdıq». Onlar kafirlərə qarşı qılıncla müharibə aparmağı kiçik cihad adlandırırdılar. Allahın Elçisindən (122) də soruşmuşlar: «Ey Allahın Elçisi, hansı cihad daha yaxşıdır?» Peyğəmbərimiz (122) isə cavab verib: «Öz cismani arzularına qarşı öz apardığın mübarizə». Buna görə də o (122) buyurub: «Döyüşdə rəqibini məğlub edən deyil, qəzəbli vaxtında özünü saxlaya bilən şəxs daha güclüdür». Başqa bir misal: idrak at üstündə oturmuş ovçuya, onun arzuları – ova, qəzəb – itə oxşayır,

əgər ovçu təcrübəli, at itaətkar, it ədəbli, öyrədilmiş və itaətkardırsa, onda ovçu müvəffəqiyyətə layiqdir. Lakin əgər o, axmaq, atı tərs, iti isə qəzəblidirsə, onda at onun əmrləri ilə hərəkət etməyəcək, it itaətlə onun işarəsi ilə qaçmayacaq – belə olduqda ovçu nəinki arzuladığına çatmağa, əksinə, həlak olmağa layiqdir.

## ŞƏHVANİ HİSSLƏRƏ MÜNASİBƏTDƏ RUHLARDAKI FƏRQLƏR VƏ ARZULARIN GÖSTƏRİŞLƏRİNİN İDRAKIN GÖSTƏRİŞLƏRİNDƏN NƏ İLƏ FƏRQLƏNMƏSİ HAQQINDA

Bil ki, arzularla mübarizəyə münasibətdə insanda üç hal meydana gələ bilər. Birincisi, arzular insanın üzərində hökmrandır, onu idarə edir və insan ona qarşı dura bilmir. İnsanların çoxunda bu hal baş verir və Allah-Təala da onun haqqında belə buyurur: «(Ya Məhəmməd) Nəfsini özünə Tanrı edənləri gördünmü?», çünki Allah sitayiş olunandır və yalnız sitayiş olunanın da göstərişlərinə əməl olunmalıdır. Öz bədəninin səy göstərdiyi şeylərə onun arzularının ardınca hərəkət edən insan öz şəhvətini ilahiləşdirmiş olur. İkincisi onların arasında daim mübarizə və rəqabət gedir, bu zaman bəzən insan, bəzən də onun arzuları qələbə çalır və o, həmişə cihad aparır. Əgər həmin zamanda ölüm onu apararsa, o, şəhid[14] olacaqdır, çünki Peyğəmbərimizin (122) sözlərini əməlində həyata keçirmək istəyir: «Öz arzularınızla düşmənlərinizlə döyüşdüyünüz kimi döyüşün». Bu isə peyğəmbərlərdən və Allaha (121) yaxın olanlardan qeyri, bütün başqa insanların çata biləcəyi ən yüksək səviyyədir. Üçüncüsü insan öz arzularına qələbə çalır və onları elə idarə edir ki, bir daha ona üstün gələ bilməsin, bu isə böyük istedad, əsil səadət və qul olmaqdan həqiqi şəkildə azad olmaqdır, buna görə də Peyğəmbər (122) buyurub: «Hər bir kəsin qəlbində şeytan yaşayır, o, məndə də var və doğrudan da, Allah mənə onun öhdəsindən gəlmək üçün kömək etdi və mən onu məğlub etdim». Ömər haqqında o (122) dedi: «Ömər bir yolla gedəndə şeytan başqa yolla gedirdi». Bizim dövrümüzdə bu, bir çoxlarının büdrədiyi yerdir, çünki çoxları belə hesab edirlər ki, guya lazımi səviyyəni artıq fəth etmişlər, lakin, əslində o özü şeytandır, ona görə ki, öz ehtiraslarının ardınca gedir, buna baxmayaraq, o, öz məqsədlərinə belə haqq qazandırır ki, guya bu, dindən gəlir və

o, dinin xatirinə bunları həyata keçirir. Mən hətta elə insanlar görmüşəm ki, digərlərinə müəllimlik ediblər və o şeyləri öyrədiblər ki, bununla onlar qərar qəbul ediblər, onlara moizə ilə və həmçinin digər üsullarla müraciət ediblər, lakin bu zaman öz arzularını həyata keçirmişlər. Lakin onlar belə hesab edirdilər ki, guya onları din idarə edir, onların bu işdə səyləri imanın bir hissəsidir və mükafat almaq istəyi onları bu işə həvəsləndirir, lakin, əslində, bu, çox böyük axmaqlıq və təkəbbürdür. Doğrudan da, bu haqda əsl həqiqəti yalnız bir üsulla - müəllimin köməyi ilə öyrənmək olar, kim ki insanlar tərəfindən qəbul olunması üçün deyil, Allah (121) adından məsləhət verir və onun məqsədi insanları Allaha (121) doğru səsləməkdir. Onu bu cür tanımaq olar ki, əgər onun yanında daha geniş şöhrətə malik, biliyi daha çox olan, nitqi daha məlahətli və ona nisbətən daha yaxşı qəbul olunan vaiz əyləşmişsə, bu zaman o sevinər və özündən daha bacarıqlı digər bir şəxsin köməyi ilə bu çətin vəzifədən qurtulduğuna görə Allahdan (121) razılıq edər. O sanki kafirlərlə vuruşmaq və onları öldürmək əmri almış bir şəxsdir, lakin səmadan kafirləri bir andaca yandırıb külə döndərən ildırım göndərilir və bu, onu kafirlərlə döyüşmək əziyyətindən qurtarır; əlbəttə ki, o, buna sevinər və Allah-Təalaya (121) razılıq edər. Bu yalnız Allaha (121) yaxın olan insanlarla baş verə bilər və bunun nəticələrindən biri də imkan daxilində olan aramsız ehtiyatlılıq və Doğruçunun[15] ifadə etdiyi «Məni öldürün, çünki mən sizlərdən yaxşı deyiləm» sözləri ilə deyilən açıq etirafdır. Sən deyəcəksən: «Əgər, deyildiyi kimi, təkəbbür sapının üzəri ilə şeytan bizə yaxınlaşdığı zaman onun hiylələrindən və yalanlarından qorunmalıyıqsa, onda biz idrakın göstərişlərini arzuların göstərişlərindən necə ayıra bilərik?» Bil ki, bu yalnız həqiqi biliklərin köməyi ilə həll olunan çətin bir məsələdir (bunun haqqında indi təfərrüatla danışmağa ehtiyac yoxdur, çünki biz bunu artıq «Elmin meyarı» kitabında həyata keçirmişik) – onlar həqiqəti yalandan seçməyə kömək edir, lakin bilmək lazımdır ki, idrak çox vaxt nəticə nöqteyi-nəzərindən daha yaxşını nişan verir, baxmayaraq ki, bu, özündə müəyyən çətinliklər də daşıyır və ona görə də buna çaşqınlıq anlarında müraciət etmək lazımdır. Əgər hər hansı bir məsələni həll etdiyin zaman iki həllin hansının düzgün olduğunu bilmirsənsə, onda istədiyini deyil, sənin xoşuna gəlməyəni seçməlisən, ona görə ki, bir çox insanlar həyatda məhz belədirlər. Peyğəmbərimiz (122) söyləmişdir: «Cənnət sevilməyənlərlə

örtülmüşdür, Cəhənnəm isə arzulananlarla doludur». Allah-Təala (121) da buyurub: «Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah (sizdən ötrü) çoxlu xeyir nəzərdə tutmuş olsun» (4:19). Allah-Təala (121) bir daha buyurub: «Bəzən xoşlamadığınız bir şey sizin üçün xeyirli, bəzən də xoşladığınız şey sizin üçün zərərli ola bilər» (2:216). Əgər sənin seçimin rahatlıq və asudəlikdirsə, sən çətinliklərdən kənar olmaq, onlardan qorunmaq istəyirsənsə və indiki anda abadlığa üstünlük verirsənsə, onda dərhal təslim ol, çünki sənin nəyəsə sevgin və bağlılığın səni kor və kar edəcəkdir. Ümumiyyətlə isə, sənin idrakın öz gücü ilə sənə nəyəsə nişan verdiyində, sən bunun üçün qəlbinə həqiqət dolana qədər ibadətə və istixarəyə[16] müraciət et. Çox hallarda isə nəfs qondarma bəhanələrlə insanı dolaşdırır, idrak isə həqiqi sübutları əldə rəhbər tutur. Gözəl olmayan bir kimsəyə vurulmuş və ya dadsız yeməyi qəbul edən şəxs bunu adət etdiyinə görə sevir; buna bir daha qayıtdıqda, o, bunu zinətləndirmək üçün səbəblər qondarmağa başlayacaqdır, idrak isə buna əks mövqedə duraraq bütün bunların uydurma və saxta olduğunu iddia edəcəkdir. Ümuiyyətlə isə, əsl həqiqətə çatmaq yalnız İlahi nurlanma vasitəsilə və göylərin köməyi ilə mümkündür, buna görə də insan qoy çaşqınlıq anlarında Allaha (121) müraciət etsin. Bir alim demişdir: İdrak indiki zamanda ağrı, gələcəkdə isə xeyirgətirən şeyə meyllidir, arzu isə bunun əksinə – indiki zamanda ləzzət, gələcəkdə isə ağır nəticələr verən şeyə meyl göstərir, bununla da onların arasında mübahisə başlayır və onlar ayırd etmək üçün hakim qüvvəyə (insanda olan) müraciət edirlər. Allah-Təalanın (121) Nuru idrakın yüksəlişinə səy göstərir, şeytan və onun yaxınları isə ehtirası müdafiə edirlər və onların arasında döyüş başlayır. Əgər hakim qüvvə (insanda olan) şeytanın və onun yaxınlarının dəstəsindəndirsə, onda o, həqiqət nurundan məhrum olacaq və gələcəkdə onu gözləyən xeyiri görə bilməyəcəkdir: bir anlıq sevinc onu şirnikləndirəcək və ona çatmağa səy göstərəcəkdir, (bu dəfə) Allahın (121) yaxınları məğlub olacaqlar. Əgər hakim qüvvə Allahın (121) müdafiəçilərindən ibarətdirsə, onda Onun nuru sayəsində həmin şəxs həqiqi yolu görəcək, fani həyata əhəmiyyət verməyəcək və əbədiyyətə doğru can atacaqdır. Allah-Təala (121) buyurub: «Allah Ona inananların dostudur, onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirlərin dostu isə şeytanlardır. Onları (kafirləri) nurdan ayırıb zülmətə salarlar» (2:257). Allah (121) idrakı gözəl, şəhvəti isə

murdar bir ağacla müqayisə edərək demişdir: «Məgər Allahın necə bir məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz (La ilahə illallah, Muhəmmədun rəsulullah) kökü yerdə möhkəm olub, budaqları səmaya ucalan gözəl bir ağac (xurma ağacı) kimidir» (14:24). Qoşunlar düzüldükdə və biri Allahın (121) düşmənləri, digəri isə Onun tərəfdarlarından, ibarət olan bu qoşunlar arasında döyüş başlandığı zaman yeganə yol onları mənfur şeytandan müdafiə etmək üçün Allah-Təalaya (121) müraciət etməkdir və bu barədə Allah-Təala (121) buyurub: «Əgər sənə Şeytandan (bu əmr olunduğun işləri yerinə yetirməmək məqsədilə) bir vəsvəsə gəlsə (fəsad toxunsa), Allaha sığın. Şübhəsiz ki, Allah (hər şeyi) eşidən və biləndir! Allahdan qorxanlara şeytandan bir vəsvəsə (zərər) toxunduğu zaman onlar (Allahın əzabını, lütfünü və mərhəmətini) xatırlayıb düşünərlər və dərhal (gözləri açılıb) görən olarlar» (7:200-201). Əgər sən soruşsan ki, arzuların içərisində pislənən və nöqsanlı olanlarla təriflənənlər arasında fərq mövcuddurmu, (onda mən cavab verirəm): təriflənənlər – Allahın (121) əməllərindəndir, bu, insanda yaranan bir qüvvədir ki, onun köməyi ilə ruh özündə bədən üçün və ya bədənin mövcudluğu üçün və ya insan nəslinin davamı və onların birlikdə islah olunması üçün səadət daşıyan şeyə tərəf hərəkət edir. Pislənənlər isə şər işlər görməyə təhrik edən nəfsin hərəkətlərindəndir – bu isə onun özündə yaşatdığı cismani həzdən ötrü insanın onu sevməsidir. Əgər bu istək üstün olarsa, onda şəhvətə çevriləcək, çünki o öz arxasınca insanın düşüncəsini də aparır və (çalışır ki) bu düşüncə mümkün qədər uzun müddətə onun əmrlərinə itaət etsin. Düşüncə isə istək və idrak arasında çırpınır. Əgər o, idraka xidmət edərsə, yüksələcək, nəcibləşəcək və ləyaqət yaradacaq, lakin əgər o, istək tərəfinə keçərsə alçalacaq və xəbislik yaradacaq.

## XARAKTERİ DƏYİŞMƏK İMKANLARI HAQQINDA

Yanlış fikirlərə meyl edənlər belə hesab edirlər ki, xarakter – anadangəlmə bir keyfiyyətdir, onlar Peyğəmbərimizin (122) «Allah yaranmanı başa çatdırdı» sözlərinə görə belə düşünürlər ki, xarakteri dəyişmək istəyi Allahın (121) yaratdığını dəyişmək istəyinə gətirib çıxarır və bu zaman onlar Peyğəmbərin (122) söylədiyi «Öz xarakterinizi mükəmməlləşdirin» kəlamını unudurlar.

Əgər bu mümkün olmasaydı, onda o bunu etməyi tapşırmazdı və nəsihətlər, moizələr, həvəsləndirmələr və qorxutmalar öz mənasını itirərdi, çünki aşağı düşmə təbii ağırlığın nəticəsi olduğu kimi, əməl də xarakterin nəticəsidir. Bəs onda nəyə görə onlar birini pisləyirlər, digərinə isə fikir vermirlər? İdrakın idarə etdiyi xarakterin dəyişə bilməsini onlar necə inkar edə bilərlər, axı heyvanların xarakterini dəyişmək mümkündür: vəhşi heyvanları əhliləşdirirlər və onlar ev heyvanlarına çevrilirlər, it qapmaqdan əl çəkir və təlimə yatır, azğın bir at itaətkar heyvana çevrilir – bütün bunlar xarakterin dəyişməsinə sübutlardır. Nəticədə isə (qeyd etmək lazımdır ki), Allahın (121) bütün yaratdıqları iki yerə bölünür. (Birinci qisim) bizim təsir göstərə bilmədiyimiz səma, ulduzlar, hətta bizim bədənimizin üzvləri və onların hissələri kimi şeylərdir və bu, həqiqətən də, belədir. İkincisi isə, o qisim yaradılanlardır ki, yaradıldıqdan sonra özləri ilə dəyişilmək və kamilləşmək imkanlarını daşıyırlar, lakin bunun üçün həmin şeylərin üzərində çalışmaq, onları inkişaf etdirmək zəruri şərtdir. Onun inkişafı və tərbiyələndirilməsi bəzən seçimdən asılıdır, məsələn, xurma çəyirdəyi nə xurma, nə də almalıdır, lakin əgər onu əksək və becərsək, o, alma deyil, xurma ağacı olar. Əgər insanın seçimi və onu becərmək arzusu çəyirdəklə əlaqələnərsə, onda o, xurma ağacına çevrilər. Elə bu cür də, əgər biz bu dünyada qəlbimizdə olan qəzəbdən və arzulardan tamamilə yaxa qurtarmaq vəziyyətində deyiliksə, lakin bunu arzuladığımız zaman bu, bizim səadətimiz və xilasımız üçün bir şərt olar. Bəli, xarakterin xüsusiyyətləri müxtəlif olur: onların bəziləri tez, digərləri isə gec mənimsənilir və bunların arasında mövcud olan fərqlərin iki səbəbi var. Bunlardan birincisi – bu mövcudluqda ötüb keçmədir, belə ki, istək qüvvəsi, qəzəb qüvvəsi və idrak qüvvəsi insanda mövcuddur, lakin bunlardan istək qüvvəsinin dəyişməsi daha çətin və daha mürəkkəb baş verir, ona görə ki, bu qüvvə insanda mövcud olan ən qədim, ən yapışqan və sabit qüvvədir, belə ki, o ən başlanğıcda, hətta heyvanlarda mövcud olmadığı zamanda insana verilmiş qüvvədir. Sonra coşqunluq qüvvəsi və ondan da sonra qəzəb qüvvəsi gəlir. İdrak qüvvəsi ən sondadır, bu da onunla izah olunur ki, xarakterin hər hansı cizgisi onun fərdi istifadəsinin, onun itaət etməsinin və onun faydalı, sevindirici olması əminliyinin nəticəsində təsdiqlənir. İnsanlar da bu münasibətdə dörd qismə bölünürlər. Birincisi – həqiqəti yalandan, gözəli eybəcərdən seçməyən laqeyd insandır, o, inamı və ləzzətin

ardınca gedən arzularının möhkəmliyi olmayandır. Bu qisim (insanlar) müalicənin təsiri altına ən tez düşənlərdir: onlar rəhbərin ona istiqamət verməsinə və qəlbində digər nəyəsə ehtiyaclıdırlar, bunun da sayəsində müəlliminin ardınca gedirlər və qısa müddət ərzində öz davranışlarını yaxşılaşdırırlar. İkincisi – şər işin pis olduğunu dərk edib, lakin xeyirxah iş görməyə adət etməyən insanlardır ki, onlar arzularına imkan yaradaraq və düşüncələrinin həqiqiliyinə qulaq asmadan öz pis əməllərini bəzəyib onları həyata keçirməklə məşğuldurlar; bu adamlarla məsələ daha mürəkkəb, onların xəstəlikləri daha ağırdır. Belə insana iki şeyi etmək gərəkdir: birincisi onun daxilində möhkəmlənmiş əxlaqsız hərəkətlərindən qurtulmalıdır, ikincisi isə ruhu ilə tam əks tərəfə dönməlidir. Onun islah olunması və yenidən tərbiyələnməsi mümkündür, lakin o şərtlə ki, bu işdən ciddi olaraq yapışsın. Üçüncüsü qüsurluluğun arzuolunan və zəruriliyinə, onların doğru olduğuna inamlı olan və özü də bu cür tərbiyə alan insanlardır – beləsini müalicə etmək, demək olar ki, mümkün deyil və onun pak insan olacağını gözləmə, çünki onun yanlış yola düşməsinin səbəbləri çoxdur. Dördüncüsü düzgün olmayan inam altında böyüyən və bu inamı həyata keçirmək ruhunda tərbiyə alan insandır, belə şəxs böyük miqdarda şər işlərdə və insanların ölümündə fayda görür, o, bununla fəxr edir və öz mövqeyinin yüksəldiyini düşünür – bu ən çətin qisimdir və onun kimiləri haqqında deyiblər: «Canavarı islah etməyə və ona itaətkarlıq öyrətməyə çalışmaq qaba toxunmuş paltarı ağartmaq kimi əzablı işdir». Birinci qisim insanlar – cahil, ikincilər – cahil və azmış, üçüncülər – cahil, azmış və əxlaqsız, dördüncülər isə cahil, azmış, əxlaqsız və qəddar adamlar adlanırlar.

## XARAKTERİN DƏYİŞDİRİLMƏSİNİN VƏ EHTİRASLA MÜBARİZƏNİN ÜMUMİ İSTİQAMƏTLƏRİ

Bil ki, nəfslə mübarizənin və xeyirxah əməllər həyata keçirmək vasitəsilə özünütərbiyənin məqsədi – ruhun kamilləşdirilməsi, inkişaf etdirilməsi və onun xüsusiyyətlərinin yaxşılaşdırılması üçün paklanmasıdır. Ruh və bu qüvvələr arasındakı hansısa əlaqəni sözlə təsvir etmək mümkün deyil, ona görə ki, bu əlaqə hiss olunmur, onu ancaq idrak vasitəsilə başa düşmək olar. Onun

müəyyən olunmasını burada qarşımıza məqsəd qoymuruq, lakin ruh və bədən bir-birilə sıx bağlıdır, əgər ruh mükəmməl və pakdırsa, onda bədənin əməlləri də xeyirli və gözəl olar, əgər ki, bədənin buraxdığı nişanələr gözəldirsə, bu, ruhun özündə gözəl qaydaların və müsbət keyfiyyətlərin yaranmasına gətirib çıxarır. Beləliklə, özünütərbiyə və özünükamilləşdirmə pak və mükəmməl ruhdan gələn əməllərə özünü alışdırmaqdan ibarətdir və bu, tez-tez təkrar olunduğundan adət halına düşənə qədər davam etməlidir. Bundan az sonra həmin insanın ruhunda dəyişməz bir qayda əmələ gələcəkdir ki, bu da həmin əməllərin mükəmməlləşməsinə səbəb olacaq və bunları tələb edəcəkdir, beləliklə, onlar özlərini anadangəlmə keyfiyyət kimi aparacaqlar və ona əvvəllər çətin görünən yaxşılıq (etmək) indi çox asan olacaqdır. Əgər kimsə, məsələn, özündə səxavətlilik kimi keyfiyyəti tərbiyə etmək istəsə, onda səxavətli olmağa – öz malını paylamağa çalışmaq lazımdır və bu, ona yüngül gələnə qədər bu əməli davam etdirmək lazımdır, bundan sonra həmin şəxs özü də səxavətli olacaqdır. Həmçinin əgər o, həddindən artıq təkəbbürlü olsa da, özündə təvazökarlıq keyfiyyətini tərbiyə etmək istəyirsə, buna yalnız cihad etməklə çatmaq olar – o, tez-tez və dayanmadan təvazökar insanların əməllərini həyata keçirməlidir. Bu da maraqlıdır ki, ruh və bədən arasındakı bu əlaqə müəyyən silsilə şəklindədir, belə ki, bədənin güc vasitəsilə həyata keçirilən fəaliyyətlərindən ruhda hər hansı bir keyfiyyət əmələ gəlir. Yaranan keyfiyyət bədənə təsir edir və ondan (əməli həyata keçirməyi) tələb edir – bu isə ona gətirib çıxarır ki, bədən əvvəl həmin əməli zorən həyata keçirirdisə, indi onu təbii olaraq öz adəti kimi icra etməyə başlayır. Sənətdə də belədir: məharətli mirzə olmaq istəyən və bu bacarığı tam mənimsəmək arzusunda olan ustad mirzənin etdiyini həyata keçirməlidir, daha doğrusu, onun gözəl xəttini zorən təqlid etməli, adət halını alana qədər və (yazıda) mahirlik onun şəxsi keyfiyyətinə çevrilənə qədər öz xəttini onunkuna oxşatmağa çalışmalıdır. Nəticədə əvvəl zorla etdiyi şey indi onda öz-özünə alınacaq, sanki (həmin) gözəl xətt onun xəttini gözəl etmişdir, lakin birincisi süni, ikincisi isə təbiidir, (bu da) ruhun həssaslığının sayəsindədir. Əgər kimsə bilikli və başqa düşüncəli insan olmaq istəyirsə, onda bunun üçün yeganə yol həmişə oxumaq, təhsilə həyəcanla yanaşmaq və buna fasilə verməməkdir, bununla da o, bilikli olmaq üçün özündə hazır forma və surət yaradar və təbiətinə görə bu, onun üçün asanlaşar.

Bu, bütün ruhi keyfiyyətlərə aiddir, yüksək bilik və düşüncə səviyyələrinə çatmağa səy göstərən əgər bir gecəni əldən buraxsa, bu səviyyəni itirməz, əgər bir gecəni əlavə etsə, bu səviyyəni ala bilməz, bunun kimi ruhi kamilliyə can atan şəxs də birgünlük ibadətdən sonra bunu əldə edə bilməz və bir günü əldən verərsə, onu itirməz. Lakin bir fasilə öz arxasınca digərini çəkib gətirəcək, sonra onlar daha da çoxalacaq və bu, ruh tənbəlliyə öyrəşənə, çalışmanı saxlayana və yüksək bilik səviyyəsini itirənə qədər davam edəcəkdir. Kiçik günahlarda da belə olur – biri digərini öz arxasınca gətirir, insan bilik qazanmada bir gecənin əhəmiyyətini hiss etməyə bilər, lakin o, orqanizmin inkişafı və onun böyüməsi kimi tədricən üzə çıxır. Eyni ilə insan öz ruhu və onun kamilləşməsi üçün (hər hansı) bir ibadətin əhəmiyyətini hiss etməyə bilər, lakin buna laqeydlik göstərməməlidir, ona görə ki, (bütün ibadətlər) birlikdə tamın malik olduğu çəkinin tərkibini yaradır və burada hər bir hissənin müəyyən izi vardır. Sonra isə, hər bir ibadət (insana) təsir edir, ola bilər ki, hətta bu (təsir) hissolunmaz dərəcədədir. Eyni şeyi günah haqqında da demək olar – hər şeyi sabaha saxlayan nə qədər alim kiçik günahlara laqeyd münasibətləri sayəsində xoşbəxtliyi itirərək öz həyatlarını başa vurublar. Nə qədər alimə isə müvəffəqiyyət yol yoldaşı olmuşdur. Onlar bir gün və ya bir gecə buraxdıqlarına bütün ömürləri boyu laqeyd olmamışlar və onlar ruhi kamilliyə və həqiqi biliklərə yiyələnmişlər. Bunun kimi kim ki ən kiçik günahlara biganə deyil, o, yolun sonunda yüksək dərəcədə səadətə çatacaq, çünki kiçik şeylər böyüklərə aparır. Buna görə də iman sahiblərinin əmiri Əli ibn Əbu Talib[18] demişdir: «İman[19] ürəkdə ağ nöqtə kimi zahir olur, əgər iman böyüyərsə və möhkəmlənərsə, onda həmin ağ nöqtə də böyüyər, genişlənər və qulun imanı tam və mükəmməl olduğu zaman onun ürəyi tamamilə ağ rəngdə olur. Və doğrudan da, riyakarlıq ürəkdə qara nöqtə kimi zahir olur, əgər riyakarlıq güclənərsə, həmin qara ləkə də böyüyər. Əgər qul tam riyakar olarsa, onun ürəyi tamamam qara rəngə boyanar».

# HASİL EDİLMƏKLƏ SƏADƏTƏ ÇATDIRAN LƏYAQƏTLƏR HAQQINDA

Səadətə yalnız ruhi təmizlikdən və onun kamilləşməsindən sonra çatmaq mümkün olduğunu, ruhun kamilləşməsinin isə bütün məziyyətlərin əldə edilməsindən ibarət olduğunu aydınlaşdırıqdan sonra məziyyətlərin ümumilikdə və hər birinin ayrıca öyrənilməsi zərurəti meydana çıxır. Ümumilikdə bütün məziyyətlər iki mənada olur ki, bunların da birincisi ağıl və sağlamfikirlilik, ikincisi isə əxlaqdır. Ağıl səadət yolunu bədbəxtlik yolundan ayırd edir, insana bu yolla getməyə köməklik göstərir və zəif təqlid və qeyri-inandırıcı, mümkün olmayan uydurmaların deyil, sarsılmaz imana doğru aparan inandırıcı sübutların köməyi ilə şeyləri onlar əslində necədirsə, eləcə də öz həqiqi simasında göstərir. Əxlaq isə şəriətin müfəssəl surətdə təsvir etdiyi bütün yaramaz adətlərdən yaxa qurtarmaqdan, onlara nifrət ruhunda tərbiyədən – murdar şeylərdən kənar durmaq lazım olduğu kimi, onlardan da kənar durmaq vacibdir – və özündə yaxşı adətlər yaratmaqdan ibarətdir: insan onlar üçün darıxmalı, onları sevməli və onlardan ləzzət almalıdır. Peyğəmbərimiz dediyi kimi: «Mənim gözlərimin nuru – ibadətdir[20]». Əgər sitayiş və pisdən çəkinmək ağırdırsa və hətta nifrət oyadırsa, bunun səbəbi yarımçıq inamdır, belə insan mükəmməl səadətə çata bilməz. Özü ilə mübarizə apararaq ibadət etməkdə davam edən şəxs isə böyük xeyirli işlər görmüş olur, lakin o heç də bunu öz iradəsi və arzusu ilə görənlərdən daha yaxşı deyildir və doğru deyilmişdir: «Həqiqət tərbiyə olunmamışlar üçün acıdır». Onda yalnız onu həqiqətdən ayıran şey saxlanmışdır və buna görə də Allah-Təala (121) buyurur: «Bu, ağır iş olsa da, Allaha itaət edənlər üçün ağır deyildir». Peyğəmbər (122) də söyləmişdir: «Əgər sən özün razı qalaraq Allah adından xeyirxah əməllər görə bilirsənsə, onda gör, əgər yox, onda sənin xoşuna gəlməyəni tab gətirərək daşı, bu, böyük nemətdir». Bu zaman səadətə çatmaq üçün yalnız arabir ibadətə sevinmək və hərdən günahlara nifrət etmək kifayət deyildir, bunun həmişə, bütün ömür boyu olması lazımdır. Ömür nə qədər uzundursa, məziyyət (fadıla) də o qədər güclü və kamildir, buna görə də Allahın Elçisindən (122) səadət haqqında soruşduqda, o cavab verib: «Allaha ibadətdə (keçən) uzun ömür». Elə buna görə də peyğəmbərlər və Allaha (121) yaxın olanlar ölümü sevməyiblər, çünki axirət dünyasındakı həyatı

dünyəvi həyat yetişdirir. Və uzun ömür boyu ibadət nə qədər çoxdursa, bir o qədər də mükafat böyük olur, ruh nə qədər pak və qüsursuzdursa, bir o qədər də onun kamilliyi tamdır və insanın öz bədəni ilə əlaqəsindən azad olduğu anda onun gözəlliyindən yaranan sevinc də bir o qədər güclü və böyükdür. Əgər ona öz vəziyyətini, onun ala biləcəyi ləzzəti və ya onun düçar ola biləcəyi biabırçılığı dərk etməyə imkan verməyən yuxusundan ayılarsa, bu baş verəcək. Bu ayılma dünyəvi qayğılardan uzaqlaşdıqda mümkün olur, çünki insanlar yatırlar, öldükləri zamansa oyanırlar.

Bu, məziyyət qrupudur və onlar irəlicədən ona görə təyin olunmuşlar ki, xeyirxah əməlləri həyata keçirdikdə düşünmədən, mülahizə yürütmədən, çətinlik çəkmədən onlara əsaslansınlar, ona görə ki, insan heç bir çətinlik çəkmədən həqiqəti elə tapsın ki, tikməkdə və ya yazmaqda mahir olan usta sənətkar kimi, sanki bu, onun özündən gəlir, o isə buna fikir vermir və onun üçün heç bir fərqi yoxdur. Əxlaqsızlığın ən qatı dərəcəsi isə odur ki, ən yaramaz hərəkətlər heç bir çətinlik çəkmədən, düşünmədən və mülahizə yürütmədən insanın özündən gəlir. Bil ki, bu məziyyətlər nəzəri və ruhi növə aiddir, əməli növdə isə bunlardan hər biri iki yolla baş verir: birincisi – insani təhsil və özünü könüllü əziyyətə salmadır, bunun üçün zaman, məşğuliyyət və praktika lazımdır. Bu məziyyət tədricən böyüyən insan kimi yavaş-yavaş möhkəmlənir, baxmayaraq ki, hətta insanların arasında elələri var ki, onlar üçün lap az praktika bəs edir – bu, insanın ağlından və ya onun səfehliyindən asılıdır. İkinci növ məziyyət isə İlahi səxavət nəticəsində baş verdikdə mövcud olur, məsələn, İsa ibn Məryəm və Yəhya ibn Zəkəriyyə kimi, insan doğulur və heç bir ustadı olmadan alim olur. Bu, bütün peyğəmbərlərə aiddir ki, onların hamısı hər şeyin mahiyyəti haqqında biliyə malik olmuşlar, bu isə tədris vasitəsilə mümkün deyil. Deyirlər ki, bu cür şeylər təkcə peyğəmbərlərlə deyil, «Allaha yaxın olanlar» (vəli) adlanan şəxslərlə də baş verir, bu, elə bir şeydir ki, əmək sərf etmədən və səy göstərmədən ona çatmaq mümkün deyil və o şəxsə ki, bu məziyyət verilməmişdir, qoy çalışsın ki, bu qrup insanların cərgəsinə daxil olsun və öz mövqeyinin onlarla müqayisədə nə qədər aşağı olduğunu bilsin. «Sürmə çəkilmiş gözlər təbiətən qara olan gözlər deyil». Düşünmək lazım deyildir ki, əmək və tədris sayəsində qazanılan biliyin, əxlaqi keyfiyyətlər kimi lap əvvəldən insanın təbiətində təməli qoyulmamışdır. Səmimi, doğruçu, səxavətli və qorxmaz

uşaqlar olur. Ola bilər ki, kimsə belə doğulmur, bu zaman həmin keyfiyyətlər tərbiyə və tərəqqi vasitəsilə gələ bilər. Beləliklə, məziyyət insana ya təbiətən, ya da vərdişlər[21] sayəsində gələ bilər, bəzən isə təhsil sayəsində ona çatmaq olar. O şəxsdə ki, bu üç cəhət birləşmişdir, yəni o həm öz təbiəti, həm vərdişi və həm də təhsili ilə bu məziyyətə malikdir, həmin insan mükəmməlliyin ən son həddinə çatmışdır. Və bunların arasında həmin cəhətlərlə bölünən insanların səviyyələri durur.

## XARAKTERİN YAXŞILAŞDIRILMASI YOLLARI HAQQINDA DAHA MÜFƏSSƏL

Sən mütləq bilməlisən ki, ruhun nöqsanlardan təmizlənməsi yolu ilə ruhun müalicəsi və onun məziyyətlərlə zənginləşdirilməsi bədənin xəstəliklərdən təmizlənməsi və sağlamlığa yetişməsi vasitəsilə müalicəsinə bənzəyir. Əhval ən çox normal olur, lakin xəstəlik üz verdikdə, qidalanma və ya hansısa digər səbəblərlə bağlı olaraq insanın vəziyyəti pisləşir. Hər bir yeni doğulmuş körpə də öz təbiəti ilə müsəlmandır, lakin valideynləri onu yəhudiyə, xaçpərəstə, ya da bütpərəstə çevirirlər. Daha doğrusu, insan öz nöqsanlarını təhsil və vərdiş sayəsində əldə edir. Bədən də doğulduğu anda mükəmməl olmur, o, qidanın sayəsində mümkün olan böyümə və inkişaf etmə prosesi nəticəsində mükəmməlləşir, elə bunun kimi ruh da nöqsanlarla yaranır, lakin o, tərbiyə, xarakterin yaxşılaşdırılması və onun biliklə qidalanması sayəsində kamilləşir. Əgər bədən xəstədirsə, mütləq sağlam olmaq üçün çalışmalıdır, eyni ilə ruh da əgər təmiz, nöqsansız və tərbiyəlidirsə, onda mütləq bu sağlamlığı saxlamalı, onu daha da güclü və pak etməyə çalışmalısan, əgər o, kamillikdən və paklıqdan uzaqdırsa, onda onu kamilləşdirməyə və təmizləməyə çalışmalısan. İnsanın əhvalını pozan xəstəlik onun ziddiyyəti ilə müalicə olunur – əgər bu xəstəlik isti nəticəsində yaranıbsa, onda soyuqla müalicə olunur və əksinə. Ruhun mükəmməl olmamasının səbəbinə çevrilən nöqsan da, əvvəl dediyimiz kimi, özünün əksi ilə: cəhalət – təhsillə, xəsislik – özünü səxavətli olmağa məcbur etməklə, təkəbbür – özünü təvazökar olmağa məcbur etməklə, acgözlük – özünü arzu olunan şeydən imtina etməyə məcbur etməklə müalicə olunur. Səbəbi istilik olan xəstəliyin şəfa tapması üçün təkcə onu sərinlətmək ki-

fayət deyil, bunu xəstəliyin ağırlıq dərəcəsindən, onun sürəkliliyindən asılı olaraq, xüsusi formada istifadə etmək lazımdır, bu üsuldan necə istifadə etməyin lazım olduğunu bilmək lazımdır, əgər bu ölçülərə riayət olunmazsa, xəstəlik inkişaf edəcəkdir və xarakterin müalicəsi üçün dərman kimi istifadə olunan ziddiyyətdə də elə bunun kimidir.

Həkim xəstəliyin istidən, yoxsa soyuqdan olmasına əmin olmayınca, əgər istidəndirsə, hansı səviyyədə olmasını bilməyincə, müalicə etməməlidir, bunları bildikdən sonra orqanizmin vəziyyətinə, xəstənin məşğul olduğu sənətin növünə və məşğulluq vaxtına diqqət yetirməli, buna uyğun olaraq müalicəni təyin etməlidir və elə bunun kimi, insanları öz arxasınca aparan, ardıcıllarının və şagirdlərinin ruhlarını müalicə edən şeyx də onların xarakterlərini öyrənmədən onları özünütərbiyəyə, öz biliyini inkişaf etdirməyə və müəyyən növ vəzifələrini həyata keçirməyə çağırmamalı, onlara müraciət etməməlidir. Yalnız şagirddə ən başlıca nöqsanın hansı olduğunu və bu nöqsanın inkişaf səviyyəsini bildikdən sonra onun vəziyyətini, yaşını və dözə biləcəyi müalicə növünü nəzərə alaraq ona müalicə təyin olunmalıdır. Buna görə də bir şeyx öz şagirdində təkəbbür və lovğalıq gördükdə, bu nöqsandan xilas etmək üçün ona bazara çıxaraq dilənçilik etməyi tapşırdı, yəni təkəbbürün əksi olan və alçalma adlanan şeylə onu müalicə etdi. Əgər digər bir şagirdin təmizliyə biganə olduğunu, bu məsələdə həddini aşdığını hiss etdikdə ona ayaqyolunun qeydinə qalmağı və orada təmizlik yaratmasını tapşırdı. Əgər o görsə ki, şagirdin arzusu güclüdür və o, öz qarnının istəklərinin və intim arzularının qarşısında quldur, onda ona fasiləsiz olaraq oruc tutmağı tapşıra bilər və bu zaman onun qadağan həddini aşması üçün çox az vaxt verə bilər. Tərbiyənin digər bir çox üsulları da vardır. Belə deyirlər ki, bir nəfər özünü yumşaq aparmağa məcbur etməklə ictimai yerlərdə onu söyən və təhqir edənlərə mükafat verərək özündə olan qəzəbi müalicə etmişdir – bütün bu təhqirlərə dözən həmin şəxs bir müddətdən sonra dözümlülük və mülayimlik nümunəsinə çevrilmişdir. Digəri tədricən özündə igidlik xarakterini gücləndirərək sonda dənizi qış vaxtında keçmişdir. Başqası isə dadlı yeməklər bişirərək gəlib-gedənləri qonaq etmiş, özü isə quru çörəklə qənaətlənmişdir ki, acgözlülüyündən can qurtara bilsin. Hindli zahidlər bütün gecəni ancaq bir ayağı üstə durub ibadət edərək tənbəlliyi müalicə edirlər. Bir başqası var-dövlətə olan məhəbbətindən qur-

tarmaq üçün özünün bütün əmlakını satmış və bundan əldə etdiyi pulu dənizə atmışdır. Bunlar tərbiyənin yalnız ümumi üsullarıdır, əgər biz bu haqda geniş danışsaq, vaxt uzanar. Bunun məqsədi, ey öz ruhunu pak etmək, öz xarakterini öyrənmək arzusunda olan şəxs, sənə kömək etməkdir. Əgər qəlbində müsbət xüsusiyyətlər varsa, onda bunları qorumağa çalış, əgər kimsə arzu olunmayan istiqamətə meyl etmişsə, onda onu islah et ki, yenidən tarazlıq halına qayıtsın və bunun haqqında biz daha sonra geniş söhbət açacağıq. Tarazlıq halına düşmək hər iki ifratlıqdan imtina etməkdir, çünki məqsəd ruhun bədənlə əlaqəli olan keyfiyyətlərdən təmizlənməsidir ki, bu təmizlənmənin baş verdiyi andan sonra onlara bir daha əhəmiyyət verməsin, ona görə ki, insan məhəbbət üçün can verərək, ayrılığa görə heyfslənərək və hal-hazırda məşğul ola bilmədiyi şeylərlə özünün layiq olduğu səadətə gedən yolunu bağlayır.

Əgər biz suyun nə soyuq və nə də qaynar olmasını istəmiriksə, onda, deməli, suda mötədillik axtarırıq, isti su nə qaynar, nə də soyuqdur. Bu isə keyfiyyətə aiddir. Əgər: «Məndə olan əlamətin müsbətdir və o iki ifrat tərəfin arasında olan qızıl mərkəz olduğunu necə anlamalıyam?» - deyə soruşsan, onda, deməli, naminə cihad apardığın əlamətlərin gətirib çıxardığı əməlləri aydınlaşdırmalısan. Əgər sən bu əməllərlə razısansa, onda bil ki, bu əməllərin səbəbinə çevrilən əlamətlər sənin ruhunda öz yerini möhkəm bərkitmişdir. Əgər sən bu əməlləri pis sayırsansa, onda bil ki, məsələn, var-dövlətdən aldığın həzz və bu var-dövləti toplamaq kimi, bu keyfiyyətlərin səni şikəst edir. Bu həzzin səbəbi acgözlükdür və buna görə də ona əks olan xüsusiyyəti özündə hasil et.

Şəriətdə yaxşı və pis keyfiyyətlər haqqında müfəssəl söhbət açılır, bunlarla Peyğəmbərin (122) əməlləri haqqında nağıl edən kitablar tanış edir, onlar çox məşhurdur və biz onlar haqqında aşağıda danışacağıq. Mülayimlik dedikdə, biz onu nəzərdə tuturuq ki, əgər çoxlu pul xərcləmək sənə ləzzət verirsə, onda bil ki, bu, bədxərclikdir və qınanılmalıdır, lakin orta və tərifəlayiq keyfiyyət – xəsisliklə bədxərclik arasında olan səxavətdir ki, bu zaman şəriətin və ağlının tələb etdiyini sən öz arzunla asanlıqla verirsən. Digər keyfiyyətlərə münasibətdə də eyni ilə bu cürdür və düşünürəm ki, tək bir misal da bu məsələdə kifayət edər.

Biliyin meyarının bu, ya da digər keyfiyyətin və ya xarakter cizgisinin hansı ölçüdə mövcud olduğunu əsas götürdüyünü bil-

dikdən sonra indi artıq sənə aydın olacaq ki, müxtəlif insanlar üçün şəfa üsulu fərqlidir, lakin bu üsul şəraitdən asılı olaraq, eyni bir adam üçün də fərqli olur. İntuisiya qabiliyyəti bəxş olunduğu insana səbəbi bilməyə və şəfa üsulunu tapmağa kömək edəcəkdir. İnsanların çoxunda bu qabiliyyətin olmaması səbəbindən ibadət və haqqında insanların əvvəlcədən xəbərdar edildiyi günahlardan, daha sonra isə məqsədi həzz almaq olan və icazə verilən – bizim Peyğəmbərimizin (122) söylədiyi kimi: «Bu həyata olan sevgi bütün səhvlərin əsas səbəbidir» – gözəl zövqverən şeylərdən və bu kimilərdən qurtulmaq üsulları haqda əsas müddəalar şəriətdə müfəssəl aydınlaşdırılmadığından bilikli insanlar nəyə səy göstərmək və ona necə çatmaq, nədən və necə qorunmaq barədə məsələləri öyrənmişlər və onlar bu insanların ardıcılları olmaq xoşbəxtliyi qismətlərinə düşən şəxslərə də bildikləri bu məsələləri müfəssəl aydınlaşdırmağa və onları lazımi tərəfə istiqamətləndirməyə başladılar. Onlar peyğəmbərlərin yalnız ümumi şəkildə ifadə etdiklərini aydınlaşdırmaqda və onların başlanğıc verdikləri şeyləri təsvir etməkdə həmin peyğəmbərlərin müavinləri idilər. Buna görə də xoşbəxt Peyğəmbərimiz (122) buyurub: «Alimlər – peyğəmbərlərin davamçılarıdır».

## ƏN YÜKSƏK MƏZİYYƏTLƏR HAQQINDA

Məziyyətlərin sayı çox olsa da, onların bütün növlərini və qisimlərini əsasən üç yerə bölmək olar. Bunlar müdriklik, igidlik (qəzəb qüvvəsinin məziyyəti) və əxlaqdır. Haqq isə bu qüvvələri lazım olan sıra ilə düzməkdədir. Bütün əməllər onunla yoluna qoyulur və buna görə də: «Göylər və yer haqq üzərində qurulmuşdur», - deyilir. Gəlin əvvəlcə bu keyfiyyətləri ayrılıqda nəzərdən keçirək, sonra onları aydınlaşdıraq və sonda da bu keyfiyyətlərə daxil olan növlər haqqında söhbət açaq.

Müdriklik dedikdə, biz haqqında Allah-Təalanın (121): «Allah istədiyi şəxsə hikmət (elm, mərifət, müdriklik) bəxş edər», - (2:269) buyuraraq təriflədiyi və Allahın Elçisinin (122): «Müdriklik – möminlərin axtarışlarının mövzusudur», - dediyi şeyi nəzərdə tuturuq. Müdriklik idrak qüvvəsinə daxildir və yuxarıda dediklərimizdən artıq bilirsən ki, ruhun iki qüvvəsi vardır. Bunlardan birincisi yüksək tərəfə yönəlidir, ruh onun vasitəsilə göy sakinlərin-

dən ümumi zəruri və nəzəri bilikləri əldə edir. Bu biliklər mütləq həqiqət olaraq əbədidir və həmişəlikdir, onlar heç bir şübhə oyatmırlar, onlar zaman axınında və cəmiyyətlərin təbəddülatında özləri heç bir dəyişikliyə uğramırlar və bu bilgilər Allah (121) və Onun keyfiyyətləri, mələklər, kitablar, elçilər və Onun yaratdıqlarının növləri haqqında olan biliklərdir. Bu biliklərdən də inkarın və təsdiqin eyni zamanda eyni bir şeyə münasibətdə mövcud ola bilməməsi bilgisidir. Bunlar da həqiqi biliklər, əsl hikmətlərdir. İkincisi aşağı tərəfə, daha doğrusu, bədənə və onun idarə edilməsinə yönəlmiş qüvvədir, ruh onun vasitəsilə əməllərdəki xeyirxahlığı dərk edir və onu əməli ağıl adlandırırlar, insan onun vasitəsilə öz ruhunun qüvvələrini idarə edir, öz ölkəsinin əhalisinə və evinin sakinlərinə başçılıq edir. Bunu müdriklik təşbihi ilə adlandırırlar, ona görə ki, onun dərk etməsi civə kimidir: dəyişikliyə uğrayır və daimi qalmır. Onun biliklərindən – öz var-dövlətindən xeyirxah əməllərə sərf etmək kimi məziyyət olmasına baxmayaraq, müəyyən zamanda müəyyən şəxsə münasibətdə nöqsan ola bilər. Buna görə də başlanğıcda «müdriklik» sözü səfeh mənasında idi və bu ikinci (növ) – birincinin davamı və tamamlanması – davranışdakı müdriklik, birinci isə elmi və nəzəri müdriklikdir. Davranışdakı müdriklik dedikdə, dərk edən ruhun vəziyyətini və məziyyətini nəzərdə tuturuq ki, bunları da ruh qəzəb və istək qüvvələrinin köməyi ilə idarə edir və onların hərəkətlərini müəyyənləşdirir, həmçinin onların necə olmalarını, nə zaman sakitləşmək və nə vaxt hərəkətə gəlmək lazım olduğunu təyin edir, bütün bunlar da əməllərin düzgünlüyü haqqında olan bilgilərdir. Bu məziyyəti iki nöqsan əhatə edir: yalan və ağıl zəifliyi. Bunlar onun ifratlığı və nöqsanlarıdır. Yalan onun ifrat tərəfidir, əgər qəzəb və istək qüvvəsinin buraxılması nəticəsində insan hiyləgər və yalançı olarsa və deməli, bu zaman həmin qüvvələr məqsədə doğru hərəkətlərində lazım olandan artıq dərəcədə səy göstərirlər. Yüngülağıllılıq da məziyyətin nöqsanlı tərəfi və zəifliyidir, bu, ruhun elə bir vəziyyətidir ki, burada ortaya nisbətən qəzəb və istək lazım olduğundan daha azdır, bunun səbəbi isə anlamanın gecikməsi və hansı hərəkətin daha düzgün olması haqqında məlumatın olmamasıdır.

İgidlik isə qəzəb qüvvəsinin yaxşı cəhətidir, ona görə ki, güclüdür və ehtiras qüvvəsi ilə birlikdə idraka tabedir, bu idrakın isə nə vaxt irəliləməyi, nə vaxt geri çəkilməyini şəriət istiqamətləndi-

rir və deməli, igidlik onu əhatə edən iki nöqsanlı cəhətin – ehtiyatsızlıq və qorxaqlığın arasında orta mövqe tutur. Ehtiyatsızlıq orta mövqedən israf tərəfə meyllənmədir. Bu, ağıllı insanın geri çəkilməli olduğu bir təhlükəli anda bu təhlükəyə doğru atılan digər birinin vəziyyətidir. Qorxaqlıq isə orta mövqedən çatışmamazlıq olan tərəfə meyllənmədir. Belə vəziyyətdə qəzəb qüvvəsi lazım olduğundan zəif olur və insan irəli atılmalı olduğu halda, geri çəkilir.

Əgər bu keyfiyyətlər səndə olarsa, bunların nəticəsində münasib fəaliyyət əmələ gələcəkdir, yəni igidlik nəticəsində lazım olan anda lazımi şəkildə irəliyə hərəkət baş verəcəkdir – bu, müsbət və tərifli bir keyfiyyətdir və Allah-Təalanın (121): «Onunla birlikdə olanlar (möminlər) kafirlərə qarşı sərt, bir-birinə (öz aralarında) isə mərhəmətlidirlər», - kəlamında məhz bu keyfiyyət nəzərdə tutulur, çünki olmaq və mərhəmətli olmaq heç də həmişə tərifəlayiq olmur. Yalnız idrakın ölçüsünə və Şəriətə uyğun gələn şeylər yaxşıdır. Bu keyfiyyətə çatan şəxs ondan həmişə istifadə etməklə onu mühafizə etməli və qorumağa çalışmalıdır. Bu keyfiyyət kimdəsə yoxdursa, o diqqət etməlidir: əgər onun xarakteri igidliyin çatışmadığı tərəfə, yəni qorxaqlığa meyllidirsə, onda qoy təbiəti və xarakteri öyrəşənə qədər cürət tələb edən əməlləri həyata keçirməyə özünü məcbur etsin və o zaman cəsur əməllər onun təbiətinə daxil olacaq və o, bunları heç bir çətinlik çəkmədən həyata keçirəcəkdir. Əgər onun xarakteri ifrat, yəni ehtiyatsızlıq tərəfə meyllidirsə, onda qoy o, öz hərəkətlərinin nəticələri haqqında düşünərək qəsdən onların təhlükəliliyini artırsın, qızıl orta mövqeyinə çatana qədər qoy özünü geri çəkilməyə məcbur etsin. Əgər o, bunu təsəvvür edərsə, onda onun ruhu bədənini tərk edəcək və bu bədənlə heç bir əlaqəsini saxlamayacaqdır, ruh bədən üçün kədərlənməyəcək və onun özü ilə olmadığı üçün əzab çəkməyəcəkdir. Onun sevinclə dolu əhvalı pozulmayacaq, çünki haqqın gözəlliyi və böyüklüyü onun qarşısında açılacaqdır, lakin bunun mümkün olmadığı zamanda haqqında: «Sizdən elə bir kəs olmaz ki, Cəhənnəmə varid olmasın» (19:71), - buyurulmuşdur.

Bir şeyx Allahın Elçisini (122) yuxuda görmüş və ondan: «"Xud" surəsinə görə mənim saçlarım ağardı», - dediyi zaman nəyi nəzərdə tutduğunu soruşmuşdu. O isə bu sözlərlə cavab vermişdi: «(Ya Məhəmməd) Sənə əmr edildiyi kimi, düz (yolda) ol» (11:112). Yəni düz yolu tutmaq və bu yolun, axirət dünyasındakı

Sirat[22] körpüsünün təsvirindən bildiyimiz kimi, qıldan nazik və qılıncdan iti olmasına baxmayaraq, yenə də iki kənar tərəfin ortasına doğru səy göstərmək lazımdır. Dünyəvi həyatda düzgün yolla gedən şəxs axirət dünyasındakı Sirat körpüsü üzərindən də bu cür düz keçəcəkdir, çünki insana necə yaşayıbsa, o cür də ölmək, necə ölübsə, o cür də dirilmək nəsib olunubdur. Buna görə də duanın hər rükətində tərkibində Onun «Bizi doğru yola yönəlt» sözləri olan «Əl-Fatihə» (Kitabı açan) surəsinin oxunması vacibdir, çünki bu, arzu edən insan üçün əməlin ən çətini və mürəkkəbidir. Əgər biz bunu özümüzün ancaq xarakterimizin bircə xüsusiyyətinə nisbətdə etməli olsaydıq, bu yenə də çox çətin olardı. Lakin biz bunu xarakterin bütün xüsusiyyətlərinə görə etməliyik, bu da saysız-hesabsız miqdardadır və bu haqda da sonra söhbət açacağıq. Allahın (121) və Onun mərhəməti olmadan qadağan olunmuş şeylərdən xilas yoxdur və buna görə də Onun Peyğəmbəri (122) buyurmuşdur: «Bilənlərdən qeyri bütün insanlar ölüdürlər, xeyirxah əməlləri həyata keçirənlərdən qeyri bütün bilən insanlar ölüdürlər. Bunların da içərisində həqiqi səmimi olanlardan qeyriləri ölüdürlər, səmimi olanları isə böyük təhlükə gözləyir». Biz də Allah-Təalaya (121) dua edirik ki, bu dünyada həmin təhlükəni adlamaqda və günah etməməkdə bizə yardım etsin.

İstək qüvvəsi asanlıqla və öz arzusu ilə idrak qüvvəsinin ardınca gedərsə, onun göstərişlərinə əsasən dayanarsa və hərəkət edərsə, onda onun bu məziyyəti əxlaq adlanır. Onu iki nöqsan əhatə edir: tamahkarlıq və idrakın tələb etdiyindən artıq, ifrat dərəcədə öz istəyinin qarşısını almaq. Tamahkarlıq – idrakın eybəcər bildiyi və qadağan etdiyi ifrat dərəcədə həzzə səy göstərməkdir. Bunların hər ikisi inkar olunandır, lakin əxlaq tərifəlayiq ortadır. İnsan öz arzularına nəzarət etməlidir və bir çox hallarda bu arzular ifrat dərəcədə olur, bu ən çox da intim əlaqədə, iştahada, var-dövlətə, hakimiyyətə və şöhrətpərəstliyə məhəbbətdə özünü göstərir. Bütün bunlarda çatışmamazlıq və həddindən artıqlıq nöqsandır, mötədillik isə mükəmməllikdir. Mötədilliyin meyarı isə ağıl və şəriətdir. İnsan qəzəb və istək gücünün nə üçün təyin olunmasını bilməlidir, məsələn, o bilməlidir ki, iştaha ona görə təsis olunub ki, insanı onun bədənini tərk edən şeylərin yerini doldurmaq üçün qidanı qəbul etməyə istiqamətləndirsin, bu da ona görədir ki, orqanizm yaşamaqda davam etsin və hissiyyat sağlam olaraq qalsın ki, bədənin köməyi ilə insan bilikləri əldə etsin və

şeylərin mahiyyətini anlaya bilsin – bununla o, indikinə nisbətən daha yüksək mövqeyə yüksəlsin, mələklərə daha da yaxınlaşsın, zira mükəmməllik və səadət də elə budur. Bunları bilən şəxs yeməkdən ləzzət almaq deyil, ibadət üçün öz qüvvəsini bərpa etməkdən ötrü qida qəbul edir, o, yeməkdə mötədil və qənaətcildir, istəkləri onun üzərində böyük hakimiyyətə malik deyildir. İnsan həm də bilməlidir ki, cinsi həvəs onda həzz üçün və ləzzət almaqdan ötrü deyil, onun fiziki yaxınlığa həvəs göstərməsi üçün yaradılmışdır ki, bunun da sayəsində insan nəsli davam edir, ona görə yaradılmışdır ki, gənc oğlan ailə yaratmağa və bununla da özünü qorumağa səy göstərsin, lakin əgər o, bundan razı qalırsa və ləzzət alırsa, bu da yalnız ailə ittifaqının möhkəm, münasibətlərin sıx olmasına və nikahın uzun davam etməsinə xidmət edir. O, elə bir miqdarda nikahla kifayətlənməlidir ki, bu, onun öz vəzifələrini yerinə yetirməsinə mane olmasın. Bunu bilən şəxs öz istəklərində asanlıqla mötədil olacaqdır. Bu halda o, Allahın Elçisi (122) ilə özünü müqayisə etməməlidir, çünki nikahların miqdarı Peyğəmbəri (122) zikr[24] etməkdən yayındırmamışdı və o, öz arvadlarına görə dünyəvi həyatın nemətlərinin arxasınca getməmişdir. Var-dövlət əgər Peyğəmbərə (122) ziyan gətirməmişsə, onda ona da ziyan gətirməz, – deyə hesab edənlər belə düşünənlərə oxşayırlar ki, əgər murdar bir şey nəhəng okeanda nəzərə çarpmırsa, onda bir qab suda da nəzərə çarpmaz və ya güclü bədənə malik olan insana zərər toxundura bilməyən bir şey yeni doğulmuş körpəyə də heç bir zərər vura bilməz. O qədər səfehlər var ki, özlərini ağıllı təsəvvür edirlər və ilahi vergi ilə qayğanağın müqayisəsi kimi özlərini Peyğəmbərlə (122) müqayisə edir və öz savadsızlıqları ucbatından məhv olurlar – Allah bizi kor qəlbdən qorusun, çünki bu əsl korluqdan daha pisdir, ona görə ki, gözləri kor olan şəxs artıq bilir ki, o, imkansızdır və buna görə də onun əlindən tutan şəxsin ardınca gedir. Lakin əgər ürəyi zəif görən insan digər birinin ardınca gedirsə, onda onun gözləri bu izləmənin səviyyəsinə görə açılacaqdır, lakin əgər digər bir yolla gedərsə, onun gözləri nurlana bilməz. Bu vəziyyətdə olan insanın hansı dərədə canını tapşırmağının Allah (121) üçün heç bir fərqi yoxdur. Mən özüm özlərini təsəvvüfu[25] dərindən bilən kimi hesab edən bir neçə səfeh görmüşəm ki, belə düşünürlər: əgər bu istəklərin ödənilməsi inkar edilən və fəlakət gətirəndirsə, onda nə üçün yaradılmışlar? Onlar başa düşmürlər ki, bu iki istəyin yaradılmasında – mən cinsi əlaqəni və

qarının istəyini nəzərdə tuturam – iki böyük müdriklik gizlənmişdir. Bunlardan birincisi – qida qəbulu vasitəsilə həyatın və mayalanma vasitəsilə nəslin davamıdır, çünki bunların mövcud olması Allahın (121) yaratdığı qanunlara görə Onun əvəzi olmayan və dəyişdirilə bilinməyən əbədi Hökmünün həyata keçirilməsi üçün zəruridir. İkincisi isə – insanların axirət səadətini qazanmaq istəməsi üçündür, çünki onlar bu ləzzəti dadmasalar və ağrının acısını çəkməsələr, onda Cəhənnəmdən qorxmayacaqlar və Cənnətə yetişməyə səy göstərməyəcəklər, baxmayaraq ki, onlara heç kimin görmədiyi, heç kimin eşitmədiyi və hətta heç bir insanın ağlına gələ bilməyəcəyi şeylər vəd edilmişdir. O zaman bu, öz-özünə onların ruhuna (Cənnətə meyl doğuraraq) təsir göstərəcəkdir – ruhi təmizlik elə budur.

Haqq isə bu qüvvələrin yüksəkliyinə və tabeçiliyə görə lazımi sıra ilə nizamlanmasıdır. Əgər hökmdar ölkəni idarə edə bilirsə, onun qoşunu güclü və itaətkardırsa, təbəələri isə öz zəifliklərini bilirlərsə və onları idarə etmək asandırsa, onda hökmdarın öz qoşunu və təbəələri ilə münasibəti tərifəlayiq nizamda qurulmuşdur və belə olduqda bu ölkədə haqq-ədalət öz yoluna qoyulmuşdur deyə söyləyirlər: lakin əgər bunlardan bəzilərində bu keyfiyyət olub, digərlərində isə yoxdursa, onda haqq-ədalət ola bilməz. Xarakterdəki ədalətin ardınca, şübhəsiz ki, münasibətlərdəki və idarəçilikdəki ədalət gəlir, bu, onun bir hissəsidir. Haqq-ədalət istər insanın davranışında, istər münasibətlərdə, istərsə də dövlətin əsaslandığı şeylərdə ən yaxşı qayda və quruluşdur. Münasibətlərdəki haqq-ədalət iki nöqsanın, yəni yalanın – nə zaman ki, insan özünə aid olmayan şeyi götürür – və qarşılıqlı aldatmanın – bir şəxs əməldə digərinə hər hansı bir şeyi verir və bunun da əvəzində nə minnətdarlıq, nə də mükafat vardır – ortasında mövqe tutur. İdarəçilikdə haqq-ədalət – şəhəri öz ruhunu idarə etdiyin kimi idarə etməkdir və bu zaman həmin şəhər onun hissələrinin uyğunluğuna və qarşılıqlı əlaqəsinə, təyin olunmuş məqsədə doğru birlikdə hərəkətində bir-birinə təsirinə görə insan orqanizminə bənzəyir, burada hər şey öz yerini tutur, əhali isə qulluq olunanlara və qulluq edənlərə bölünür ki, bu haqda biz ruhi qüvvələr haqqında danışdığımız zaman söhbət açmışdıq. İdarəçilikdə haqq-ədaləti iki ifrat tərəf – iki nöqsan əhatə etmir, yalnız ədalətsizlik nöqsanı onunla ziddiyyətdədir, ona görə ki, nizamlılıq və nizamsızlığın arasında orta yoxdur. Göylər və yer məhz bu cür haqq-ədalətin və

nizamın üzərində dayanmışdır və bütün dünya qüvvələri və hissələri qarşılıqlı əlaqədə olan bir insana oxşayır.

Ümumi şəkildə bu vacib məziyyətlər haqqında danışdıqdan sonra, hər bir məziyyətin və nöqsanın nədən ibarət olduğu barədə söhbət açaq və hər şeyi daha tam şəkildə aydınlaşdırmaqdan ötrü ilk olaraq idrak qüvvəsindən başlayaq, sonra qəzəb qüvvəsi, daha sonra isə istək haqqında danışaq.

İdrak qüvvəsi məziyyəti dedikdə, ağıllı idarəçilik, kamal, təfəkkürün təmizliyi və mülahizələrin düzgünlüyü nəzərdə tutulur. Ağıllı idarəçilik – insanın həm özünə və həm də istənilən şey barəsində – şəhərin idarə edilməsində, düşmənlərlə döyüşdə, yamanlıqdan qurtulmaqda və s. – digərlərinə verdiyi göstərişlərə aid nemətlərin və xeyirxah məqsədlərin əldə olunması üçün ən faydalının və yaxşının onun tərəfindən mülahizə yolu ilə tapılmasıdır. Bunu həm də ağıllı idarəçilik deyil, fərasət də adlandırırlar. Kamal – ilk baxışda bir-birinə bənzəyən mülahizələr haqqında gərgin mübahisə zamanı düzgün qərar qəbul etmək bacarığıdır, təfəkkürün təmizliyi isə – tərifəlayiq nəticələrə gətirib çıxaran qərarları tez axtarıb tapmaq qabiliyyətidir. Mülahizələrin düzgünlüyü isə – sübutları diqqətlə öyrənmədən, yalnız müşahidələrin nəticəsinin həqiqətə uyğun gəlməsidir. Yalan nöqsanına hiyləgərlik və məkrlilik aiddir. Hiyləgərlik – insan özü üçün nemət saydığı şeyə daha yaxşı necə çatmaq lazım olduğunu bilirsə, onda müsbət keyfiyyətdir, lakin onun çatmaq istədiyi mənfəət xassəcə rəzildirsə, onda mənfi keyfiyyətə çevrilir. Bu zaman həmin keyfiyyət məkrlilik adlanır. Bunların arasındakı fərq birinin xeyirxahlığında və ucalığında, digərinin isə alçaqlığındadır.

Kütbeyinliyə bacarıqsızlıq, səfehlik və dəlilik aiddir. Bacarıqsızlıq – əməli məsələlərdə təcrübənin azlığı ilə təsəvvürün düzgün olmasının məcmusudur. İnsan öz təcrübəsinə görə bir şeydə bacarıqsız, başqa bir şeydə isə əksinə, bacarıqlı ola bilər. Ümumiyyətlə, təcrübə toplamayan şəxs bacarıqsızdır. Səfehlik isə – doğru yolla getmək üçün lazım olanın müəyyənləşdirilməsində təsəvvürün düzgün olmamasıdır. Əgər bu, onda anadangəlmədirsə, o zaman bunu müalicə olunmayan anadangəlmə səfehlik adlandırırlar. Lakin bu, müəyyən xəstəlikdən də ola bilər və şəfa tapdıqdan sonra keçib gedir. Dəlilik – təsiretmə vasitələrinin seçimində təsəvvürün düzgün olmamasıdır. Dəlidə düzgün olmayan onun məqsədidir, lakin səfehdə davranışdır, çünki səfehin məqsədi ağıllının

məqsədinə oxşardır və onu əvvəlcədən müəyyən etmək olmur, lakin bu məqsədə çatmaq üçün onun özünü aparmaq qaydası ağıllı adamınkından fərqlənir, dəliliyi isə məqsədinin düzgün olmamasına görə əvvəlcədən müəyyən etmək mümkündür.

## İGİDLİK MƏZİYYƏTİNƏ AİD OLAN ŞEYLƏR HAQQINDA

Bunlar alicənablıq, cəsurluq, ləyaqət, səbirlilik, tədbirlilik, mətinlik, müvəffəqiyyət, şücaət, təmkinlikdir. Alicənablıq (kərəm) – lovğalıqla bayağılıq arasında olan ortadır, bu zaman insan çox mənfəət gətirən böyük işlərə sevinclə gedir. Bəzən bunu ləyaqət də adlandırırlar. Cəsurluq (nəcdət) – cürətliliklə məğlubiyyət arasında olan ortadır, bu, ölümün yaxın olduğu anda belə özünə inamın olması, qorxunun isə yoxluğudur. Ləyaqət (kibr ən-nəfs) – təşəxxüslə alçalmanın arasında olan ortadır, bu, insanı böyük işlər görməyə və bu zaman sevinc hiss etməməyə hazırlaşmaqda ona kömək edən məziyyətdir. Nəticədə o, alimlər tərəfindən ona göstərilən hörmətə az sevinir, tüfeylilərin göstərdikləri hörmətə, xırdalıqlara və sevincə, qorxu kimi şeylərə sevinmir, bu zaman insan ona zərər gətirən və onu narahat edən şeylərdən asılı olmur. Tədbirlilik (hilm) – coşqunluqla iradəsizlik arasında olan ortadır, bu, insana davamlılıq verən bir məziyyətdir. Mətinlik (səbat) – bu zaman insan ruhən güclü olur və zəiflikdən kənarda qalır. Şücaət (şəhamət) – bu zaman insan öz gözəllik niyyəti ilə gördüyü əməllərinə nəzarət edir. Müvəffəqiyyət (nail) – bu zaman insan böyük əməlləri ilə ləzzət alır. Təmkinlik (uikar) – təkəbbürlə həqirlik arasında olan ortadır, bu zaman insan özünü nail olduğu mövqedə yerləşdirir, ona görə ki, o, özünün nəyə layiq olduğunu bilir.

Cəsurluğun iki nöqsanı isə ehtiyatsızlıq və qorxaqlıqdır: bunlara təmtəraq, qorxu bilməmək, geri çəkilmə (qorxudan) (nukul), yaltaqlıq, özünü alçaltmaq, qorxu, ehtiras, zəiflik, təşəxxüs, özünü qiymətləndirməmək, şöhrətpərəstlik, ruhi zəiflik (maxana) aiddir. Cəsurluqdan ifrat tərəfə meyllənən şeylər ehtiyatsızlığa, çatışmamazlıq tərəfə meyllənən şeylər isə qorxaqlığa aiddir. Təmtəraq (bəzx) – bu zaman insan başqalarının qarşısında öyünmək üçün bəzək-düzəyə və bu kimi şeylərə çoxlu pul xərcləyir. Pintilik (bazala) – bu zaman insan lazım olan şeylərə pul xərcləmir və azla,

əhəmiyyətsiz şeylərlə kifayətlənir. Ehtiyatsızlıq (cəsarət) – bu zaman insan ölüm haqqında düşünmür, o halda ki, buna düşüncəsiz yanaşmaq olmaz. Geri çəkilmə (qorxudan) – bu zaman insan irəli getməli olduğu halda, ölüm qorxusu altında geri çəkilir. Təşəxxüslənmək (tabadjudj) – bu zaman insan özünü ona layiq olmayan böyük əməllərə hazırlayır. Özünü qiymətləndirməmək (sihr an-nəfs) – bu zaman insan özünü layiq olmadığı daha kiçik işlərə hazırlayır. Cəsarət – bu zaman qeyri-gözəl nəticələrə gətirib çıxara bilən ölümün səbəbləri insana təsir etmir. Qorxu (xala) – bu zaman insan ağrılara və əzablara dözə bilmir. Ehtiras (istişata) – bu zaman insan tez və güclü qəzəblənir. Zəiflik (infiraq) – bu zaman insanın qəzəbi asta və kifayət qədər olmur. Təşəxxüs (təkəbbür) – bu zaman insan özünü olduğundan daha yüksək tutur. Özünü qiymətləndirməmək (taxasus) – bu zaman insan özünə layiq olduğundan daha az hörmət edir və sayır. Əgər onda bu özünəhörmət lazım olan qədər olsa, onda artıq bu tərifəlayiq keyfiyyəti təvazökarlıq adlandırarlar. Təşəxxüsün yaranmasına səbəb olan şöhrətpərəstlik (ücb) zamanı insan özünün əsl qiymətini bilmir və o düşünür ki, daha yüksək mövqeni tutmuşdur, lakin, əslində, bu, belə deyildir. İnsanlar isə təkəbbürü və acgözlüyü məzlumluqdan və bədxərclikdən daha artıq qınayırlar, çünki baxmayaraq ki, bunlar (yəni məzlumluq və bədxərclik) da pislənən keyfiyyətlərdir, lakin (bu keyfiyyətlər hər halda) səxavətlilik və təvazökarlığa daha yaxındır. Ola bilər ki, bunların arasında fərq çox kiçik olsun və belə görünə bilər ki, bunlar tərifəlayiqdirlər, əslində isə bunlar orta mövqedən meyllənmiş olan iki nöqsandır. Buna görə də Peyğəmbərimiz (122) buyurub: «Xoşbəxt o adamdır ki, özünə zərər vurmadan, ruhən alçalmadan, özünü yazıq günə qədər gətirib çıxarmadan təvazökarlıq əldə edə bilmişdir».

## ƏXLAQA AİD OLAN ŞEYLƏR VƏ BU MƏZİYYƏTİN İKİ NÖQSANI HAQQINDA

Əxlaqın məziyyətləri – təvazökarlıq, utancaqlıq, rəhmdillik, səbir, səxavət, ehtiyatlılıq, şən olmaq (inbisat), mülayimlik, zahirən qəşənglik, aza qane olmaq, sakitlik, möminlik, dilxoşluq, narazılıq, hazırcavablıqdır. Təvazökarlıq (həya) – ədəbsizlik və ifrat ciddilik arasında olan ortadır. Onun haqqında danışırlar ki, bu, in-

sanın nöqsandan qorxaraq hiss etdiyi ağrıdır. Bunu da deyirlər ki, o özündən daha yaxşı olan şəxslərin qarşısında qayğısızlıq göstərmək qorxusudur, bir də əlavə olaraq deyirlər ki, o insanın nəsə gözəl olmayan bir şeyi etməkdən narahatlıq hiss etməsidir, bu keyfiyyət insana, onun istiqamətlənə biləcək həmin pis sayılan şeyi həyata keçirməyə imkan vermir. Ümumiyyətlə isə, əxlaq gözəl olmayan və utancaq insanların eybəcər saydıqları şeylərdən kənar durmaq üçün istifadə edilir. Utancaqlıq hər bir insanda gözəldir və bu keyfiyyət onun bu sözləri ilə anlaşılır: «Allah, doğrudan da, islama qayıdan ağsaçlı insanı cəzalandırmaqdan utanır», daha doğrusu, O, (121) həmin şəxsi cəzalandırmaz və əzablara düçar etməz. Utancaqlıq (xəcal) isə – ifrat təvazökarlıqdan doğan bir zəiflikdir, lakin bu keyfiyyətin kişilərdə deyil, qadınlarda və uşaqlarda olması yaxşı haldır. İnsan özündən yüksək saydığı digər şəxslərdən utanır. Əgər o, insanlardan utanırsa, onda onun fikrincə, özü həmin insanlardan mövqeyinə görə daha aşağıdadır. Allahdan (121) utanmayan kəslər isə Onun yüksəkliyini anlamayanlardır və buna görə də o (122) buyurdu: «Allahdan lazımınca qorxun». Buna görə də Allah-Təala (121) buyurur: «Məgər bilmir ki, Allah (onun bütün əməllərini) görür?» (96:14). Əgər insan Allahın (121) onu gördüyünü hiss etsə və əgər o, Allahdan (121) qorxandırsa, onda, şübhəsiz ki, mütləq utanacaqdır. Peyğəmbərimiz bu haqda deyib: «Utanmayan kəs Allaha inanmır», çünki utancaqlıq insan üçün ağılın ilk nişanəsi, iman isə idrakın son pilləsidir. Birinci pilləni keçməyən şəxs sonuncusuna necə çata bilər. Rəhmdillik (musamaxa) – öz ruhunun mərhəməti sayəsində özünə məxsus olan hər hansı bir şeydən imtina etməkdir, bu keyfiyyət mübahisə ilə etinasızlıq arasında ortadır. Səbir (səbr) – nəfslə, istəklə mübarizədir və gözəl ləzzətlərdən özünü mühafizə etməkdir. Səxavət (saxa) – israfçılıqla xəsislik arasında olan ortadır, bu zaman insan asan xərcləyir və o yerdən ki, götürmək olmaz, oradan almamağa çalışır. Ehtiyatlılıq (hüsn ət-təkdir) – məsrəf etməkdə mülayimlikdir. Bu zaman insan iki cəhətdən – israfçılıqdan və xəsislikdən kənar olmağa çalışır. Mülayimlik (dəmsərd) – bu zaman insanın ruhu istəklərə can atdığı anında öz xeyirxah surətini saxlayır. İntizam (intizam) – bu zaman insanın ruhu onu öz ehtimal olunan məsrəflərini mövcud vəsaiti ilə müqayisə etməyə və bu məsrəflərə yenidən baxmağa dəvət edir. Zahirən qəşənglik (hüsn əl-həya) – bu zaman insan zəruri olaraq özünü yüngüllüyə və səfehliyə gətirib çıxarmayan

ölçüdə bəzəməkdən xoşlanır. Aza qane olmaq (qənaət) – bu zaman insan (dünyəvi həyatın nemətlərinin dalınca) qaçmadan öz həyatını yaxşı qaydaya salır. Sakitlik (xudu) – ruhun sakitliyi və özündə olan nemətlərə qane olmaqdır. Möminlik (uara) – qeyri-səmimiliklə rüsvayçılıq arasında ortadır. Bu, özünükamilləşdirməkdən, riyakarlıqla və şöhrətpərəstliklə deyil, səmimi olaraq Allaha (121) yaxınlaşmaqdan ötrü xeyirxah və yaxşı əməllərlə özünü zinətləndirməkdir. Dilxoşluq (təlaqət) – bu zaman insan ədəb çərçivəsi daxilində, həyasızlıq və iftira etmədən zarafat edir. Bu, ifrat ciddilik və təlxəklik arasında olan ortadır. Hazırcavablıq (zarf) – ifrat səviyyədə (əyləncədən) özünü saxlamaq nəticəsində əmələ gələn qaşqabaqlılıqla zarafat arasındakı ortadır. Bu zaman insan müsahibinə hörmət edir, əyləncə anını əldən vermir və hər bir kəslə onun layiq olduğu tərzdə ünsiyyətdə olur. İnsanın ürəyi üçün hərdən istirahət lazım olduğundan bəzi ünsiyyətlər də onun üçün zəruridir. Lakin müəyyən çərçivə daxilində, kobudluq sərhədini (keçməmək) səviyyəsində və yalınayaqların yolunda durmadan, komediyalarda olan masqara dərəcəsinə çatmadan olunan zarafat yaxşıdır. Allahın Elçisinin (122) və onun ardıcıllarının dilxoşluğu barədə məlumatlar bizə gəlib çatmışdır və bunun necə olduğu haqqında danışırlar, lakin biz bunun müfəssəlliyinə varmayacağıq. Alicənablıq (musamaxa) – bədrəftarlıqla yaltaqlıq arasında olan ortadır. Bu zaman insan ünsiyyətdən ləzzət almağı daha üstün tutaraq sadə məsələlər barədə öz yaxınları ilə olan mübahisələri və ziddiyyətləri bir kənara qoyur. Narazılıq (tasaxxut) – paxıllıq və bədxahlıq arasında olan bir ortadır. Bu zaman insan layiq olmayan şəxsə verilən nemət üçün dilxor olur və bəlaya layiq olmayan bir kimsəyə bədbəxtlik üz verməsinə isə kədərlənir.

Əxlaqın iki nöqsanına aid olan nöqsanlar isə aşağıdakılardır: tamahkarlıq (şarx), istəyin zəifliyi (kilal aş-şaxua), həyasızlıq, arvadsifətlik, israfçılıq, xəsislik (taktir), riyakarlıq, əxlaqsızlıq, darıxdırıcılıq, ədəbsizlik, əylənmə, özünü çəkindirmə (taxaşi), bədrəftarlıq, yaltaqlıq, paxıllıq və bədxahlıq. Həyasızlıq (uakaxa) – bu zaman insan heç bir töhmətdən qorxmadan başqalarına pislik edir. Arvadsifətlik (taxannus) – bu zaman insan çox utancaq olur və bu da nə sözdə, nə də əməldə özünü göstərməyə imkan verir. İsrafçılıq (təbzir) – zərurət olmadan lazım olmayan şeylərə pul xərcləməkdir və bunun da səbəbi hər birinin öz dərəcəsi olan simiclik, xəsislik və rəzillikdir. Tamahkar insan özünü məsrəflərdən ifrat

dərəcədə çəkindirən şəxsdir və o qorxur ki, ehtiyac onu dilənməyə və başqaları qarşısında alçalmağa məcbur edər, buna görə də sanki tamahkarlığın səbəbi qorxudur. Xəsis isə elə şəxsdir ki, onun qəlbində həm də əlavə olaraq başqasının yaxşı vəziyyətdə olmasına nifrət və həmin adamı ehtiyaclı etmək istəyi vardır, bununla da onun fikrincə özü daha yüksək mövqeyə sahib olar və yüksələr. Bunun əsasında cəhalət durur. Rəzil və alçaq adam isə o şəxsdir ki, yuxarıdakılara əlavə olaraq həm də nöqsanının gücündən ən xırda şeylərdə olan biabırçılığına dözür. Beləsini oğru ilə müqayisə etmək olar. Riyakarlıq və özünü yaxşı göstərməyə çalışmaq (riya) – bu zaman insan şöhrətə çatmaq və bununla da öyünmək üçün özünü böyük və xeyirxah əməllər həyata keçirən şəxslərə oxşatmağa çalışır. Əxlaqsızlıq (xataka) – insanda özünü xeyirxah əməllərlə zinətləndirmək arzusunun olmaması və bunun əksi olan əməlləri açıq-aşkar həyata keçirməsidir. Darıxdırıcılıq (kazaza) – həddindən artıq ciddilikdir. Ədəbsizliksə (madjana) – ifrat əyləncəpərəstlikdir. Əylənmə (abas) – müsahibi ilə lüzumsuz zarafat etməkdir. Bədrəftarlıq (şakasa) – bu zaman insan müsahibi ilə ünsiyyətdə olduqda mehriban və xoş ola bilmir, səmimi söhbət əsnasında yoldaşları ilə ziddiyyətdə olur. Yaltaqlıq (malak) – müsahibinin xoşuna gəlməyə səy göstərmək və bu zaman yüngülxasiyyətli görünməsindən çəkinməməkdir. Paxıllıq (həsəd) – insanın öz tanıdığı şəxsin nail olduğu nemətlərə görə kədərlənməsidir. Bədxahlıq (şamata) – insanın öz tanıdığı digər bir şəxsə ona layiq olmadan üz vermiş bədbəxtliyə sevinməsidir.

Ədalət (adala) bütün məziyyətləri özündə birləşdirir, onun əksi olan ədalətsizlik və qəddarlıq isə bütün nöqsanları özündə toplayır. Bu keyfiyyətlərin arasında elə biri yoxdur ki, onun haqqında – əgər bu, məziyyətdirsə – həvəsoyadıcı və ya – əgər pislənən şeydirsə – qadağanedici məlumatlar olmasın. Biz bununla kitabımızı uzatmaq istəmirik. Bunları Peyğəmbərin (122) davranışları haqqında olan kitablardan və digər əsərlərdən axtarıb tapın. Bizimsə məqsədimiz insanın bu üç qüvvənin sayəsində sadaladığımız bütün bu keyfiyyətlərlə qarşılaşdığını və bu keyfiyyətlərin də hər birinin iki tərəfinin – kənarının və ortasının olduğunu aydınlaşdırmaqdır. İnsana bütün bunlarda mülayimliyi qorumaq və hər birində kənar tərəflərdən – ifratçılıqdan və çatışmamazlıqdan çəkinmək əmri verilmişdir və əgər belə olarsa, həmin şəxs məkanca deyil, mövqecə Allaha (121) yaxın olan mələklər kimi onu da Al-

laha (121) yaxın edən mükəmməlliyə çatar. Doğrudan da, Yüksək Əzəmət və Tam Kamillik yalnız Allaha (121) məxsusdur. Yaradılmış hər bir məxluq da özünün çata biləcəyi kamilliyə can atır, bu, onun məqsədidir və əgər o, həmin kamilliyə çatarsa, o zaman ondan yüksəkdə duran dünyanın hüdudlarına yaxınlaşar, əgər çata bilməzsə, o zaman özündən də aşağıda olana enər. İnsan da bunların arasındadır ki, kamilliyə çataraq mələklər səviyyəsinə yüksələ bilsin və Allaha (121) daha yaxın olsun – onun səadəti məhz bundadır. Onun üçün və heyvanlar üçün ümumi olan şeylərlə, yəni istək və qəzəb nöqsanları ilə kifayətlənmək, bununla da heyvan səviyyəsinə enərək məhv olmaq – onun bədbəxtliyi bundadır. Burada qaçağan cins atla bənzətmə aparmaq gətirmək olar, belə ki, bu heyvanın mükəmməlləşə bilməsi daha sürətli ola bilməsidir, mükəmməlləşə bilməməsinin nəticəsi isə daha aşağı mövqeyə enməsi, yəni onun ya yük atına çevrilməsi, ya da kəsilməsidir. Bu keyfiyyətlərdən və biliklərdən asılı olaraq, insanların mövqeləri – anadangəlmə keyfiyyətlərə, xarakterlərə, var-dövlətinə, təminatına və digər cəhətlərə görə – müxtəlif və hədsiz saydadır, buna görə də axirət dünyasında da insanların mövqeləri bu dünyada olduğu kimi bir-birindən fərqlənir.

## XEYİRXAH ƏMƏLLƏRİ HƏYATA KEÇİRMƏYƏ ÇAĞIRAN SƏBƏBLƏR VƏ BUNA MANE OLAN ŞEYLƏR HAQQINDA

Dünyəvi pak əməllərə gəldikdə, bunların həyata keçirilməsinin üç səbəbi vardır. Birincisi məftun olduqları və vahiməyə düşdükləri mövcudluqlar və bir də indiki zamanda və gələcəkdə insanların qorxduğu şeylərdir. İkincisi alqışı və qınağı ilə hesablaşdıqları qüvvənin tərifinə səy göstərmək və qınağından qorxmaqdır. Üçüncüsü digər məqsədlər naminə deyil, yalnız özləri üçün xeyirxahlığa və özünükamilləşməyə can atmaqdır. Birincisi qeyri-iradi duyğunun nəticəsidir və yalnız adi insanlar üçündür. İkincisi təvazökarlığın və tam mükəmməl olmayan ağılın nəticəsidir, bu, adi adamlarla müqayisədə böyük ağıla malik olan padşahların, bu dünyanın böyüklərinin və digər bu kimilərin əməllərinə aiddir. Üçüncüsü isə mükəmməlliyin nəticəsindən doğur, Allaha (121) yaxın olanlar, müdriklər və doğrudan da, yüksək idraka malik

olanlar belə hərəkət edirlər. Bu insanların mövqelərindəki fərqlərə görə belə bir ifadə işlənmişdir: «İnsana əta olunan ən gözəl şey – onu çəkindirən idrakdır, əgər bu yoxsa, onda ona qadağan edən təvazökarlıqdır, əgər bu yoxsa, onda ona əzab verən qorxudur və əgər bu da yoxsa, onda onu yandıracaq ildırım insanları və bütün dünyanı ondan xilas edəcəkdir». Bu fərqlər uşaqlıq vaxtından başlayaraq qocalığına kimi hər bir insana tanışdır. Çünki uşaqlıq vaxtı insana nəyisə qadağan etmək və tərifləyərək, ya da danlayaraq ona nəyisə etdirmək mümkün deyil, bunun üçün hazır yeməkdən və ya hiss edəcək qədər ağrı verməklə döyməkdən istifadə edirlər. Onun anlamağa başladığı və yetkinliyə yaxınlaşdığı zaman tərif və töhmət vasitəsilə onda həvəs oyatmaq və qadağan etmək mümkündür. Ona nəyisə qadağan etmək üçün qadağan olunmuş hərəkəti pisləmək və bunu həyata keçirənləri söymək lazımdır, lakin onu ədəbiyyat və ya digər məşğələyə cəlb etmək üçün həmin əməli çoxlu tərifləmək və onunla məşğul olmayan kəsləri pisləmək lazımdır – bütün bunlar açıq-aşkar təsir göstərir.

İnsanların çoxu iki pillədən yüksək olan üçüncüsünə qalxa bilmir, məlum səbəblərə görə onlar irəli gedir və geri çəkilirlər. Üçüncü pilləyə çox az rast gəlinir, bu həm də əbədi nemətlərə də aiddir – məhz bu da insanları fərqləndirir, çünki dünyəvi və əbədi arasında fərq yoxdur, fərq yalnız ondadır ki, bunlardan biri əvvəl, digəri isə sonuncu gəlir, ona görə ki, hər bir ağıllı insan nemətlərə can atır. Hər hansı bir şeyə çatmağa səy göstərməyin səbəbləri bu üç qismin çərçivəsindən kənara çıxmır, sanki, Allaha (121) itaət edən və günah işlətməyən hər bir kəs üçün yalnız üç pillə mövcuddur. Birinci pillə - bu kəslər onlara Cənnətdə vəd olunmuş mükafatları qazanmağı arzulayır və Cəhənnəmdə onları gözləyən cəzalardan qorxurlar. Bu, adi adamların səviyyəsidir və belələri sayca daha çoxdurlar. İkinci səviyyə Allahın (121) razı qalmasına səy və Onun qəzəbi qarşısında qorxudur, mən şəriət cəhətdən əsl razılığı və qəzəbi nəzərdə tuturam, belə səviyyə mömin insanlar üçündür və onlar birinci ilə müqayisədə sayca çox azdırlar. Üçüncülərə çox nadir hallarda təsadüf olunur, bunlar Allaha (121) yaxın olmaqdan başqa heç bir şey istəmirlər və Onun razı qalmasına can atırlar, onlar hər şeyi yalnız Onun üçün edirlər və Allaha (121) mələkdən daha yaxın olanların cərgəsinə qoşulmaq arzusundadırlar. Bu səviyyə ən mömin (sıddik) insanların səviyyəsidir və ona görə də Allah (121) belə buyurub: «Səhər-axşam Rəbbinin

rizasını diləyərək Ona ibadət edənlərlə birlikdə özünü səbirli apar (nəfsini qoru)» (18:28). Bir dəfə Rəbiyədən[26]: «Sən nəyə görə Allahdan Cənnət diləmirsən?» - deyə soruşduqda, o: «Əvvəl qonşu, sonra ev», - deyə cavab vermişdir. Başqa bir müdrik demişdir: «Kim Allaha ibadət edib, bunun əvəzində nəsə əldə etmək haqqında düşünürsə, beləsi ruhən rəzildir». Zəif idrak bunu anlaya bilmədiyinə görə – insanların çoxu məhz bu cür ağıla malikdirlər – Allah (121) Cənnəti və Cəhənnəmi xəlq edərək, cəlb edərək və qorxudaraq bunları öz yaratdığı məxluqatına vəd etdi. O, təfsilatı ilə, lakin birbaşa deyil, Allahın (121) buyurduğu bu ifadə kimi, rəmzlərlə bunları təsvir etdi: «Ona can ataraq», həm də: «Biz Öz qullarımız üçün onların heç birinin görmədiyi, heç birinin eşitmədiyi və insan ağlının təsəvvür edə bilmədiyini hazırlamışıq».

Xeyirxah əməlləri həyata keçirməyə isə iqtidarsızlıq (kusur) və xəta (taksir) mane olur. İqtidarsızlıq xəstəlikdən və ya özünə, öz ailəsinə yemək tapmaq üçün işləmək zərurətinin olmamasından və bu kimi səbəblərdən yaranır – bu bağışlanır və pislənmir, lakin bu adam heç bir vaxt mükəmməlliyə çatmayacaq və Allah-Təala (121) qarşısında qorxudan və Onun öz mərhəməti ilə bu maneələri aradan götürməsi üçün Ona müraciət edərək yalvarmaqdan başqa, bunun heç bir əlacı yoxdur. Xətalar isə iki cür olur – bixəbərlik və insanın üzərinə hakim olmuş istəklər. Bixəbər axirət dünyasının nemətlərindən heç bir şey bilmir və onlarla müqayisədə fani dünyanın ləzzətlərinin nə qədər əhəmiyyətsiz olduğunu anlamır. Xəbərsizlik iki dərəcədə olur. Birincisi – laqeydlikdən və insanın onu lazımi istiqamətə yönəldən müəllim tapa bilməməsindən yaranan xəbərsizlikdir. Beləsini düzəltmək asandır, bunun üçün hər yerdə insanları laqeydlikdən ayıldan və onları fani dünyadan axirət dünyasına cəlb edən, günahlardan qurtulmaq və imanı qorumaq yollarını göstərən alimlərin və vaizlərin olması lazımdır. İkincisi isə odur ki, bu zaman hər hansı bir şəxs səadətin yalnız dünyəvi ləzzətdən ibarət olduğuna, indiki zamanda hakimliyinə əmindir və axirət həyatının ümumiyyətlə olmamasına, ya da özünün əməllərinin nədən ibarət olmasından asılı olmayaraq, hər bir dindar adamda olduğu kimi, yalnız sadəcə inamın olmasının kafiliyinə özünü inandırmışdır. Yaxud da Allahın (121) əfvinə və Onun mərhəmətinə tamamilə ümidvardır, axı O – Səxavətli və Rəhmlidir, günahkarların səhvlərinin Ona heç bir ziyanı yoxdur və O, hökmən onları bağışlayacaqdır. Bu, səfehliyin bir növüdür və bir

çox insanları Allaha (121) itaət etməkdən əl çəkməyə və günaha batmağa məcbur etmişdir. Kim fikirləşirsə ki, axirət həyatı ümumiyyətlə yoxdur, həmin şəxs tam inamsızlığını və təmiz yanılmasını büruzə verir. Əgər bu inam onda möhkəmlənərsə, onda o, insan olmaqdan qalar və mütləq məhv olar. Yalnız inamın olmasının kifayət edəcəyini düşünənlər isə iman həqiqətlərinin bilmədiklərini və «Səmimi olaraq: "Allahdan başqa allah yoxdur", - deyənlər Cənnətlikdir» sözlərinə laqeyd olduqlarını büruzə verirlər. Səmimiyyət insanın sözləri ilə inamının uyğun gəlməsini ifadə edir, belə olmadıqda həmin şəxs riyakar (munafik) olur. Bunun ən azı da odur ki, öz istəyini ilahiləşdirməsin, çünki öz istəklərinin ardınca sürünən kəs onun quludur və o da həmin şəxsin allahıdır, bu da «Allahdan başqa allah yoxdur» ifadəsinə uyğun olmur və deməli, həmin şəxs səmimi deyildir. Bir şəxs: «Mən yeməyimə şəkər əlavə etmişəm», - deməyi ilə – əslində isə bunu etməmişdir – bu yeməyin daha dadlı olduğunu düşünürsə və ya bir kimsə: «Mən öz kənizimlə yatmışam», - dedikdən sonra – əslində isə mayalanma baş verməmişdir – özünün oğlu olacağını fikirləşirsə, belələri bilməlidir ki, dünyəvi həyatda olduğu kimi, axirət həyatında da vasitə olmadan məqsədə nail olmaq mümkün deyil, zira dünyəvi həyatla axirət həyatı eynidir. Lakin ona görə bu həyat axirət (axira)[27] adlanır ki, o daha sonra gəlir. Ana bətnində mövcud olan həyata nəzərən bu dünyaya gəlişin özü də axirətdir. Yetkinləşmə və ağıllılıq – bunlara qədər mövcud olan vəziyyətə nisbətən axirətdir. Ağıllı insanların yüksək səviyyəyə yetişməsi əvvəlki səviyyəyə nisbətən axirətdir. Bu yaradılışın mərhələləri üzrə hərəkətidir. Ölüm isə – digər bir mərhələ, digər bir növ yüksəliş, digər bir doğuluş formasıdır və Peyğəmbərin (122): «Məzar – ya Cəhənnəmin bir quyusu, ya da Cənnətin bir bağıdır» ifadəsindəki kimi, bir dünyadan başqa bir dünyaya keçiddir, daha doğrusu, ölüm – yalnız halın dəyişməsidir. Susuzluqdan və aclıqdan əzab çəkən bir insan əgər su içməyə və yemək yeməyə getməzsə, mütləq öləcəkdir. Kimsə firavanlığı üçün ticarət etmədən yalnız Allaha (121) ümid bəsləyirsə, onda bu firavanlığa heç zaman əli çatmayacaqdır və bunun kimi, kim axirət həyatında səadət arzusundadırsa və eyni zamanda bu istəyə doğru hərəkətdədirsə, onda «...zəhməti (Allah dərgahında) qəbul olunar» (17:19). Allah-Təala (121) məhz bunu nəzərdə tutaraq buyurur: «İnsana ancaq öz əməli və zəhməti qalar» (53:39).

Əgər o bilirsə ki, ən mükəmməl təmtəraq məhz Allahın (121) yanındadır və ən yüksək səadət Ona yaxın olmaqdadır, yalnız həqiqi mükəmməlliyə və əxlaqa çatmaqla məkanca deyil, mahiyyətcə Ona yaxın olmaq mümkündür. Kamilliyə çatmayan şəxs Allaha (121) necə yaxınlaşa bilər? Allaha (121) yaxınlaşmaq arzusunda olan qüsurlu bir kimsə öz gecələrini bilik qazanmaqla keçirmirsə və Allahın (121) mərhəmətinə ümid olub düşünürsə ki, bu gecə yatıb, səhər öz zamanının ən yaxşı insanlarından biri kimi yuxusundan oyanacaq, zira Allahın (121) mərhəməti böyükdür və Onun Qüdrəti onun kimi çoxlarına bəs edər, onda ona deyəcəklər: «Bu əməl yalanla, səfehliklə, zahirən gözəl sözlərlə doludur»; o düşünür ki, (xoşbəxt) axirət həyatını fəaliyyət göstərmədən və heç bir şey etmədən əldə etmək olar. Doğrudan da, bu, onun vəziyyətidir.

## NEMƏTLƏRİN VƏ SƏADƏTİN NÖVLƏRİ

Allahın (121) mərhəməti ayrı-ayrılıqda saysız-hesabsız olsa da, onları, ümumiyyətlə, beş qismə bölmək olar: birincisi axirət həyatındakı səadətdir ki, bu da yox olmayan mövcudluq, kədərsiz sevinc, cəhalətdən kənar bilik, yoxsulluqdan uzaq zənginlikdir – buna Allahın (121) köməyi olmadan çatmaq mümkün deyil və özü də ikinci növlə – ruhi məziyyətlərlə tamamlanır ki, biz də bunları ümumi şəkildə dörd şeylə hüdudlandırmışıq: idrak və onun kamilləşməsi – bilik; əxlaq və onun kamilləşməsi – möminlik; cəsurluq və onun kamilləşməsi – cihad; haqq və onun kamilləşməsi – ədalət. Bunlar, əslində, inamın əsaslarıdır. Saydığımız məziyyətlər üçüncü növlə – cismani məziyyətlərlə tamamlanır ki, bu da dörd şeydən – sağlamlıq, ağıl, gözəllik və uzun ömürdən ibarətdir. Bunlar da öz növbəsində dördüncü növlə – insanı əhatə edən məziyyətlərlə tamamlanır və bu növ özünü dörd şeydə – zənginlik, ailə, qüdrət və nəslin nəcibliyində göstərir. Əgər beşinci növ – Allahdan (121) gələn məziyyətlər olmasa, bütün qalan məziyyətlərin heç bir mənası olmazdı. Bu növə isə Allahın (121) göstərdiyi düzgün yol, Onun məsləhəti, Onun köməyi və himayəsi aiddir. Axirət həyatından sonra bu səadətlərin on altı növü vardır. Dediyimiz kimi, ruhi məziyyətlərdən qeyri, digərlərində insanın şəxsi mülahizəsinə yer yoxdur.

Beləliklə, sən öyrəndin ki, nemət beş növə bölünür, bunlar da axirət, ruhi, cismani, zahiri və yuxarıdan gələn nemətlərdir. Onlar bir-birinə ya ruhi məziyyət və sağlamlıq kimi zəruri, – ruhi məziyyətlər olmadan ölümdən sonrakı xoşbəxtliyə çata bilmək və sağlamlıq olmadan ruhi məziyyətləri əldə etmək mümkün deyildir ya da zahiri məziyyətlərdəki fayda, mənfəət kimi lazım olur, zira zənginliyin, ailənin və nəcib nəslin olmaması məziyyətlərə zərər vura bilər. Sən əgər: «Zənginlik, ailə, qüdrət və nəslin nəcibliyi kimi zahiri məziyyətlərə nə ehtiyac var?», deyə soruşsan, bil ki, bunlar səy göstərilən arzulara çatmağa kömək edən qanad, nəzərdə tutulmuş şeylərin həllini yüngülləşdirən alət kimidir. Zənginliyə gəldikdə, məsələ bundadır ki, kamilliyə can atan kasıb döyüşə silahsız gedən əsgər və ya şikar ovlayan qanadsız şahin kimidir və buna görə də Peyğəmbərimiz (122) buyurub: «Təmiz var-dövlətin möminin əlində olması nə yaxşıdır!» və başqa bir yerdə də buyurub: «Zənginlik əxlaqa necə də kömək edir». Əlbəttə, belədir, çünki pulu olmayan öz vaxtını yemək, paltar və başqa zəruri şeylər qazanmaq üçün sərf edir və onun məziyyətlərin ən nəcibi olan biliyi əldə etməyə vaxtı çatmır. Daha sonra isə o, həcc icra edə, ehsan və zəkat verə bilmir, insanlara kömək etmək iqtidarında olmur. Ailə və uşaqlar isə – bunlara olan ehtiyac məlumdur, zira qadın – insanın tarlasıdır, o, kişinin imanının qoruyucusudur və Peyğəmbər (122) bu barədə buyurub: «Əxlaqlı qadın imana necə də kömək edir!», uşaqlar barəsində də o, (122) belə buyurub: «İnsan öldükdə üç şeydən – fayda gətirən ehsanından, insanların istifadə etdiyi biliyindən və onun üçün dua edən mömin oğlundan başqa, onun bütün xeyirxah işləri başa çatır». İnsanın böyük ailəsi və çoxlu qohumları olduqda, onlar ona kömək edir; onlar, elə bil, onun qulaqları, gözləri və əlləridir, bu isə onun dünyəvi əməlləri həyata keçirməsini yüngülləşdirir və qəlbi Allaha (121) ibadət etmək, Onu (121) yada salmaq və bilik əldə etmək üçün sərbəst olur – bütün bunlar da imanın güclənməsinə kömək edir. Özünün qüdrətilə o, haqsızlıqdan müdafiə olunur, bu isə müsəlmana vacibdir, çünki ona zərər vurmaq istəyən düşmən və ya ona ziyan toxundurmağa can atan pis adam həmişə mövcuddur və bu da onun vaxtını və qəlbini məşğul edə bilər. Elə buna görə də deyirlər: «İman və hakim – əkiz qardaşlardır». Daha sonra deyirlər: «İman – özül, hakim isə onun qoruyucusudur», belə ki, özülü və əsası olmayan şey mütləq dağılar, nəyisə qorumasan, onu hökmən itirəcəksən. Buna

görə də Allah-Təala buyurur: «Əgər Allah insanların bir qismini digər bir qismi ilə dəf etməsə idi, yer üzü fitnə-fəsada uğrardı» (2:251). Ümumiyyətlə isə, düşmən olmasa, insan sərbəst olaraq özünü ibadətə həsr edə bilər. Bu isə müəyyən qədər qüdrət olmadıqda mümkün deyil, belə ki, nemətə gətirib çıxaran şey də nemətdir və nemətə aparan yoldakı maneələri dəf edən şeyin özü də nemətdir. Nəslin nəcibliyinə və əcdadların məziyyətlərinə gəldikdə, ola bilər ki, kimsə buna biganə olsun və insanı onun əməlləri müəyyən edir və o yalnız öz əməllərinə görə qiymətləndirilir – deyə söyləsin. Əlbəttə, ruhən nəcib olmayan nəcib əsilli ilə ruhən nəcib olub əsli nəcib olmayanı müqayisə etsək, əsli nəcib olan dəfələrlə aşağı səviyyədə olar, lakin hər iki tərəfdən nəcib olsa, onun dəyərinin üstünlüyünü inkar etmək olmaz. Çünki bu, həmin insanı daha çox güclü edir. Nəciblik – imam[28] olmağın şərtlərindən biridir. Bəziləri belə düşünürlər ki, imam Qureyş[29] qəbiləsindən olmalıdır, bu isə təbiidir, çünki xarakter qəddi-qamətin ardınca gəlir və köklərdən budaqlara (əsas olandan ikinci dərəcəliyə) doğru keçir, buna görə də Peyğəmbər (122) buyurub: «Öz soyunuza görə seçin» və daha sonra bunu da söyləyib: «Peyin böcəyindən qorunun», – bu, pis kökə malik yaxşı qadındır. Biz heç də özünü bu torpağa və onun hökmdarlarına, padşahlarına aid etməyi deyil, biz özünü pak və biliklə, ibadətlə, idrakla zinətlənmiş məziyyətli ruhlara aid etməyi nəzərdə tuturuq. Bu da səadətin növlərindən biridir. «Bəs bu cismani məziyyətlərin nə faydası var?» – deyə soruşsan, onda biz sənə cavab veririk ki, sağlamlığa, gücə və uzun ömürlülüyə olan ehtiyac şübhəsizdir, lakin gözəlliyə biganə qalmaq olar və belə də deyirlər ki, insana özündə məziyyətlər tərbiyə etməyə qoymayan xəstəliklərdən bədəni qoruyaraq onu sağlam saxlamaq kifayət edir. Doğrudan da, gözəllik o qədər də çox fayda gətirmir, lakin o ya məlum ki, dünyəvi həyatda, ya da öldükdən sonra, iki cəhətə görə xoşbəxtliyin və nemətlərin bir növüdür. Birincisi, eybəcərlik pislənir və insanlar öz təbiətinə görə belə şəxsə yaxınlaşmaq istəmirlər, lakin gözəl insan çox şeyə nail ola bilər, zənginlik kimi, gözəllik də sanki uçmağa kömək edən qanaddır. Dünyəvi həyatda kömək edən şeysə, axirətdə də kömək edir, çünki axirətdəki səadətə yalnız bu dünyadakı (məlum) vasitələrlə çatmaq olar. İkincisi – gözəllik çox vaxt ruhun möminliyinə işarə edir, ona görə ki, ruhun nuru əgər kamil olarsa, mütləq bədəndə də əks olunur. Zahiri görünüş və ibadət, demək olar ki,

həmişə bir yerdə irəliləyir. Buna görə də nüfuzetmə qabiliyyətinə malik olan insanlar çox vaxt bədənin formasına görə onda olan gizli keyfiyyətləri təyin edə bilirlər. Sifət və gözlər daxili aləmi göstərən güzgü kimidir, buna görə də onlar qəzəbi və kini əks etdirirlər. Belə deyirlər ki, «gülərüzlülük qəlbdə olanları göstərir» və «hər bir pis adamın sifəti onun özündən daha betərdir».

Məmun bir dəfə öz qoşununu nəzərdən keçirir və bu zaman eybəcər bir adam görür. Məmun ona danışmağı əmr edir, məlum olur ki, o həm də pəltəkdir. O, həmin adamın adını siyahıdan çıxarıb deyir: «Əgər qəlb zahiri işıqlandırsa, onda bu, nitqdə büruzə verər, bu adamda isə nə zahiri, nə də daxili bir şey yoxdur». Peyğəmbərimiz (122) də buyurub: «Nəyi isə gözəl insanlardan istəyin». Daha sonra isə buyurub: «Əgər elçi göndərmək istəyirsinizsə, onda (bu məqsəd üçün) gözəl sifətə və yaxşı ada malik olanını axtarın». İslam hüquqşünasları deyirlər ki, əgər bütün ibadət edənlər hər şeydə bərabərdirlərsə, onda imam sifətdən gözəl olan şəxs olmalıdır. Allah-Təala (121) da buyurub: «Allah sizdən ötrü onu (bəyənib) seçmiş, elm və bədəncə (qüvvəcə) ona üstünlük vermişdir» (2:247). Burada gözəllik dedikdə, istək doğuran şeyi, daha doğrusu, qadın incəliyini deyil, uca boy, düzgün qamət, bədənin tarazlığı, bədən üzvlərinin mütənasibliyi və sifətin cəzbedici olması nəzərdə tutulur və bütün bunlar elə ölçüdə olmalıdır ki, ona baxmaq xoş olsun.

Əgər, «Hidayət[30], rüşd[31], təsdid[32], təyid[33] – bu köməkçi məziyyətlər (fədail tovfiqiyyə) nə ifadə edirlər?» – deyə soruşsan, onda bil ki, tovfiq[34] – bir kimsənin onsuz keçinə bilmədiyi şeydir. O, insanın istəklərinin və əməllərinin Allah-Təalanın (121) qərar verdiyi və təyin etdiyi şeylərə uyğun gəlməsini göstərir. O həm xeyirə, həm də şərə tədbiq oluna bilir, lakin ən çox xeyirə və səadətə tədbiq olunur. Onun insana nə üçün vacib olduğu aydındır, zira belə deyilmişdir: «Əgər bir gəncə Allah-Təala kömək etməzsə, onda həmin gəncin özünün verdiyi qərarlar ən çox onun özünə qarşı cinayət törədəcəkdir». Hidayətə gəldikdə isə, o, məziyyətlərə çatmaq üçün yeganə vasitədir, çünki o, bütün nemətlərin başlanğıcıdır və Allah-Təala (121) da buyurub: «Rəbbimiz hər şeyə öz surətini və şəklini verən, sonra da ona doğru yol göstərən Allahdır!» (20:50). Allah-Təala (121) bunu da buyurub: «Əgər Allahın sizə neməti və mərhəməti olmasaydı, sizdən heç kəs heç vaxt (günahdan) pak olmazdı. Lakin Allah (121) dilədiyini (günahdan)

pak edər» (24:21). Peyğəmbərimiz (122) də buyurub: «Cənnətə daxil olan hər kəs Allahın mərhəmətinə görə bunu edir», yəni Onun yolu göstərdiyinə görə və ondan: «Ey Allahın Elçisi, hətta sən də?» -deyə soruşduqda o: «Hətta mən də», - deyə cavab verdi.

Hidayət üç dərəcəyə malikdir. Birincisi, xeyrin və şərin yolunun göstərilməsi, bunu da Allahın (121) bu sözləri nişan verir: «Biz ona iki yolu (xeyir və şər, küfr və iman yollarını) göstərmədikmi?!» Bununla Allah-Təala (121) özünün bütün qullarını – bəzilərini idrakın vasitəsilə, bəzilərini isə elçilərinin öyüd-nəsihətləri vasitəsilə – hədiyyə etdi. Buna görə də Allah-Təala (121) buyurdu: «Səmud qövmünə gəldikdə, Biz onlara haqq yolu göstərdik, amma onlar korluğu (küfrü) doğru yoldan üstün tutdular» (41:17). İkincisi, qulun elmdə irəliləməsi və haqq əməllərinin miqdarının artması ilə uyğun olaraq bir vəziyyətdən digər vəziyyətə keçdiyində aldığıdır. Allah-Təala (121) bunu nəzərə alaraq buyurmuşdur: «Doğru yolu tapanlara gəldikdə isə, Allah onların doğruluğunu daha da artırar və onlara təqvalarının (möminliklərinin, Allahdan qorxub pis yoldan çəkinmələrinin) mükafatını verər!» (47:17). Üçüncüsü, Allaha (121) və peyğəmbərliyə yaxın olan aləmdə nur saçan işıqdır və o, vəzifələrin həvalə olunması və öyrənmək imkanının baş verməsi ilə əlaqədar olaraq idrakla qavranıla bilinməyən şeyləri göstərir. Allah-Təalanın (121): «Düzgün yol yalnız Allahın göstərdiyi yoldur», - (2:120) sözləri ilə məhz bu nəzərdə tutulur. O, bunu Özünə aid etmiş və düzgün yol adlandırmışdır. Onu aşağıdakı ayədə: «Heç (küfrlə) ölü olub diriltdiyimiz, sonra insanlar arasında gəzmək üçün özünə bir nur (islam dini) verdiyimiz Adam zülmət içində qalıb oradan çıxa bilməyən şəxs kimi ola bilərmi?» (6:122) və həm də Onun bu sözləri ilə: «Məgər Allahın köksünü (qəlbini) islam dini üçün açmaqla Rəbbindən nur üzərində olan kəs (qəlbi möhürlənmiş kimsə kimi ola bilərmi?!)» (39:22) -həyat adlandırırlar.

Rüşd insana öz məqsədlərinə doğru irəliləməsinə kömək edən, onun üçün nemət olan şeylərə çatmaqda güc verən, onun üçün zərər olan şeylərdən isə onu mühafizə edən İlahi qayğını ifadə edir. Bu, Allahın (121) göstərdiyi kimi, daxildə olur: «Biz daha öncə İbrahimə də doğru yolu nəsib etmişdik (peyğəmbərlik ehsan buyurmuşduq). Biz onun buna layiq olduğunu bilirdik» (21:51). Təsdid – onun öz məqsədlərinə səy göstərməsi üçün bütün arzularını və hərəkətlərini nəzərdə tutulana istiqamətləndirilməsidir.

Rüşd – təyin etmək vasitəsilə kömək göstərişidir. Təsdid – niyyət vasitəsilə kömək və yardımdır. Təyid isə – onun daxili görmə qabiliyyəti (idrak) vasitəsilə möhkəmləndirilməsi və qüvvəsinin zahirdən gücləndirilməsidir ki, Allah-Təalanın (121) bu sözləri məhz onu nəzərdə tutur: «O zaman səni müqəddəs ruhla qüvvətləndirmişdim» (5:110). Allah-Təala (121) ona insana xeyirxah əməllər həyata keçirmək üçün güc verən, pis işlərdən isə – insanın daxilində gizli olaraq qalan və qavranıla bilinməyən qadağan şəklində – uzaqlaşdıran bu ilahi vergini himayə edir. Allah-Təala (121) bunu nəzərdə tutaraq demişdir: «Doğrudan da, qadın ona meyl salmışdı. Əgər Rəbbinin dəlilini (xəbərdarlığını) görməsəydi, Yusif də ona meyl salardı» (12:24).

Bu şeyləri yalnız Allahın (121) inamdan ayıran şeylərə görə deyil, qoyulan vəzifələrə uyğun olaraq öz quluna əta etdikləri vasitəsilə əldə etmək olar (bu – pak və nüfuzedici ağıl, diqqətli və anlayan eşitmə qabiliyyəti, görən və diqqətli ürək, yaxşı müəllim və ustad və artıq puldur). İnsanı səfehlərin axmaq hərəkətlərindən qoruyan və düşmənlərin haqsızlıqlarından xilas edən nəsil və qüdrət də Allahın (121) əta etdiklərindəndir. Bununla da səadətin növləri haqqındakı söhbətimizi başa vururuq.

## SƏADƏTİN MƏQSƏDİ VƏ ONUN MƏRHƏLƏLƏRİ HAQQINDA

Bil ki, həqiqi səadət – ölümdən sonrakı səadətdir, dünyəvi səadət kimi qeyriləri isə ya kinayə, ya da səhvən səadət adlandırılır və bunlar da axirətə, daha düzgün desək, axirət səadətinə kömək etmirlər. Bütün bunlar axirət səadətinə gətirib çıxaran və ona səbəb olanlardı, zira nemətlərə və səadətə gətirib çıxaran şeyin özü də nemət və səadət adlandırıla bilər. Fayda gətirən şeyləri dörd üsulla bölərək aydınlaşdırmaq olar. Birinci fərqlənənlər istənilən halda fayda verən şeylər – ruhi məziyyətlərdir. Nemətlərin içərisində elələri də vardır ki, bəzən faydalı olurlar, bəzən də yox, lakin çox da böyük olmayan bolluq kimi daha tez-tez kömək edəndirlər. Lakin elələri də vardır ki, bəzi elm və sənətlər kimi daha çox insanlara ziyan gətirirlər. Bunların çoxu aydın olmadığına görə ziyanlını faydalı, faydalını uca, ucanı qiymətli, qiymətlini isə ən

vacib şey saymamaq üçün və bununla öz yolunu uzatmamaq üçün ağıllı insana bu şeylərin həqiqi mahiyyətini bilmək vacib olmuşdur. Doğrudan da, bəzən insan piy gördüyünü düşünsə də, həqiqətdə həmin şey şiş olur. Bəzənsə belini bağlamağa kəndir axtaran zaman ilanı kəndir bilib əlinə götürür və o da onu sancır. Yalnız həqiqi biliklər bu şeyləri asan anlaşılan edir.

İkinci üsul. Nemətləri özünə görə vacib olanlara və başqa nəyəsə görə vacib olanlara bölmək olar, bundan başqa elələri də var ki, bəzən özünə görə, bəzən də başqa nəyəsə görə vacibdir. İnsan nemətlərin dərəcələrini bilməlidir ki, hər birinə öz haqqını versin. Özünə görə vacib olan – axirət həyatıdır və ona can atmaqdan başqa qeyri bir məqsəd yoxdur. Başqa nəyəsə görə vacib olan isə (məsələn) puldur – dirhəmlər və dinarlardır, daha doğrusu, əgər onların müəyyən təyinatı olmasaydı, onlar da çınqıla və ya adi daşa bərabər tutulardı. Bəzən özünə görə, bəzən də başqa nəyəsə görə vacib olan nemətsə, məsələn, insanın sağlamlığıdır. Sağlam ayaqların lazım olduğu yerişdən insanın imtina edə bilməsinə baxmayaraq, sağlam ayaqlardan imtina edə bilməz, çünki bu, onun sağlamlığıdır.

Üçüncü üsul. Nemətlər başqa bir tərəfdən faydalı, gözəl və xoşagələn olanlara bölünür. Bəla da zərərli, eybəcər və ağrılı olaraq üç yerə bölünür. Bunların hər ikisi özləri də iki cür olur – tam və qismən. Tam – xeyirxahlıqda bütün üç keyfiyyəti birləşdirən müdriklik kimidir çünki o, faydalıdır, gözəldir və xoşagələndir, o cümlədən cəhalətdə də digər üç keyfiyyəti birləşdirir – o, zərərlidir, eybəcərdir və ağrılıdır. Qismən isə o şeydir ki, bu keyfiyyətlərin yalnız bir hissəsini özündə toplayır, belə ki, bəzən hansısa bir şey, məsələn, artıq barmağın kəsilib atılması və ya artıq maldan yaxa qurtarmaq kimi şeylər eyni zamanda həm faydalı, həm də ağrılı ola bilər. Bəzən də eyni bir şey həm faydalı, həm də eybəcər ola bilər. Buna misal olaraq səfehliyi göstərmək olar. Belə ki, səfehlik həm də rahatlıqdır və buna görə də: «Ağılı olmayan adam rahatdır», - deyiblər, ona görə ki, nəyinsə nəticəsi haqqında fikir çəkmir və hal-hazırda asudəlikdədir. Nə isə bir şey həm faydalı və həm də eyni zamanda zərərli ola bilir, məsələn, gəmi batan zaman əmlakın dənizə atılması zamanı bu, əmlak üçün zərərli, insanların xilası üçünsə faydalıdır. Faydalı şeylər də iki növə bölünür, birincisi ruhi məziyyətlər və axirət həyatı ilə bağlı səadət kimi vacib, digəri isə sirkə vasitəsilə balın turşusunu artırmaqla

ödü sakitləşdirməkdən ötrü hazırlanan dərman kimi nə iləsə əvəz oluna bilən şeylərdir.

Dördüncü üsul – üç qüvvəyə və üç istəyə görə həzzin üç növə bölünməsi üsuludur. Həzzin məhz arzulanan şeyi əldə etməkdən, arzunun isə ruhun istədiyinə can atmağından ibarət olduğuna görə həzzi və məmnuniyyəti ruhi həzzə, bütün canlılarla ümumi olan cismani həzzə və yalnız bəzi canlılarla ümumi olan həzzə bölmək olar. Bilikdən və müdriklikdən alınan həzz kimi ruhi həzlər ən az rast gəlinəndir və bütün həzlərin ən ləyaqətlisidir. O, azdır, çünki müdrikliklə yalnız müdriklər həzz alır. Körpənin baldan, quş ətindən və ya dadlı şirniyyatdan həzz ala bilmək bacarığının olmaması o demək deyildir ki, bu yeməklər, ümumiyyətlə, ləzzətli deyildir. Onun ən çox xoşladığı şeyin süd olması da o demək deyildir ki, o – ən dadlı yeməkdir. İnsanların çoxu, çox az qismindən savayı, avamlıqla məhdudlanmışlar, onlar elmi dərəcələrə çatmaq qabiliyyətinə malik olmadıqlarından öz cahillikləri özlərinin xoşuna gəlir.

Ağzında acı, pis dad olan kəslər,
Təmiz bulaq suyunu da acı sezər.

Ruhi həzlərin məziyyəti ondan ibarətdir ki, onlar insanların bir hissəsinə çevrilərək heç zaman yox olmurlar, onlar həmişəlikdirlər və keçici deyillər, özü-özünə əbədidirlər. Axirət həyatındakı bəhərləri də sonsuzdur. Bu cür ali və əbədi şeyə malik ola bilən şəxs əgər aşağı səviyyəli və çürük şeylərlə kifayətlənirsə, deməli, onun dərrakəsi xəstədir, o, öz günahı ucbatından və öz geriləməsinin səbəbinə əziyyət çəkir. Bilik səni qoruyur, sənsə var-dövləti qoruyursan. Biliyini xərclədikcə artır, var-dövlət isə azalır. Bilik mütləq olaraq həmişə faydalıdır, zənginliksə bəzən nöqsanlara, bəzən də məziyyətlərə gətirib çıxarır. Buna görə də zənginlik Qurani-Kərimdə bəzi hallarda pislənir, bəzi hallarda isə nemət sayılır.

İkincisi – insanla bütün canlıların ümumi olan həzləridir ki, bunlar da yeməkdən, içməkdən, fiziki yaxınlıqdan olan həzlərdir, bu növ həzlər sayca daha çoxdur.

Üçüncü növ həzlərdə isə insan bəzi ayrıca götürülmüş heyvanlara bənzəyir. Buna misal olaraq, hakimiyyətə və zəfərlərə maliklikdən alınan həzlərdir ki, onlar da əsasən ağıllı insanlarla

möhkəm bağlıdır. Fiziki yaxınlıq və yemək həzzi mütləq tam ola bilməz, çünki bunlar bir tərəfdən ağrıdan qurtulmaqdır. Buna görə də əl-Həsən demişdir: «Aclıq insana qalib gəlir, toxluqsa öldürür».

Dünyəvi həyatda həzlərin sayı ümumən yeddidir. Bunlar yemək, içmək, qadın, geyim, ev, qoxu və mənzərədir. Bunlar hamısı heç bir əhəmiyyəti olmayan şeylərdir. Əli (124) haqqındakı rəvayətlərdə belə deyilir ki, bir dəfə o, Ömər ibn-Yasirin qəmli şəkildə ah çəkdiyini gördükdə belə demişdir: «Ömər! Sən əgər axirət həyatın üçün ah çəkirsənsə onda sən uddun, yox əgər bu fani həyatından ötrü ah çəkirsənsə onda sən uduzdun. Çünki mən başa düşmüşəm ki, burada yalnız yeddi cür zövq var və bunlar yemək, içmək, qadın, geyim, xoşagələn qoxu və gözəl mənzərədir. Yeməklərin ən yaxşısı baldır ki, onu da həşərat verir. İçkilərin ən yaxşısı sudur ki, olanda hamı ona biganədir, ən çox ona yoxluğunda möhtac oluruq. Qadın bədbəxtlikdə bədbəxtlikdir. Mən yalnız onu deyim ki, qadın özündə olanların ən yaxşısına zinət verir, onda olanların ən eybəcərini isə arzulayırlar. Ən yaxşı ipək geyimdir, onu da qurdlar hazırlayır. Ən yaxşı qoxu muksusda – siçan qanındadır. Qulaq üçün ən yaxşı səs yaxınlaşan küləyin səmada səsidir. Bizim gördüyümüz ən yaxşı surətlər isə tezliklə yox olacaqdır». O, belə demişdir.

Onların bədbəxtliyi həm də ondadır ki, insan bir anlığa onlardan həzz aldıqdan sonra həmin şeylər ona ağırlıq verir. Onun fiziki yaxınlıqdan sonrakı ilə buna qədərki halı və ya toxluqla ona qədərki vəziyyəti müqayisə etmək kifayət edər. İnsan düşünməlidir ki, arzu olunan şey bir andaca elə bir şeyə çevrilir ki, ondan uzaqlaşmaq istəyirlər. Bütün bunları sonsuz davam edən və qurtarmayan sevinclə və əbədi rifahla necə müqayisə etmək olar. Bu sevinc ruhi kamillikdən doğan, əsasən də biliyin və idrakın köməyi ilə hər şey üzərində hakimlikdən yaranan sevincdir.

## İŞTAHANIN VƏ CİNSİ ƏLAQƏNİN TƏRİFLƏNƏN VƏ PİSLƏNƏN TƏZAHÜRLƏRİ HAQQINDA

Mədənin istəyi (iştaha) yeməyə çağırır. Qida isə iki cür olur – vacib qida və onsuz da keçinmək mümkün olan qida. Orqanizmin gücünü saxlamaq üçün lazım olan qida vacib qidadır, bu insanın yediyi yemək və içdiyi sudur. Bu qida tərifəlayiq, yaxşı olmayan,

pislənən və qadağan olunan qidalar kimi dörd yerə bölünür. Hər hansı bir qidanı qəbul etmədən əgər işləmək və bilik qazanmaq mümkün deyilsə və insan da yalnız həmin qida ilə kifayətlənirsə, onda bu qida tərifəlayiq qidadır. Əgər həmin şəxs bundan az yeyərsə, onun gücü tükənər və orqanizmi xəstəliyə mübtəla olar. Qidanın bu miqdarı – əgər insan onu öz arzusu ilə qəbul edirsə – məzurdur və hətta buna görə ona təşəkkür və mükafat düşür, çünki bədən Allah-Təalaya (121) qədər məsafəni ruhun qət etməsi üçün ona lazım olan gəmidir. Cihadın ibadət olması kimi, atlını öz belində apara bilməsi üçün döyüş atının öz gücünü bərpa etməsi də bu cür ibadətdir. Buna görə də Peyğəmbərimiz (122) buyurub: «Mömin insanlar yemək yeyəndə nemətlər daha da çoxalır». Yalnız bu, o zaman olur ki, həmin insanlar yeməyi məcburən qəbul edirlər və əgər imkanları olsaydı, ümumiyyətlə, yeməkdən imtina edərdilər. Qidanın mədəyə getməsi və onun çıxması – bir-birinə yaxındır, buna görə də deyirlər: «Yalnız öz qarnını nə ilə dolduracağını düşünən şəxsin dəyəri oradan çıxan şey qədərdir». Ağac və bitki tullantılarını yeyən şəxs qoy bilsin ki, bunları yeməklə o, insan nəcisini və onun tullantılarını yeyən donuza və ya heyvan tullantılarını yeyən böcəyə bənzəyir. Əgər ağacların dili olsaydı, belələrinə müraciət edərək onları heyvan tullantısı yeyənlərlə müqayisə edərdi.

İcazə verilən qidadan artıq israf və əlavə yemək yaxşı olmayan yeməkdir, yəni bu zaman insan bəs olandan artıq qida qəbul edir. Peyğəmbərimiz (122) buyurur: «Allah-Təalanın insanda ən çox xoşlamadığı üzv icazə verilən yeməklə (halal) doldurulmuş qarındır». Bu, bütün xəstəliklərin ilkin səbəbi olduğundan tibbi nöqteyi-nəzərdən də zərərlidir. O (122) buyurub: «Qarınquluduq bütün xəstəliklərin başlanğıcı, pəhrizsə şəfanın əsasıdır və öz bədəninizi onun adət etdiyi şeylərə öyrədin». Ən yaxşı həkimlər bu fikirdədirlər ki, Peyğəmbər (122) bu üç kəlmə ilə bütün tibbi əhatə etmişdir.

Bu cür qidanı biz qadağan olunmuş deyil, yaxşı olmayan qida adlandırsaq da, səadətə can atan şəxs bu fərqə biganə qalmamalıdır, çünki yaxşı olmayan bir şey çox asanlıqla qadağan olunmuş şeyə, hətta qadağan olunmuşun çox növlərinə çevrilə bilir. Çünki istək gücü pislik yaradır, qida isə arzunu gücləndirir, yəni dolmuş mədə istəyi artırır, istək gücü ehtirasa aparır, ehtirasa şeytanın böyük miqdardakı qoşunudur və əgər o, insanın üzərində qələbə

çalarsa, onda insanı Allahdan (121) döndərir və Onun (121) qapısından uzaqlaşdırır. Bu nəticə, ümumiyyətlə, qidanın toxunduğu məsələlərə aiddir. Qoy hər bir kəs səadət yolunda hərəkət etmək arzusundan əvvəl qidasının – onun miqdarının və onun icazəli olub-olmamasının qayğısına qalsın, zira mədə – güc mənbəyidir. O, bütün xeyrin və şərin sanki qapısı və bu qapının açarıdır. İslamda oruca ona görə bu qədər diqqət verilir ki, orucun əsas məqsədi Allah-Təalanın düşmənlərinə qalib gəlməkdir və buna görə də: «Doğrudan da, oruc Mənə aiddir və Mən də ona görə mükafatlandırıram», - kəlamı və bu barədə digər bir çox kəlamlar buyurulmuşdur.

Cinsi əlaqəyə gəldikdə isə, bu təzahür üç yerə bölünür ki, bunlar da təriflənən, pislənən və qadağan olunan əlaqələrdir. Növün saxlanması üçün zəruri olan cinsi əlaqə təriflənəndir, çünki insanın ölümünə qədər yaşaması üçün ona qida lazım olduğu kimi, nikah da insanın bir növ kimi davam etməsi üçün lazımdır. Qidanın qəbul edilməsi vasitəsilə insan həyatının davam etməsi üçün aclıq hissi yaradıldığı kimi, cinsi əlaqə vasitəsilə insan nəslinin davam etməsi üçün cinsi həvəs yaradılmışdır. Peyğəmbərimiz (122) buna görə buyurub: «Evlənin, nəsil hazırlayın və artın, ona görə ki, siz mənim digər icmalar qarşısında iftixarımsınız». Nikaha daxil olan şəxs öz qarşısına iki məqsəd qoymalıdır: birincisi nəsildir ki, Peyğəmbərimiz (122) onunla iftixar duysun və həmin şəxs üçün dua oxuyan mömin bir oğul qalsın; ikincisi artıq toxum mayesindən qurtulmaqdır ki, bu maye çox miqdarda olduqda yumurtanın sarısına oxşamağa başlayır. Qan da artıq miqdarda olduqda orqanizmə zərər verir, onda xəstəlik yaradan səbəbə çevrilir və o cümlədən insanın qəlbində də əxlaq pozğunluğuna gətirib çıxarır. Bu nöqteyi-nəzərdən nikah tərifəlayiqdir və Peyğəmbərimizin (122) timsalında onun hərəkətlərini bəyənmək və təkrar etməkdir. Peyğəmbər (122): «Kim mənim əxlaqımı bəyənirsə, məndən nümunə götürsün», - deyə buyurmuşdur. Bundan başqa, nikaha girən şəxs öz imanının yarısını saxlamış olur. Əgər nikahda kiminsə üçüncü məqsədi də varsa, onda bu da bədbəxtlik deyil. Həmin şəxs istəyir ki, onun evində təsərrüfatla məşğul olan bir kimsə olsun ki, o da sakitcə bilik əldə etməklə və ibadətlə məşğul ola bilsin. Bununla da nikah ibadətin bir növünə çevrilir, zira, doğrudan da, «niyyətlərə görə əməldir».

Bunun əlamətləri odur ki, qadında o yalnız qorunmaq üçün –

cazibədarlıq, təsərrüfat işlərini aparmaq üçün – əxlaq, əxlaqi təmizlik və yalnız dini yaxınlıq üçün – iman axtarır, çünki bu, imanın və əxlaqın göstəricisidir və doğrudan da, əsil, mənşə özünü mütləq göstərəcəkdir, buna görə də Məhəmməd peyğəmbər (122) deyib: «Sən yalnız dindar qadınla evlənməlisən, peyin böcəyindən[35] isə qorun» və bir də deyib: «Öz toxumunuza görə seçin, sağlam bədən axtarmaq lazımdır və nəsil xatirinə sonsuz olmamalıdır, çünki bu, məqsədin özüdür». Buna görə də (hər iki tərəfi) tarazlaşdırmaq məqsədi ilə arxadan cinsi əlaqəyə girmək pislənir, çünki mayalanmaya laqeydlikdir, axı «sizin qadınlarınız – sizin tarlanızdır». Sevginin güclü olması üçün bakirə qız axtarmaqda heç bir pis şey yoxdur, zira islam da ona çağırır. Pislənən isə həzzə və öz arzularını razı salmağa can atmaqdır ki, bunlar da insanı cəlb edir və o, hər zaman bunu axtararaq icazə verilən həddi keçə bilər. Şəriət nöqteyi-nəzərindən bu şey zərərlidir və səbəbi heç də fəaliyyətin özündə deyildir, çünki buna icazə verilir, səbəb ondadır ki, bu, insanı Allah-Təaladan (121) uzaqlaşdırır və yalnız öz arzularının ardınca gedərək eşşəklərə və öküzlərə oxşamağa başlayır. Bu cür istəyin ağır yeməklər və digər vasitələrlə coşdurulması ona bənzəyir ki, insan əvvəlcə vəhşi heyvanları qəsdən qızışdırır, sonra isə onlardan qurtulmağa can atır.

Qadağan olunan iki cür olur: birincisi – insan öz arzusunu mayalanma baş verə bilən yerdə, lakin qanunsuz nikahda və icazə verilməyən qaydada razı salır ki, bu da zinakarlıqdır. Allah-Təala (121) bunu çoxallahlılıqla (şirk) müqayisə edərək buyurur: «Zinakar kişi ancaq zinakar, yaxud müşrik bir qadınla evlənə bilər» (24:3). İkincisi – əgər insan öz arzusunu mayalanma mümkün olmayan yerdə razı salırsa, onda bu, zinakarlıqdan da pisdir, çünki zinakar qadağan olunan qaydada olmasına baxmayaraq, öz toxumunu mayalanma mümkün ola bilən yerə tökür və buna görə də toxum mayesini itirmir, bu isə itirir və beləsi elə şəxslərdəndir ki, Allah-Təala (121) onlar haqqında belə buyurur: «...əkini və nəsli məhv etməyə çalışar» (2:205). Buna görə də kişibazlıq Onun bu ifadəsində israfçılıq adlanır: «Siz qadınları atıb, kişilərin üstünə gəlirsiniz. Siz, doğrudan da, həddi aşmış bir tayfasınız!» (7:81).

Bunlar cinsi həvəs məsələsində insanların vəziyyətləridir. Lakin yanılmalar bəzilərini məhəbbətə gətirib çıxara bilər ki, bu da əsl səfehlik və cinsi həvəsin insanda nəyə görə yaradıldığını tam olaraq bilməməkdir. Bununla insan iradə və özünü məhdud-

laşdırma cəhətdən heyvanlardan da aşağı enir, ona görə ki, özünü aşiq sayan kəs təkcə, bütün arzuların içərisində ən eybəcəri və əslində utanmağa layiq olan istək kimi cinsi həvəs hiss etmir, o həm də tam inanır ki, bu arzusunu yalnız bir yerdə razı sala bilər. Əgər heyvanlar bunu harada, necə gəldi edirlərsə və bununla kifayətlənirlərsə, aşiqə yalnız öz məşuqu lazımdır – getdikcə onun qarşısında daha çox alçalır və sonda onun quluna çevrilir. O, öz idrakını arzularına xidmət etməyə məcbur edir. İdraksa yalnız ona görə yaradılmışdır ki, əmr etsin və ona xidmət göstərsinlər, arzulara xidmət etməkdən və onun xətrinə aldatmaqdan ötrü yaradılmamışdır. Bu dəyərsiz və bikar adamın mübtəla olduğu xəstəlikdir. Bunun üçünsə lap əvvəlcədən ehtiyatlı olmaq – düşüncələrlə, nöqteyinəzərlərlə mübarizə aparmaq lazımdır, çünki əgər istək insana qalib gələrsə, ondan yaxa qurtarmaq çox çətin olacaqdır. Bu, hakimiyyətə, zənginliyə, əmlaka, uşaqlara, hətta quşlarla oyuna, nərd və şahmat oyunlarına olan məhəbbətə də aiddir – bunların hamısı insanları əhatə edir və onlar bu şeylərsiz yaşaya bilmirlər. Arzularla lap başlanğıcda mübarizə aparmağı eşşəyin başına noxta salıb, girmək istədiyi evə buraxmamağa bənzəyir. Noxtadan yapışıb dartmaqla ona bunu qadağan etmək necə də asandır. Lakin arzular formalaşdıqdan sonra onlardan qurtulmağı isə eşşəyə evə girməyə imkan verib, sonra onun quyruğundan tutub çölə dartmağa bənzəyir. Bu iki vəziyyət arasındakı fərq nə qədər böyükdür. Buna görə də ən yaxşısı ehtiyat tədbirlərini lap əvvəldə görməkdir. Sonda isə vəziyyəti düzəltmək (axirət dünyasına düşdükdə mələklər tərəfindən) ruhu dartıb qoparmaq qədər böyük qüvvə tələb edir.

Qəzəbin təzahürü isə üç cür olur: tərifəlayiq, pis və qadağan olunan qəzəb. Tərifəlayiq qəzəb iki cürdür. Birincisi qısqanclıq deyilən qəzəb hissidir ki, bu zaman kişi öz qadınına lazım olmayan digər kişilərlə ünsiyyətdə olmaqda mane olur. Əgər o, buna görə qəzəblənirsə bu, tərifəlayiqdir, lakin bu cür ünsiyyət onu az narahat edirsə, deməli, o, kişi deyil və ruhən zəif adamdır. Peyğəmbərimiz (122) buna görə buyurub: «Doğrudan da, Bağ qısqancdır, lakin Allah ondan da çox qısqancdır». Allah (121) kişilərdə qısqanclığı qohumluq əlaqələrini qorumaq üçün yaratmışdır, ona görə ki, əgər kişilər qadınların bir neçə kişiyə malik olmasına yüngül yanaşsaydılar, onda qohumluq əlaqələrində qarışıqlıq yaranardı. Buna görə də belə deyibrər: «Kişilərin qısqanc olduqları icmada qadınlar etibarlı müdafiə olunurlar». İkinci növ tərifəlayiq qəzəb öz

dinini pis şeylərdən və günahlardan qorumaq və buna görə onlardan qisas almaq məqsədində olduqdadır. Buna görə də Peyğəmbərin (122) silahdaşları mədh olunur ki, onlar «Onunla birlikdə olanlar (möminlər) kafirlərə qarşı sərt, bir-birinə (öz aralarında) isə mərhəmətlidirlər» (48:29). Buna görə də Məhəmməd (122) buyurub: «Mənim icmamda olanların ən yaxşıları tez qəzəblənənlərdir». Burada dindən ötrü qəzəblənmək nəzərdə tutulur, buna görə də Allah-Təala (121) buyurub: « Allaha və axirət gününə inanırsınızsa, Allahın dini barəsində (bu işin icrasında) ürəyiniz onlara yumşalmasın və möminlərdən bir dəstə də onların əzabına şahid olsun» (24:2). Lakin buna baxmayaraq, əgər padşah cinayətkara qəzəblənərsə, özü cəzalandırmamalı, onu dustaq etməlidir və əvvəlcə hər şeyi müfəssəl öyrənməlidir, çünki qəzəb – ağılın şeytanıdır və buna görə də padşah cəza verməkdə təyin olunmuş həddi keçə bilər.

Pis qəzəb odur ki, insan bu zaman özünün rüsxət verilmiş nəyini isə itirdikdə qəzəblənir, məsələn, o, sınan qaba görə və ya səhlənkarlığı ucbatından hər hansı tapşırıqda gecikdiyinə görə öz quluna qeyzlənir ki, əslində buna yol verməmək olar. Buna görə də bir müdrik insana: «Sənin qulun nəyisə düzgün etmədikdə onu bağışlama, çünki o, sənin səbrindən korlana bilər», - deyə müraciət edənə, o cavab verir: «Mənim qulumun əxlaqına görə mənim məhv olmağımdansa, qoy mənim qulum mənim səbrimin ucbatından korlansın, zira səbir – özünü islah etməkdir, cəza isə – qulu».

Qadağan olunan qəzəbsə təkəbbürdən, lovğalıqdan, paxıllıqdan və bu həyatın ləzzətlərilə bağlı əhəmiyyətsiz şeylərdən yaranan qəzəbdir. Bu cür hiss nəinki dinə və gələcək üçün bu dünyaya fayda gətirir, - insanların çoxunda belə hisslər olur – bu xarakter helmə[36] və təhəllümə tam əksdir. Helm – insanın özündə yarana bilən qəzəbin qarşısını almaqdır, təhəllüm isə – bu, qəzəb artıq özünü büruzə verdikdən sonra ona öz məqsədinə nail olmağa imkan verməməkdir. Helm bunların ən gözəlidir, təhəllüm – qadağan olunanı etməmək – də çox yaxşıdır. Bunlar qəzəbin təzahür dərəcələridir. İnsanlar onlarda qəzəbin təzahür etmələrinə görə fərqlənirlər, onlardan bəziləri tez alışır və tez də soyuyurlar, bəziləri gec alışır və gec soyuyurlar, bəziləri isə gec alışır və tez soyuyurlar, əgər qəzəbin və qısqanclığın tam olmamasına gətirib çıxarmasa, bu sonuncusu onların ən yaxşısıdır. Temperament cəhət-

dən qəzəbin təzahür etməsi isti və soyuqluqdur. Qəzəbin təyini bunu göstərir, qəzəb o deməkdir ki, ürəkdə qan qaynayır. Əgər bu, qüdrətli adamlara görə baş verirsə, onda qəzəb ona gətirib çıxarır ki, qan dərinin səthindən çəkilərək ürəyə yığılır, həmin şəxs kədərli olur və dərisi saralır. Əgər qəzəb aşağı mövqeli insanlara görə baş verirsə, onda ürək qaynayır və dayanmaq bilmir, belə şəxs ciddi surətdə qəzəblənir və qisas almaq arzusunda olur. Əgər bu, onunla bərabər mövqedə olan birinə görədirsə, onda onun qanı gah dayanacaq, gah da yenidən qaynayacaq və sifətin rəngi də buna uyğun olaraq gah qırmızı, gah da sarı rəng alacaq və onun bu vəziyyəti normal olmayacaqdır. Ümumiyyətlə isə, qəzəbin məkanı ürəkdir, qanın hərəkətini və onun qaynamasını da ürək ifadə edir. Bundan başqa, bu həm də adətdir və hər hansı bir şəxs əgər qəzəbin və sərt əxlaqın tərifləndiyi icma daxilində yaşayırsa, bu, onda mütləq iz saxlayacaqdır. Lakin kimsə sakit və məziyyətli insanlarla ünsiyyətdə olursa, həmçinin bu da onda özünü göstərəcəkdir. Qəzəbi mümkün olan vəziyyətdən mövcud olan hala gətirən səbəblər – təhqir, sıxıntı, rəqabətə can atmaq, paxıllıq və qisas almaq arzusu – pislənəndir. Qəzəbin təsiri altına düşən adam bir müdrikin padşahın ona ünvanlanan: «Qəzəblə necə mübarizə aparmaq olar?» - sualına verdiyi cavab ətrafında düşünməlidir. Müdrik belə cavab verib: «Sənə bunu bilmək lazımdır ki, məhz sənə deyil, sən başqalarına itaət etməlisən, sənə deyil, sən başqalarına xidmət göstərməlisən, sənə deyil, sən özün başqalarına dözməlisən və sənə bunu bilmək lazımdır ki, Allah (121) həmişə səni görür. Əgər sən bunu etsən, heç bir vaxt qəzəblənməyəcəksən».

Bil ki, qəzəbin artıq söylədiyimiz kimi, bir çox növləri mövcuddur ki, bunların da arasında igidlik, ehtiyatsızlıq, rəqabət, ağ və qara qəzəblər vardır, lakin biz bunların hər biri haqqında müfəssəl danışmaq istəyirik. İgidlik – ehtiyatsızlıq və qorxaqlıq arasında olan bir keyfiyyətdir. Ruha münasibətdə o, ağır vəziyyətlərdə insanın yenilməzliyi və təhlükəli anlarda soyuqqanlılığıdır. Əgər fəaliyyət cəhətdən baxsaq, onda igidlik mümkün olan anda hücum etməkdir. O, öz başlanğıcını çətinlikləri adlamaqda və günahlara qarşı dura bilməkdə insana kömək edən nikbinlik və qəzəbdən götürür, ona görə ki, əgər qəzəbi istəyə qarşı yönəltsək, onda onun həyata keçməsinə imkan verməyəcəkdir. Xeyirxah əməllər həyata keçirməyə səy göstərmək imanın bir hissəsi, şərdən qurtulmaq isə

digər bir hissəsi olduğu üçün Peyğəmbərimiz (122) buyurub: «Səbir – imanın yarısıdır». Bəzi şər işlər cinsi əlaqə ilə münasibətdə, bəziləri isə iştahla münasibətdə mövcud olduğundan Məhəmməd (122) deyib: «Oruc – səbrin yarısıdır». Səbir iki cür olur. Bunlardan birincisi fiziki dözümdür. Bu, insan özü ağır əmək tələb edən iş icra edəndə, ya da bərk döyüləndə və ağır xəstəlik keçirəndə hiss etdiyi xarici təsirlərə dözmək bacarığıdır. Lakin ən gözəli ikinci növ olan ruhi səbirdir. Bu əgər arzu olunana yetmək məsələsindədirsə, onda bu cür səbir – ləyaqətdir. Əgər bu, ağırlıqlara qatlaşmaqdadırsa, onda bunun adı həmin ağırlıqların növünə görə müxtəlif olur. Əgər bu, çətinliklərə tab gətirməkdədirsə, onda bu, dözüm adlanır. Onun əksi – dözümsüzlük və həyəcandır. Əgər bu, var-dövlətə qarşı səbirdirsə, onda iradə adlanır, bunun əksi naşükürlüdür. Əgər döyüşlərdədirsə, onda bu – cəsurluqdur, onun əksi qorxaqlıqdır. Əgər bu, qəzəbi yatırmaqla bağlıdırsa, onda – mülayimlikdir, onun əksi – narazılıqdır, əgər bu hər hansı bir qıcıqlandırıcı şeylə bağlıdırsa, onda – alicənablıqdır, onun əksi isə – narazılıq, pərtlik və ağır xarakterlilikdir. Əgər bu, sözü qorumaqla bağlıdırsa, onda – sirr saxlamaq bacarığıdır. Əgər bu, dünyəvi həzlərlə bağlıdırsa, onda – zahidlik və aza qane olmaqdır, bunun əksi – tamahkarlıq və xəsislikdir. Buna görə də Allah-Təala (121) buyurub: «səbirlilər bədbəxtlikdədirlər», daha doğrusu, çətinlikdədirlər, «bəladadırlar», yəni yoxsulluqdadırlar, «müsibət anındadırlar». «(İmanlarında, sözlərində və əməllərində) doğru olanlar onlardır. Müttəqi olanlar da onlardır» (2:177).

Ağ və qara paxıllıq, rəqabət də qəzəbin növlərindən sayılır, lakin ağ paxıllıq təriflənən, qara paxıllıq isə pislənəndir. Peyğəmbərimiz (122) buyurub: «Dindar adam ağ paxıllıqla həsəd aparır, riyakar isə qara». Rəqabətin özü də təriflidir və Allah-Təala (121) buyurub: «Qoy yarışanlar onun üçün (belə bir nemətə nail olmaq uğrunda) yarışsınlar!» (83:26). Ağ paxıllıq odur ki, insan onun özü kimilərinin nail olduğuna nail olmaq istəyir və bu zaman həmin şəxslərin buna nail olduğuna görə kədərlənmir. Əgər bu hissə həm də həmin şeyə və ya ondan daha artığına nail olmaq üçün səy göstərmək arzusunda çalışmalar və inad da əlavə olunarsa, bu artıq yarışdır. Qara paxıllıq isə odur ki, bu zaman insan hər hansı nemətə layiq olub ona sahib olan şəxsin həmin nemətdən məhrum olmasını arzulayır. Ola bilər ki, onun bu hissinə bu neməti qəsdən məhv etmək arzusu da əlavə olunsun. Ən alçaq paxıl insan odur ki,

başqasının əlində olan nemətdən onu məhrum etməyə çalışsın, lakin özü həmin nemətə çatmaq üçün səy göstərməsin. Bu cür paxıllıq xəsisliyin zirvəsidir, çünki xəsisin öz əmlakına heyfi gəlir, paxıl isə başqalarına verilən Allah (121) nemətlərinə həsəd aparır. Belə deyirlər ki, paxıllıq və tamahkarlıq günahların təməlidir və buna da Adəmi (123) və iblisi misal gətirirlər, zira iblis Adəmə (123) paxıllıq etdi və lənətləndi, Adəm (123) isə ona qadağan olunanı arzuladı və Cənnətdən qovuldu. Bu iki ağac dərd, bədbəxtlik və itki barı gətirir. Bunların kökünü kəsən şəxs xilas olur. Ümumiyyətlə isə, paxıllıq əsil axmaqlıqdır: əgər kimsə Mərakeş əhalisinə verilən nemətlər üçün dərd çəkmirsə və bu zaman onun özü də həmin nemətləri ala bilmirsə, onda nəyə görə öz həmqəbilələrinə, dostlarına və qonşularına, öz həmyerlilərinə verilən nemətlərə görə dərd çəkməlidir. Ola bilər ki, o, bu neməti bəxti gətirərək qazansın. «İki vəziyyətdən başqa heç bir halda paxıllıq olmamalıdır: Allah (121) tərəfindən zənginlik əta olunan insan bu neməti düzgün yola xərclədikdə və Allah (121) tərəfindən müdriklik bəxş olunan insan bunun köməyi ilə idarə etdikdə» – ifadəsi ilə Peyğəmbərimiz (122) ağ paxıllığı nəzərdə tutur, zira bəzən «paxıllıq» sözü ilə məhz bu nəzərdə tutulur.

Bu, həmin keyfiyyətlərlə idarə etmək məsələsi haqqındadır. Əgər: «Kimsə bu qüvvələrin təzahürü ilə elə bacara bilər ki, onda bu təzahürləri idarə etməyə imkan yaradan dayanıqlı xarakter cizgiləri zahir olar – bu şəxs məziyyətli ola bilərmi?» - deyə soruşsan, bil ki, əgər əllərin, dilin, eşitmənin və görmənin məziyyətləri əlavə olunmazsa, onda məziyyət təkcə bununla başa çatmaz. Dilin məziyyətləri – istehzalara, söyüşlərə, qeybətə, yalana, iftiraya və bir-birinə ləqəblə müraciət etməyə son qoyulmasıdır, eşitmənin məziyyətləri – dilin söyüş və bu kimi digər pisliklərindən, qadağan olunmuş səsləri eşitməkdən kənarlaşmaqdır. Bədənin digər bütün hissələri və qüvvələri ilə də münasibətdə məsələ bu cürdür. Bədənin bütün hissələri ilə münasibətdə məziyyətlərin əsası odur ki, bunlardan şəriətin və idrakın izn vermədiyi şeylərdə istifadə etməsin, yalnız izn verilənləri yol verilən qaydada etsin. Onun irəliləməsi və geriləməsi əgər məziyyətlərə çatmaq, Allaha (121) yaxınlaşmaq və Onun razı qalmasına nail olmaq məqsədi daşıyırsa, onda gələcəkdə də bunlarla kifayətlənməməlidir. Əgər o, öz məziyyətlərinə görə daha böyük bir şey əldə etmək arzusundadırsa onda bu, məziyyət deyil, ticarət və ya nəyisə özü kimi bir şeyin

xatirinə saxlamaqdır. Belə şeylər məziyyətlərə çatmaq üçün kifayət deyildir – qoy bunu hamı bilsin.

İndi isə biliklərin əldə olunmasının, təlimin və ağılın qüvvəsi ilə idarəetmənin nə olduğu barədə söhbət açaq.

## İDRAKIN, BİLİYİN VƏ TƏLİMİN MƏZİYYƏTLƏRİ HAQQINDA

Yuxarıda deyilənlərdən sən öyrəndin ki, bilik və əməl – səadətə çatmaq üsuludur və əməli bu əməlin necə olmalı olduğu barədə olan biliklərsiz təsəvvür etmək mümkün deyil və Allah (121), Onun sifətləri, mələklər haqqında olan qeyri-praktiki bilik məqsədin özüdür. Sən bunu da bildin ki, bilik – təməllərin təməlidir və indi biz biliyin və təlimin qazanılması yollarını sənə aydınlaşdırmalıyıq. Əvvəlcə biz bu şeylərin məziyyətlərini nişan verməli, onu göstərməliyik və biz deyirik: təlim – bütün əməllərin ən nəcibidir. Peşə üç yerə bölünür. Birincisi əsas peşələrdir ki, bunlarsız həyatın mövcud olması mümkün olmazdı və bunlar da dörd cür olub, əkinçilikdən, toxuculuqdan, tikintidən və dövlətin idarəedilməsindən ibarətdir. İkincisi hər bir əsas peşə üçün hazırlıq və onlara xidmət edən peşələrdir, məsələn, dəmirçilik işi əkinçilik üçün və ya pambığın təmizlənməsi və əyirmə peşələri toxuculuq üçün mövcuddur. Üçüncüsü isə bunların hər birini başa çatdıran və onu zinətləndirən, məsələn, un istehsalı və çörəkbişirmə peşələri əkinçilik üçün, parçanın rənglənməsi və tikmə peşələri toxuculuq üçün bu rolu oynayır. Bunlar sanki aşağıdakı üç növ: əsas – ürək, qaraciyər və beyin; əsas üçün hazırlıq və ona xidmət edən – mədə, damar və venalar; bunları tamamlayanlar – kirpik və qaşlar kimidir. Bütün peşələrin arasında ən nəcibi idarəetmə ilə bağlı olanlardır, çünki dünya bunlarsız mövcud ola bilməz. Bunlar da dörd yerə bölünür. Birincisi peyğəmbər idarəçiliyi və onların seçilmişlərin və adi insanların həm daxili, həm də zahiri dünyasını idarə etməsidir. İkincisi xəlifələrin, canişinlərin, sultanların və hökmdarların idarəçiliyi və onların seçilmişlərin və adi insanların daxili dünyasını deyil, yalnız zahiri dünyasını idarə etməsidir. Üçüncüsü alimlərin, müdriklərin idarəçiliyi və onların seçilmişlərin daxili dünyasını idarə etməsidir. Dördüncüsü vaizlərin və fakihlərin idarəçiliyi və onların adi insanların daxili dünyası üzərindəki hakimiyyətidir.

Bu dörd növ idarəçilik formasının peyğəmbərlikdən sonra ən nəcibi insanları biliklə zənginləşdirmək və onların tərbiyəsi ilə məşğul olmaqdır. Buna sübut isə bu və ya digər işin əhəmiyyətinin bu işi görən qüvvə tərəfindən təyin olunmasıdır. Bu, müdrikliyin dil haqqındakı biliyə nəzərən üstünlüyü kimidir, zira bunlardan birincisi – ən nəcib qüvvə olan idrakın qüvvəsinə bağlıdır. İkincisi isə hissiyyat qüvvəsinə, eşitməyə bağlıdır. İşin əhəmiyyəti bir də bu işdən faydalanan insanların sayı ilə təyin olunur. Bu isə əkinçiliyin zərgərlik işinə nəzərən üstünlüyü kimidir. Təyin olunma həm də zərgərlik işinin dəri aşılama peşəsinə nəzərən üstünlüyü kimi, emal olunan materialın nəcibliyinə görə ola bilir.

Məlumdur ki, idrak haqqındakı biliyə qüvvələrin ən nəcibi olan idrakla çatmaq olur və bu da Cənnətə aparıb çıxarır. O – böyük miqdarda insanlar arasında intişar tapan ən böyük faydadır və onun üzərində işlədiyi – insanların ruhu – ən yaxşı materialdır, yer üzərində mövcud olanların ən yaxşısıdır. Biliyin faydası odur ki, o, bir tərəfdən peşədir və digər tərəfdən də Allah-Təalaya (121) sitayiş etməkdir. Üçüncü tərəfi isə Allaha (121) canişinlik etməkdir ki, bu da onun xüsusi bir əlamətidir və o ən qiymətli bir xəzinənin keşikçisi kimidir. Bundan başqa, onu hər bir ehtiyacı olana vermək iznlidir və insanların Allaha (121) yaxınlaşdığı və Cənnətə doğru hərəkəti zamanı qulun Allahla (121) bu insanlar arasında vasitəçi olmasından gözəl nə ola bilər?

Biliyin və idrakın məziyyətləri idrakın, şəriətin və duyğuların nəticələri ilə əldə edilir. Şəriətə gəldikdə isə, Peyğəmbərimiz (122) buyurub: «Allah idrakı yaratdıqdan dərhal sonra, O, ona buyurdu: "Yaxınlaş" və o yaxınlaşdı, sonra O, ona buyurdu: "Uzaqlaş" və o uzaqlaşdı, sonra O dedi: "Qüdrətimə və Böyüklüyümə and olsun, sən mənim üçün yaratdıqlarımın hamısından daha qiymətlisən, səninlə Mən alıram, səninlə Mən verirəm və səninlə Mən cəzalandırıram"». Köməyi ilə insanın şeyləri dərk edə bildiyi bu idrak Allahın (121) – günəş üçün işığı əmələ gətirdiyi kimi – yaratdığı İlkin İdrakdan gəlir, bu idraklar – insanlara aid olan idraklardır, o isə – mütləq, heç bir şeyə aidliyi olmayan İdrakdır. İdrakın məziyyəti barəsində idrakın sübutu odur ki, onsuz nə bu dünyada, nə də axirətdə səadətə çatmaq mümkündür və o necə hər bir şeydən nəcib olmasın ki, axı yalnız ona görə insan Allahın (121) canişini vəzifəsindədir, onun köməyi ilə insan Allaha (121) yaxınlaşır və onun vasitəsilə imanı tamamlanır. Buna görə də

Peyğəmbər (122) buyurub: «İdrakı olmayanın imanı olmaz». Bir də deyib: «İnsanın ağlını öyrənməmiş onun islama gəlməyinə sevinməyin». Buna görə də deyirlər: «Kimin ağlı onun bəhərinin ən əsas meyvəsi deyilsə, onda özünün bəhərinin ən əsas meyvəsi ilə də məhv olacaq». İdrakın yüksək mövqeyini bu da göstərir ki, Allah (121) bu sözlərində onu nurla müqayisə etmişdir: «Allah göylərin və yerin nurudur» (24:35), daha doğrusu, onları nurlandırandır. Nur və qaranlıq kəlmələri Quranda ən çox biliyi və cahilliyi ifadə edir, məsələn, Allah (121) buyurub: «Allah ona inananların dostudur, onları zülmətdən çıxarıb işığa tərəf yönəldər» (2:257) və bütün bunlar idrakın vasitəsilə olur, buna görə də Peyğəmbər (122) Əliyə (124) müraciətlə deyir: «Əgər insanlar Yaradana öz möminlikləri ilə yaxınlaşsalar, sən Ona öz idrakın vasitəsilə yaxınlaş – belədə sən öz mövqeyinlə və yüksək məziyyətinlə bu dünyada insanların arasında və axirətdə Allah yanında zövq alacaqsan». İdrakın köməyi ilə (Ona) necə yaxınlaşmaq haqqında danışacağıq. İdrakın və biliyin yüksək mövqeyini anlamaq üçün duyğular özözlüyündə kifayət edər, belə ki, ölçüsünə görə ən böyük və bədəncə ən güclü heyvan insanı gördükdə özündə ona qarşı hörmət hiss edir və xarakterinə görə onun özündən çox yüksəkdə durduğunu anlayaraq ondan qorxur. İnsanların arasında heyvanlara ən yaxın olanı – ərəblərin və türklərin arasında olan ədəbsizlərdir. Çobanlar da bu sıradadırlar. Əgər onların arasından özlərinə nisbətən daha ağıllı və bu peşədən daha çox başı çıxan biri meydana gələrsə, ona hörmət etməyə başlayacaqlar və buna görə də türklər öz şeyxlərinə yüksək dərəcədə ehtiram göstərirlər, ona görə ki, təcrübə şeyxlərin idrakını digərlərindən daha artıq zənginləşdirmişdir. Buna görə də Məhəmməd (122) deyib: «Şeyx öz tayfası içərisində peyğəmbər öz icması içərisində olduğu kimidir». Peyğəmbər öz icmasında xarakterinin gücünə və bədənin gözəlliyinə, zənginliyinə və ya özünün qüdrətinə görə deyil, biliyinə, idrakına görə ehtiram qazanır. Buna görə də bir çox tərs adamlar Allahın Elçisini (122) qətlə yetirmək istəyirdilər, lakin onu gördükləri zaman qorxmuş və onun sifətində bu insanın elçiliyini ifadə edən və ona əks gedənləri vahiməyə salan Allahın (121) nurunu görmüşdülər. Allah (121) biliyi ruh adlandırmış və buyurmuşdur: «(Ya Rəsulum! Əvvəlki peyğəmbərlərə vəhy nazil etdiyimiz kimi) sənə də beləcə əmrimizdən olan bir vəhy (möminlərə mənəvi həyat verən Quran) göndərdik» (42:52). Bunu isə həyat adlandıra-

raq dedi: «Heç (küfrlə) ölü olub diriltdiyimiz, sonra insanlar arasında gəzmək üçün özünə bir nur (islam dini) verdiyimiz adam...» (6:122). Peyğəmbərimiz deyib: «Allah idrakdan gözəl heç bir şey yaratmamışdır». Əgər biz biliyin əldə olunmasının məqsədləri haqqında bizə gəlib çatanların hamısını burada yerləşdirsək, bu, həddindən artıq vaxt və yer sərfinə səbəb olardı, lakin aşağıdakı ifadədən gözəl hansı tərif ola bilər: «Doğrudan da, mələklər elm qazanan insanın işindən razı qalaraq onun qarşısında qanadlarını bükürlər».

## İDRAKIN NƏCİBLİYİNİN ÜZƏ ÇIXMASI ÜÇÜN BİLİYİN QAZANILMASININ VACİBLİYİ HAQQINDA

Bil, idrakın məziyyəti ondadır ki, o – biliyin və müdrikliyin məkanıdır və onların vasitəsidir. İnsanın ruhu isə – biliyin və müdrikliyin başlanğıcı və onların mənbəyidir, alov daşda, su torpaqda və palma ağacı xurma çəyirdəyində mövcud olduğu kimi, doğuluşdan bilik və müdriklik ruhda bir qabiliyyət kimi mövcuddur. Suyun torpaq üzünə çıxması üçün quyu qazmaq lazım gəldiyi kimi, onları fəaliyyətə gətirmək üçün mütləq əmək sərf etmək, işləmək lazımdır. Elə su var ki, insan zəhməti tələb etmədən özü axır, elə gizli su var ki, onu tapmaq üçün torpağı qazmaq və çox əmək sərf etmək lazımdır və eləsi də var ki, onu əldə etmək üçün lap az işləmək lazım gəlir. İnsanın ruhundakı bilik də bu cürdür: eləsi var ki, mümkünlükdən mövcudluğa heç bir təlim olmadan keçə bilir – bu hal peyğəmbərlərə aiddir, Allah (121) onlara rəhmət eləsin, zira onların biliyi heç bir insani vasitəçilik olmadan öz başlanğıcını Ali mühitdən alır. Eləsi də var ki, ona çoxlu qüvvə sərf olunur. Adi adamlarda, xüsusən də öz ömürlərini etinasızlıqda və cəhalətdə keçirən, gəncliyində elm öyrənməyən və buna görə də gec anlayan insanlarda bu cürdür. Eləsi də var ki, bir azca qüvvə sərf etmək kifayət edir. Ağıllı və gənc adamların çoxunda bu cürdür. Biliyin insan ruhunda mövcud olduğuna görə Allah-Təala buyurub: «(Ey Peyğəmbərim!) Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən (gələcək) nəsillərini çıxardıb onları özlərinə (bir-birinə) şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab vermişdilər» (7:172). Şahidlik dedikdə, elə bizim söylədiyimiz

şeylər nəzərdə tutulur, ona görə ki, bilik qabiliyyət və mümkün olan bir şey kimi nəzərdə tutulur, həqiqətən də, dillə olunan şahidlik nəzərdə tutulmur, zira o, doğulan hər bir kəsdə deyil, yalnız bəzilərində mövcud olmuşdur. Allah-Təalanın (121) dediyi kimi: «And olsun ki, əgər onlardan özlərini kimin yaratdığını soruşsan, mütləq: "Allah!" – deyə cavab verəcəklər!» (43:87), yəni əgər sən onların özlərini, qəlblərini və daxilindən olanları tədqiq etsən, hər biri bu haqda şəhadət verəcəkdir. «(Ya Məhəmməd! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq (pak bir müvəhhid, xalis təkallahlı kimi) üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə (islama) tərəf tut» (30:30). Hər bir insan imanla doğulub və peyğəmbərlər təkallahlı olaraq gəliblər, buna görə də Peyğəmbər (122) buyurub: «Deyin: «Allahdan başqa allah yoxdur»» və onunla yalnız hansısa allaha inananlar, lakin onun özündə və yaxud da onun necə olmasında səhv edənlər rastlaşırlar.

Daha sonra, Allaha (121) inam lap əvvəldən insanın ruhunda olur və buna görə də insanlar iki yerə bölünürlər, birincilər – həmin inamdan kənarlaşaraq onu unudanlar – allahsızlardır, digərləri öz ruhundan ayrılıb, – əvvəl şəhadət gətirib, sonra laqeydlikdə bunu unudub, daha sonra isə yenidən xatırlayanlar kimi – sonra ayılırlar və buna görə də Allah-Təala (121) deyib: «...yaxşı düşünüb ibrət almaları üçün...» (2:221); «...həm də ağıl sahibləri düşünüb ibrət alsınlar» (14:52); «Allah qarşısında (borcu yerinə yetirməkdə) sabitqədəm və ədalətli şahidlər olun» (5:8); «And olsun ki, Biz Quranı (ondan) ibrət almaq, öyüd-nəsihət qəbul etmək üçün belə asanlaşdırdıq. Amma hanı ibrət alan, öyüd-nəsihət qəbul edən?!» (54:32). «Xatırlamaq» sözü də daha tez-tez bunu qeyd etmək üçün istifadə edilir. İki cür xatırlama var. Birincisi – insan ağıl vasitəsilə onun ürəyində təcəssüm edən, sonra isə ondan silinən xəyalı xatırlayır. İkincisi isə – insan öz doğuluşundan onda mövcud olan xəyalı xatırlayır. Buna görə də tədqiqatçılar söyləyirlər ki, tədris zahirdən heç bir şey gətirmir, insanın öz təbiətində mövcud olanını açır, bu, torpağın altındakı suyun çıxardılmasına və ya güzgünü təmizləməklə onda olan təsvirin aydınlaşdırılmasına bənzəyir – bu cür həqiqətlər idrakın baxışları ilə görünür, lakin laqeydliyin və lazımi səy göstərməməyin nəticəsində məktəb şagirdinin birinci pilləsində o yana keçə bilməyən, təbiəti yalnız sözləri zahiri tərəfdən təsvir etməyə bağlı olan, onu öyrənməyə və anlamağa çalışmayan insanlar üçün bu, çox çətin olur.

# İDRAKIN NÖVLƏRİ HAQQINDA

Bil ki, idrak anadangəlmə və qazanılmış olur. Anadangəlmə idrak – bu, biliyi qavramaq qabiliyyətidir. Palma ağacı xurma çəyirdəyində mövcud olduğu kimi, bu qabiliyyət də körpədə mövcud olur. Qazanılmış idraksa – ya anlamadan, tədris keçmədən zəruri biliklərin axını kimi əldə olunan, ya da şüurlu surətdə keçilən tədris yolu ilə qazanılan bilikdir. İdrakın iki növə bölünməsi haqqında Əli (124) demişdir:

Mən gördüm ki, idrak ikidir:<br>
Təbii və eşidilmiş.<br>
Əgər təbii idrak yoxsa,<br>
Eşitdiyindən nə fayda.<br>
Əgər gözlər kordursa,<br>
Günəşdən yox bir fayda.

«Allah idrakdan dəyərli heç nə yaratmamışdır» sözləri ilə birincisi nəzərdə tutulur. Peyğəmbərimizin (122) Əliyə (124) müraciətlə söylədiyi: «Əgər insanlar öz möminlikləri ilə yaxınlaşsalar, sən öz ağlınla yaxınlaş», - sözləri ilə ikincisi nəzərdə tutulur. Birincisi – bədən üçün görmə kimidir, ikincisi isə – günəş işığı kimidir. Əgər kor bir insan üçün işığın heç bir faydası yoxdursa, eyni şəkildə işıq olmadıqda heç bir şeylə görməyə kömək edə bilməzsən. Daxili görmə də – idrak – zahiri görmədən daha yaxşıdır, ona görə ki, ruh sanki bir atlı, bədənsə – atdır və atlının kor olmağı atın kor olmağından daha çox zərər gətirir. Daxili və zahiri görmə bir-birinə bənzədiklərinə görə Allah-Təala (121) buyurub: «Qəlb (Peyğəmbərin qəlbi) gördüyünü yalan saymadı» (53:11). Allah (121) həmçinin buyurub: «Beləcə, İbrahimə göylərin və yerin mülkünü, səltənətini (oradakı qəribəlikləri və gözəllikləri, onların Allahın qüdrəti ilə yaradılmasını) göstərdik ki, tam qənaətlə inananlardan olsun!» (6:75). İdrakı korluğun əksi adlandıraraq Allah-Təala (121) belə buyurur: «Həqiqətən, gözlər kor olmaz, lakin sinələrdəki ürəklər (qəlb gözü) kor olar» (22:46). Həmçinin buyurub: «Bu dünyada (Allahın dəlillərini, möcüzələrini görməyib gözü və qəlbi) kor olan axirətdə də kor olar və haqq yoldan daha da çox azar!» (17:72).

Ümumiyyətlə isə, əgər insan öz idrakının gözü ilə görmürsə, onda həmin adamla öz imanını, hətta onun xarici qabığını belə onunla bağlama, lakin onun xülyaları və buna oxşayan digər şeylər

bu imanın mahiyyətindən və həqiqiliyindən çox aşağıdır. Şəriət elmlərini (əməli) ruhi elmlər (idrak haqqında) olmadan dərk etmək mümkün deyil, zira sonuncular sağlamlıq üçün olan dərman kimidir, şəriət isə sanki qidadır. (Sözlərin, ənənələrin) ötürülməsi (nəql) idrakdan əmələ gəlmişdir və onların yerini dəyişmə. Qida, dərmandan məhrum olmuş xəstə ruha yalnız zərər verir və heç bir fayda gətirmir, buna görə də Quran onlara heç bir fayda vermədiyi zaman Allah-Təala (121) buyurdu: «Onların ürəklərindəki xəstəlikdir». Kor bir təqlidçi əgər şəriətin tərkibinə nəzər yetirsə, ona elə gələr ki, burada çoxlu ziddiyyətlər vardır. Bundan başqa, ağlının azlığı və xarakterinin zəifliyi səbəbindən onun ruhu öyrənməyə cürət etməyəcəkdir və bunun artıq öz təqlidinin sonu olacağından qorxaraq biganəlik obrazı yaradacaqdır. Ola bilər ki, həmin şəxs onu oxuyar və onda olan ziddiyyətləri anlayar, onda çaşqınlıq üstün gələcək və o, öz inamını itirəcəkdir. Əgər o, qəlbin gözü ilə baxsa, onda bu təzad yox olacaq və o, hər şeyi öz yerində görəcək. Bu, evə girəndə bardağa, ləyənə və başqa ev əşyalarına ilişərək: «Bunları niyə yolumun üstündə saxlamısınız, niyə hərəsini öz yerinə qoymursunuz?» – deyə qışqıran kora bənzəyir. Ona başa salırlar ki, hər şey öz yerindədir, problem onun gözlərindədir. Bu söylədiklərimiz idrakdan alınan bilik haqqındadır.

Bil ki, idrakın köməyi ilə qazanılan bilik – bu dünya ilə bağlı olan biliyə və axirətlə bağlı olan biliyə bölünür. Onların yolları fərqlidir. Bunların birincisinə daha çox diqqət ayıranlar çox halda ikincidən az bir şey anlayacaqlar. Buna görə də Əli (124) üç müqayisə gətirmişdir: dünyəvi və axirət həyatı – tərəzinin iki gözü, şərqlə qərb və bir kişinin iki arvadı kimidir, əgər birini əzizləsən, ikincisini qəzəbləndirəcəksən, buna görə də biz aydın görürük ki, dünyəvi həyatdan işlərini yaxşı bilənlər axirətə münasibətdə cahildirlər və əksinə. Buna görə də Peyğəmbərimiz (122) deyir : «Özünü vəzifəyə həsr edən və axirət üçün çalışan insan ağıllı adamdır». Bir nəfər haqqında: «O, ağıldan zəifdir», - söyləyən bir ədəbli insana o (122) demişdir: «Cənnət əhlinin çoxu ağıldan zəifdir» və bununla dünyəvi həyata münasibətdə belə olduğunu nəzərdə tutmuşdu. Elə buna görə də əl-Həsən əl-Bəsri demişdir: «Biz elə insanlara rast gəlirik ki, siz onları gördükdə: "Dəlilər!" - deyərdiniz və bəziləri də sizi gördükdə: "Şeytanlar!" - deyə çağırardılar». Əgər sən islama aid nə isə bir qəribəlik eşitsən, əgər bu, həqiqət olsaydı, onda ağıllı, dünyəvi həyatdan baş çıxa-

ran, həndəsi peşələrdə dəqiq olan insanların buna çoxdan çatmalı olduqlarını düşünüb, bu səbəbdən həmin qəribəliyi inkar etməyə tələsmə, çünki qərbə tərəf gedərək şərqdə olan bir şeyi əldə etmək mümkün deyil və bu, dünyəvi və axirət həyatına münasibətdə də eynilədir. Buna görə də Allah-Təala (121) deyir: «Bizimlə qarşılaşacaqlarına (Qiyamət günü dirilib hüzurumuzda duracaqlarına, cəzamıza yetişəcəklərinə) ümid etməyən, (axirətdən vaz keçərək) dünyanı bəyənib ona bel bağlayan və ayələrimizdən qafil olanların – məhz onların qazandıqları, günahlara görə düşəcəkləri yer Cəhənnəmdir!» (10:7-8). Bu da Allah-Təalanın sözlərindəndir: «Onlar dünya həyatının zahirini (ticarət və əkinçilik işlərini, məişət məsələlərini) bilirlər, axirətdən isə xəbərsizdirlər» (30:7). Həm bu dünyada və həm də axirətdə insanları idarə etmək üçün Allah-Təala (121) tərəfindən göndərilmişlərdən başqa heç kəs bu iki növü bir yerə cəmləyə bilməz – onlar Müqəddəs ruhun himayə etdikləri, hamıya kifayət edən və heç bir zaman azalmayan gücdən bəhrələnən peyğəmbərlərdir. Zəif ruhlar isə əgər bunlardan biri ilə məşğul olsalar, digərindən yayınacaqlar və hər ikisinə mükəmməl şəkildə yiyələnə bilməyəcəklər.

## SƏADƏTƏ APARAN ELMLƏRDƏ ŞAGİRDİN VƏ MÜƏLLİMİN VƏZİFƏLƏRİ HAQQINDA

Şagirdin vəzifələri çoxdur, bunları on hal özündə birləşdirir. Birinci vəzifə. Şagird xarakterlərin natəmizlikləri içərisində ruhun paklığını ən yüksəkdə tutmalıdır, bir halda ki, bədənin hissələrini təmizləməmiş ibadət mümkün deyildir və bilik qazanmağın özü də ruhun ibadəti, şəriət dili ilə desək, ürəyin ibadətidir, onda ürəyi rəzil nöqsanlardan və çatışmamazlıqlardan təmizləməmiş həqiqi bilik əldə etmək mümkün deyildir. Peyğəmbər (122) deyib: «İman təmizlik üstündə qurulub», bu həm də daxili aləmə aiddir, çünki təmizlik və natəmizlik təkcə zahiri cəhətdən olmur. Buna görə də Məhəmməd (122) buyurub: «İt dolaşan evə mələklər girmirlər». İtlər o yerlərdə olurlar ki, oraya mələklər enirlər, oraya mələklər nəzər yetirirlər və orada öz nişanələrini saxlayırlar. Nöqsanlar da – mane olan itlərdir... Əgər desən ki: «Lakin yaramaz xarakterə malik çox insanlar var ki, elmlə məşğul olurlar», onda sən əsl səadəti bəxş edən dini elmlərin mahiyyətini anlamaqda həqiqətdən nə qə-

dər uzaq olacaqsan, çünki yaramaz xarakterli insanların qazandıqları yalnız sözlərdir ki, bunları o, bəzən dili ilə, bəzən də ürəyi ilə bildirir. Əgər elmin nuru onu işıqlandırsaydı, onda onun xarakteri gözəlləşərdi, çünki elmin ən aşağı pilləsi – günahların əbədi həyatı məhv edən öldürücü bir zəhər olduğunu anlamaqdır və bunların da əsası, doğrudan da, nöqsanlardır. Şüurlu surətdə zəhər qəbul edən insan heç görmüsənmi? Buna görə də Peyğəmbərimiz (122) buyurub: «Bir kimsədə elmin artmasına baxmayaraq, yolu düzəlməyibsə, o şəxs Allahdan ancaq uzaqlaşıb». Bir alim də belə demişdir: ««Biz elmi Allah elmə öyrənmədik, lakin elm Allahdan başqa bir kimsə üçün olmaq istəmədi» sözləri o deməkdir ki, elm bu zaman özünün əldə olunmasına müqavimət göstərmiş və bunu rədd etmişdir». Əgər sən desən ki: «Axı mən çoxlu sayda böyük alimlər tanıyıram ki, öz pis xarakterlərinə baxmayaraq, çox şeylər bilirlər», onda sənə cavab verərlər: «Əgər sən elmin dərəcələrini və onların səadətə aparan yol üzrə hərəkətinə münasibətini bilirsənsə, onda sən anlayacaqsan ki, onların bildikləri çox cüzi, əhəmiyyətsiz şeylərdir və bu da səadətə səy göstərənləri ona bağlılıqdan azad etmir».

İkinci vəzifə. O, bütün dünyəvi şeylərə bağlılıqdan azad olmalı və ailədən, övladlarından və vətənindən uzaqlaşmağa çalışmalıdır, zira bunlar onun ürəyini yayındırır və onu məşğul edir. «Allah bir adamın köksündə iki ürək yaratmamışdır» (33:4). Əgər sən yayınsan, həqiqətə çata bilməyəcəksən, buna görə də belə deyirlər ki, sən özünü elmə tam həsr etsən, elm sənə özünün yalnız bir hissəsini bəxş edər və əgər özünü ona tam həsr etsən, onun sənə bir hissəsini bəxş etməyindən, həqiqətən də, böyük təhlükəyə rast gəlmiş olacaqsan. İnsanın düşüncəsi əgər bir çox şeylərə parçalanarsa, onda o, suyu açıq və hamı üçün əlçatan olan bir çaya bənzəyəcəkdir ki, suyunu külək və torpaq sərf edərək əkilmiş tarlalara çatmaqla gətirə biləcəyi faydadan heç nə qalmayacaqdır.

Üçüncü vəzifə. O, biliklərə və bu biliklərə malik olanlara münasibətdə təkəbbürlü olmamalı, müəlliminə əmr etməməli, həkimin məsləhətlərinə qulaq asan bir xəstə kimi öz müəllimini eşitməli, biliyə aparan yolda özünü onun idarəçiliyi altına verməlidir. Biliklərə münasibətdə təkəbbürlüyə gəldikdə isə, əgər o, öz lovğalığı ucbatından bilikli insanlardan fayda götürməkdən imtina edərsə, onda bu ən böyük axmaqlıq olar, ona görə ki, müdriklik – hər bir müdrik insanın axtarış predmetidir və onu harada tapsa, götürməli və öz gücünü artırmaq üçün istifadə etməlidir.

Sel – əgər yüksək yerlər üçün bəladırsa,
Bilik də – lovğa gənc üçün bir bəladır.

Təvazökarlıq zəruridir, buna görə də Allah-Təala (121) buyurub: «Şübhəsiz ki, bunda qəlb (ağıl) sahibi, yaxud (öyüd-nəsihət) eşitdiyi zaman (ona cani-dildən) qulaq asan bir kimsə üçün ibrət dərsi vardır!», daha doğrusu, bilik qazanır, «...qəlb (ağıl) sahibi» dedikdə, məhz bu nəzərdə tutulur və bu da onu diqqətlə qulaq asmağa və yalvarışla müraciət etməyə məcbur edir. Əgər şagird öz müəllimi üçün leysan yağışların suyunu qəbul edərək içən və heç nə verməyən barsız bir torpaqdırsa, onda heç bir fayda olmayacaq.

Əgər dərs vaxtı müəllim şagirdinin qəti olaraq səhv saydığı bir şeyi deyərsə və o, buna əmindirsə, qoy özünü günahlandırsın, dözsün və müəlliminin ardınca getsin, çünki müəllimin səhvi şagirdin doğruluğundan daha yaxşıdır, müəllimsə çox şey öyrənmiş bir səyyah kimidir və bu, şagirdini heyrətə sala bilər. Musa (123) və Xızır (123) rəvayəti ilə Allah-Təala (121) bunu nəzərlə tutur. Burada Musa soruşur: «Öyrədildiyin doğru yolu göstərən elmdən mənə öyrətmək şərtilə sənə tabe olummu?» (18:66). Xızır (123) da öz növbəsində ona müraciətlə deyir: «...səbəbini sənə izah etməyincə, məndən heç bir şey haqqında soruşma!» (18:70). Sonra isə Musanın (123) səbri çatmır və ona suallar verməyə başlayır, sonda isə belə bir cavab alır: «Bu artıq mənimlə sənin aranda ayrılıq vaxtıdır» (18:78). Daha sonra isə, şagirdin idrakının və onun təsəvvürünün çata bilmədiyi şeyləri müəllim bilir, ümumiyyətlə isə, biliyin əldə olunması yolunda öz müəlliminin tapşırıqlarını yerinə yetirməyən hər bir şagird bilməlidir ki, o, müvəffəqiyyətə nail ola bilməyəcək və məğlub olacaqdır. Əgər sən soruşsan: «Axı Allah-Təala buyurur: "Əgər (bunu) bilmirsinizsə, onda kitab əhlindən soruşun!"» (16:43), onda bil ki, bu heç də Musaya (123) soruşmamaq haqqındakı qadağana və bizim dediklərimizə zidd deyildir, ona görə ki, qadağan – bir şəxsin hələlik anlaya bilməyəcəyi bir şeyi axtarmağa icazə verilməməsidir və əgər müəllim ona sual verməyi qadağan etmişsə, qoy o da bu tapşırığa əməl etsin. Hökm isə – bir şəxsin dərəcəsinə uyğun gələn şeyləri müfəssəl öyrənməyə niyyətdir.

Dördüncü vəzifə. Nəzəri elmləri öyrənməyə girişən şəxs bunun qanunlarının əsaslarını öyrənməmiş mövcud olan cərəyanların arasındakı fərqlərə, qarışıqlıq və çaşqınlıq törədən şübhələrə lap

əvvəlcədən diqqət verməli deyil, zira belə yanaşma onun elmlərin qanunlarına inamını sarsıda bilər və «Elmin meyarı» əsərində dediyimiz səbəblərdən onda etimadsızlıq yaranar. Şagird qoy əvvəlcə öz müəlliminin tərəfdar olduğu əsasları və mühakimələri mükəmməl mənimsəsin və müəlliminin yolunu davam etdirsin, daha sonra isə şübhəli və mübahisəli məsələləri öyrənməyə başlasın və onu yoxlasın. Buna görə də Allah-Təala (121) islam elmi haqqındakı biliklərdə güclü olmayanların dinsizlərlə yaxın ünsiyyətdə olmasını qadağan edir və belə deyirlər ki, bu, donuz ətinə qoyulan qadağanın səbəblərindən biridir, çünki bu, onların ən çox istifadə etdiyi qidalardandır. O, (121) bunu qadağan etməklə müsəlmanlara kafirə etibar etməyi qadağan etdi, belə ki, etibar onlarla yaranan ünsiyyətin əsas səbəbi idi. Buna görə də ailəni əxlaqsız insanlarla ünsiyyətdən necə qoruyuruqsa, sadə adamları da öz istəklərinin qulu olanlardan belə mühafizə etməliyik. Lakin kim öz imanında güclüdürsə və bunu dəlillərlə və sübutlarla qorumaq bacarığını yaxşı mənimsəyibdirsə, onda həmin şəxsə (dinsizlərlə) ünsiyyət etməyə icazə verilir və əgər o, şübhəli və mübahisəli məsələlərə qulaq verərək onları həll edə bilərsə, onda bu, onun cihadıdır və belə hərəkət alqışlanır, çünki əgər bacarıqlı bir şəxs dinsizlərə qarşı çıxaraq bunu edərsə, onda alqışlanacaq, bacarıqsıza isə bu hərəkəti etmək icazəsi verilmir. İmanda zəif olanların vəzifələrinin güclülərlə eyni olduğunu deyənlər haqlı deyillər və bir sufi şeyxi demişdir: «Məni əvvəldə görənlər: "Ən düzgün adam!" - deyə adlandırırlar, məni sonda görənlər isə: "Allahsız!" - deyirlər». O demək istəyir ki, hər hansı bir işin başlanğıcında çoxlu sayda ibadətlər göz qabağında olur, sonda isə əməl daxilə istiqamətlənir və ürək bütün vaxt ərzində şahidlərin və iştirakçıların gözləri önündə qalır, bədənin etdiyi hərəkətlər başa çatır və buna görə də elə başa düşmək olar ki, bu, ibadətə, onun mahiyyətinə və məqsədinə biganəlikdir.

Beşinci vəzifə. Təhsil zamanı bütün elmləri, onların məqsədi, təyinatı və yolları haqqında hər şey sənə aydın olana qədər oxuyub öyrənmək lazımdır. Sonra onun vaxtı qalarsa və heç nə ona mane olmazsa, qoy onu müfəssəl öyrənsin, çünki bütün elmlər bir-birinə təsir göstərir və bir-birilə bağlıdır. O, bu elmə düşmən olmasın deyə, onunla həqiqi məşğul olur, çünki insanlar bilmədikləri şeylərin düşmənidirlər. Allah-Təala (121) buyurub: «Onlar Quranla doğru yola gəlmədikləri üçün: "Bu, köhnə yalandır!" – deyəcəklər» (46:11). Bir şair də deyib:

Ağzında acı, pis dad olan kəslər,
Təmiz bulaq suyunu da acı sezər.

Elmin hər hansı bir növünə laqeydlik göstərmək olmaz, bütün növ elmləri qazanmaq və ona, onun vəziyyətinə haqq qazandırmaq lazımdır, ona görə ki, bilik bütün dərəcələri ilə qulu Allaha (121) doğru aparır, ya da onun bu yoldakı hərəkətinə təsir göstərir. Onların düzülüş nizamı məqsədə yaxınlığından və uzaqlığından asılıdır. Ona riayət etmək və cihad yolunda hüdudların qorunduğu kimi, onu da qorumaq lazımdır.

Altıncı vəzifə. Bütün elmləri bir dəfəyə öyrənməyə çalışmaq olmaz, lakin sıranı gözləmək və ən vacibindən başlamaq, daha sonra isə vacibini öyrənmək zəruridir və hər hansı bir elmi öyrənməyə sırada ondan əvvəl gələnini öyrənməmiş başlamaq olmaz, çünki bu sıra vacibdir və bəzi elmlər digərlərinə aparan yoldur. Bu sıranı və növbəni gözləyən insanı müvəffəqiyyət gözləyir. Allah-Təala (121) buyurub: «Verdiyimiz Kitabı layiqincə (təhrif etmədən) oxuyanlar həmin kitaba iman gətirənlərdir», daha doğrusu, elmin növünə bilik və əməllə mükəmməl tərzdə malik olmamış həmin növ başa çatmır və qoy hər bir elmin təyinatı özündən yuxarıda durana yüksəlmək olsun.

Hər hansı elmə münasibətdə alimlərin mülahizələrinin birbirinə zidd olmasına görə həmin elmin pis olduğunu sən həll etməli deyilsən, nə bir, nə çoxlu səhv əsasında və hətta bu alimlər əməl və biliklə bağlı mülahizələrlə razılaşmasalar da, sən bunu etməli deyilsən və biz elə insanlarla rastlaşmışıq ki, əgər bu elmin əsası olsaydı, onu (bu elm sahəsindəki) alimlər anlayardılar – deyə, özlərinə haqq qazandıraraq ilahiyyatı və fiqh elmini öyrənməkdən əl çəkmişlər. Bu qeyri-müəyyənliyi «Elmin meyarı» kitabımızda şərh etmişdik. Bir qrup insan var ki, yalnız bir adamın haqlı olmasına görə ulduz falının düzgün olduğuna inanırlar və digər qrup isə yalnız bir şəxsin səhvinə əsaslanaraq ulduz falının düzgün olmadığı qənaətindədir. Bütün bunlar səhvdir, ona görə ki, şey özü-özlüyündə müəyyən olunmalıdır, çünki elmin hər hansı bir növü yalnız bir şəxsə aid deyil. Buna görə Əli (124) buyurub: «İnsanlara görə həqiqəti öyrənmə, həqiqəti öyrən onda insanları tanıyacaqsan».

Yeddinci vəzifə. Bu, düzdür ki, həyat bütün elmləri öyrənmək üçün bəs etmir, buna görə də insan hər növdən ən yaxşı his-

səni götürməli və hər bir elm növünü səthi öyrənməklə kifayətlənməlidir, sonra isə qalan ömrünü müvəffəqiyyətin və səadətin – bütün elmlərin təyinatı budur – səbəbi olan biliyin əldə olunmasına, Allahı (121) həqiqi və gerçək anlamağa istiqamətləndirməlidir. Bütün biliklər bu biliyə xidmət edir, bu biliksə sərbəstdir və heç nəyə xidmət etmir. Buna görə də Allah-Təala (121) buyurub: «Sən: "Allah!" – deyib çağır, sonra da onları burax ki, düşdükləri bataqlıqda ilişib qalsınlar. (Özlərinin dedi-qodularında, pis işlərində və yaramaz əqidələrində davam etsinlər)» - burada həmin səslərin dil hərəkəti vasitəsilə tələffüz olunması nəzərdə tutulmur, axı Peyğəmbərimiz (122) buyurub: «Kim səmimi olaraq: "Allahdan başqa allah yoxdur", - bildirərsə, o şəxsə Cənnət nəsib olacaqdır», zira insanın dilinin hərəkəti əgər bu, ürəyə təsir etmirsə və ya ürəkdə başlanğıcı iman adlanan bir inam yaranan dərin bir nişanədən yaranmırsa, onda çox az əhəmiyyət daşıyır. Sonuncu pillə isə Əbu Bəkrin imanı kimi bir imandır ki, əgər tərəzinin bir gözünə bunu, digər gözünə isə dünyanın bütün insanlarının imanlarını qoysaq, yenə də bu iman ağır gələcəkdir, bu, həqiqətən də, belədir, çünki üstünlük orucluğun və duaların miqdarı ilə deyil, ürəkdə qorunan gizli sirlə təmin olunur.

Əgər Allah (121) haqqındakı biliyin hüdudu bütün bildiklərini sübutlarla izah etmə vasitəsilə öyrənən təqlidçi bir alimin inancı kimi bir inancdırsa, onda mənim fikrimcə, Ömər (124), Osman (124) və digər bütün silahdaşları bunu bacara bilməzlər, belə ki, Əbu Bəkr (124) bu işdə onların ən yaxşısı idi. Buradan aydın olur ki, sufilərin üsulu çoxları üçün qeyri-müəyyən olmasına baxmayaraq, şəriət onun xeyrinə şəhadət verir və cahil insan öz cahilliyinə və əsassızlığına görə onlarla mübahisə etməli deyildir. Ümumiyyətlə isə, Allah (121) haqqındakı bilik bütün növ biliklərin məqsədi və istisnasız olaraq bütün məzhəblərdəki bütün elmlərin məntiqi nəticəsidir.

Belə deyirlər ki, bir nəfər səylə məscidə sitayiş edən iki müdriki görür, onlardan biri əlində bu sözlər yazılmış bir kağız parçası tutmuşdu: «Əgər sən hər şeyi mükəmməl surətdə edirsənsə, nə qədər ki, Allah-Təalanı və Onu bütün səbəblərin Yaradanı və hər şeyin Xaliqi kimi tanımamısan, yaxşı nəsə etdiyin barədə düşünmə», ikinci müdrikin əlindəki kağızda isə bu sözlər yazılmışdı: «Allahı dərk edənə qədər mən su içirdim, lakin həmişə su-

suzluq hiss edirdim, Onu dərk etdikdən sonra isə susuzluğumu su içməmiş yatırdıram».

Səkkizinci vəzifə. Sən bilməlisən ki, biliklərin bəzi növləri digərlərindən daha nəcibdir və bu və ya digər elmin məziyyətini iki şey təyin edir: birincisi, nəticənin məziyyəti, ikincisi, onun sübutlarının bir-birilə bağlılığı. Bu, ilahiyyat və təbabət kimidir: ilahiyyat elminin nəticəsi sonu olmayan əbədi həyatdır və ona görə də bu elm nəticəsi insanın ölüm gələnə qədərki həyatı olan təbabətdən daha üstündür. Əgər riyaziyyatı təbabətlə müqayisə etsək, onda öz sübutlarının qarşılıqlı əlaqəsinə görə riyaziyyat elmi daha üstündür, ona görə ki, onda olan bilik təbabətdən fərqli olaraq, təcrübə ilə bağlı deyildir. Təbabətsə öz nəticəsinə görə riyaziyyatdan daha üstündür, belə ki, cismin ölçülərinin təyin edilməsindənsə, insan sağlamlığı daha vacibdir. İlk olaraq nəticəyə, sonra isə sübutların bağlılığına diqqət yetirmək lazımdır. Nəticələrin vacibliyinə görə isə Allah (121), Onun mələkləri, Kitabları, peyğəmbərləri haqqında və buna yardım edən şeylər barədə olan biliklər ən yüksəkdə durur, çünki məhz onlar insanı əbədi xoşbəxtliyə çatdırır.

Doqquzuncu vəzifə. Sən bilməlisən ki, elmlər, ümumiyyətlə, üç cürdür: birincisi, (müəyyən) mənanı ifadə edən sözlə bağlı olan elmlər; ikincisi isə, sadəcə olaraq məna ilə bağlı olan elmlər. Sözlə bağlı olan və mənanı hisslər vasitəsilə ötürən elmlər iki növə bölünür: birincisi dil haqqında elm, ikincisi isə morfologiya, sintaksis, şeyr sənəti kimi birincilərin ardınca gedən elmlər. Bu, fonetikaya və ona bağlı olanlara qədər davam edə bilər. Məna ilə bağlı olan elmlər isə sözlə ifadə olunan tərəfdən bunlar mübahisə, sübutlar, natiqlik sənəti, disput haqqında olan elmlərdir, ona görə ki, bu elmləri öyrənən insanlar dili, sözlərin mənasını, onların hansı sıra ilə düzülməli olduğunu və onların necə nizama salınmalı olduğunu yaxşı bilirlər. Bütün bunlar elə olmalıdır ki, həmin nizam həqiqi bilikləri əldə etməyə gətirib çıxarsın və sübut şəklinə düşsün, ya da öz rəqibinə qələbə çalmağa kömək etsin və mübahisə şəklinə düşsün, ya da insanın inamına, onun arzuladığı məqsədə doğru hərəkətinə gətirib çıxarsın və moizə, ya da dərs adlandırılsın – bu, göstəriş də adlanır, çünki bu, insanın məhz nəyə səy göstərməli olduğunu göstərir və insanın xilasını özündə daşıyan inama aparır, məlumatların çoxu bunu göstərir və Quran da onlardan dəlil şəklində istifadə edir, Quranın özü isə böyük miqdarda insan-

lara fayda gətirən ən mötəbər sübutdur. Əsl inandırıcı dəlili böyük alimlər anlaya bilər, lakin bunlara da çox az rast gəlinir. Düzgün yolu göstərməkdə mübahisə ən az fayda gətirəndir, çünki onun rəqibinin sübutların təzyiqi altında məğlub olub, əslində isə yenə də bu mühakimələrlə razılaşmaması əsl alim üçün kifayət deyil. Cahil bunu anlamır onun idrakı bunu başa düşə bilmək halında deyildir, fitnəkar və höcət adam mübahisə zamanı məğlub olsa da və onu susmağa məcbur etsələr də, öz dediyində qalmağa davam edir və heç bir halda öz səhvini boynuna almır. Müxtəlif cərəyanlar və təriqətlərlə müzakirələrdə ilahiyyatçıların xatırlatdıqları da mübahisəli məsələlərdir və bu, dindar alimlərin müzakirələrinə də aiddir. Məna və anlayışlarla bağlı olan üçüncü növün özü isə iki yerə bölünür: tam elmi və praktiki. Allah-Təala (121), mələklər, peyğəmbərlər, daha doğrusu, peyğəmbərlik və onların dərəcələri, mələklərin dərəcələri, göy və yer məmləkətləri, Onun yerdəki, insandakı və yerdə yaşayan canlılardakı əlamətləri haqqında elmlər; ulduzlar və səma cisimləri, bütün varlıqların tərkib hissələri, onların bir-birilə necə nizamlanması və bağlılığı haqqındakı biliklər, bütün bunların Mütləq Həqiqətlə, nə isə digər bir şeylə bağlı olması üçün mövcud olandan yüksəkdə duran Birinci ilə necə əlaqəli olması barədə, Zirvə, Dirilmə, Cənnət, Cəhənnəm, Sirat, Mizan[41] haqqındakı elmlər, cinlər və şeytanlar barədəki biliklərin hamısı – elmidir. Sadə adamların bu sözləri yalnız birbaşa mənada anlamasına, Allah-Təala (121) haqqında nələr təsəvvür etdiklərinə diqqət verin, məsələn, guya O, taxt-taca malikdir, Onun yeri dünya üzərindədir və zamana münasibətdə ondan əvvəldir, həm də mələklər və şeytanlar haqqında, axirət həyatı barədə, Cənnət, Cəhənnəm məsələsinə münasibətdə onlar nələr uydurmuşlar və bütün bunlar onların təsvir etdikləri kimidir, yoxsa bunlar yalnız xəyal və fantaziyalardır və bu ifadələr birbaşa mənasından başqa, digər anlayışlara da malikdirmi? Bütün bu məsələləri dərindən və dəqiq öyrən ki, səndə bir damcı da olsa, şübhə qalmasın və fərziyyələri saxla çünki bunlar nəzəri biliklərdir və əməli biliklərlə heç bir əlaqəsi yoxdur. Əməli bilik növü şəriət qanunları, fiqh və Peyğəmbərin (122) adətləri haqqındakı elmlərdir. Bu bilik özünü və öz xarakterini necə idarə etmək haqqında, əvvəldə dediyimiz kimi, qohumlara, övladlara necə münasibət bəsləmək, qidanın və geyimin necə olması, daha doğrusu, necə yaşamaq və ümumiyyətlə, münasibətlərin necə olması barədədir. Fiqh elmi münasibətlər

(müəmalât), kəbin (nikah) və cəzalar (ukubat) haqqındakı fəsillərdən ibarətdir.

Elmlərin növləri barədə öyrəndikdən sonra o, öz ömrünü əsas təyinatlı olmayan və ya buna yaxınlaşmayan elmlərə sərf etməmək üçün bunların vaciblik dərəcələrini də bilməlidir. Sözlərlə bağlı olan birinci növ biliklərlə kifayətlənən adam özünü yalnız xarici qatla hüdudlandırmış olur. Sintaksis, şeir sənəti, fonetika ilə kifayətlənənlər də bu qatla hüdudlanmışlar. Lakin daha dərinlərə baş vuraraq sübutların əqidədən nə ilə fərqləndiyini öyrənmək istəyənlər çox vacib işlə məşğul olurlar, amma o, bununla da kifayətlənərsə, yalnız alətlərlə və üsullarla hüdudlanmış kimi olur, bu ona bənzəyir ki, həcc ziyarətinə getmək istəyən bir şəxs dəvə alır, azuqə tədarükünü edir, su üçün qab hazırlayır və öz evində oturub qalır. Bu çox vacib və lazımlıdır, çünki bunlar zəruri vasitələrdir, lakin onlardan təyinatına görə istifadə olunmazsa, onda döyüşdə istifadə olunmayan silah kimi tamam faydasız olacaqdır. Praktiki elmləri dərindən öyrənən və bununla da kifayətlənən şəxs – mən fiqhlə bağlı olan elmləri və onların izahını nəzərdə tuturam – dil haqqındakı elmlərlə hüdudlanan insanlardan həqiqətə daha yaxındır, həmin elmlər daha yüksək mövqeyə malikdirlər, həmçinin dil haqqındakı elmlər də rəqslər və tütəkdə çalma elmindən daha yuksək mövqedə dururlar, bunları misal göstərmədən təsəvvür etmək çətindir. Əgər ağa desə ki, qulu həcc ziyarətini icra edərsə, onu azad edəcəkdir və bundan sonra o, hətta hakimiyyət də alacaqdır, onda azadlığa və ondan sonrakı səadətlərə nail olmaq üçün bu qul üç mərhələni keçməlidir. Birincisi vasitələrin hazırlanması – dəvənin satın alınması, su üçün qabın tikilməsi, azuqənin alınmasıdır. İkincisi təyin olunmuş məntəqə istiqamətində hərəkət edərək doğma torpaqlardan çıxmaq və lazım olan yerə qədər məsafəni qət etməkdir. Üçüncüsü həccin bütün ünsürlərini bir-birinin ardınca yerinə yetirməkdir. Bundan sonra həmin qul azadlığa nail olur, lakin bu zaman onu səadətə çatdıran əmlak düzgün qazanılmış olmalıdır. Beləliklə, o, hazırlığın əvvəlindən sonuna qədər, hərəkətin başlanğıcından ta təyin olunmuş məntəqədə sona yetənə qədər hamısını pillə-pillə qət edir. Həccin birinci ünsürünü yerinə yetirən şəxs hazırlığa başlayan və ya yalnız indicə yola düşmüş adamdan xoşbəxtliyə daha yaxındır. Həcc anında olan şəxs ruhunun kamilliyinə və xarakterinin

paklığına, bütün nöqsanlardan imtinaya görə adi halda olan insandan fərqlənir; ruhun kamilliyinin səbəbi isə həqiqətin aydınlaşmasıdır. Burada zirvəyə gətirib çıxaran əmlakı insan və özünü Cənnət zirvəsində kamil görə bilmək anında mövcud vəziyyət arasındakı pərdəni aradan qaldıran ölümlə müqayisə etmək olar. Yolu tədricən, hissə-hissə qət edən insanı öz qəlbindəki mənfi keyfiyyətlərdən yavaş-yavaş xilas olaraq xarakterini mükəmməlləşdirən şəxslə və ya haqqında danışdığımız nəzəri bilikləri bir-birinin ardınca öyrənən insanla müqayisə etmək olar. Su üçün qabın hazırlanması, azuqənin və dəvənin alınması – bunlar fiqh və filologiya kimi digər elmlərdir. Fiqhi öyrənən adam yalnız su üçün qabları hazırlamaqla kifayətlənən şəxs kimidir. Filologiya ilə kifayətlənən adamsa yalnız həmin qabların hazırlanmasında istifadə olunan dərini aşılayan insan kimidir, çünki zəvvarın buna da ehtiyacı vardır. Fiqhi və eyni zamanda bu yaxınlarda yaranan fikir ayrılıqlarını da – bunlar Peyğəmbərin (122) silahdaşlarının zamanında mövcud deyildilər – öyrənən şəxs su üçün qabı möhkəm tikdikdən sonra onu bir daha bərkidən insana oxşayır.

Əgər sən: «Əgər bunları sən öz etiqadına görə deyirsənsə, onda bu, islam qanunvericilərinin ümumi fikirlərinə ziddir, lakin əgər başqasından əxz edərək deyirsənsə, onda məhz hansı mənbədən götürmüsən?» - deyə soruşsan, mən cavab verərəm: «Mən yalnız böyük bir hissəsi barədə burada danışılan məzhəbin fikrini ötürərək bunu deyirəm ki, bu da təsəvvüfdür. Bu misal onlardan gəlməsə də, onlar burada təsvir olunan fikirlərlə həmrəydirlər». Əgər: «Onların söylədikləri doğrudur, yoxsa yalan?» - deyə soruşsan, onda cavab verərəm ki: «Mən bu əsərimdə öz qarşıma dəlillərin köməyilə nəyin doğru, nəyin yalan olduğunu aydınlaşdırmaq məqsədi qoymamışam, bu əsər nəsihətlər toplusudur, o, insanların laqeydliklərinə işarə verir və bu məsləhətlərdə olanları unutmamaları üçün onların nəyə səy göstərməli olduqlarını göstərir, çünki yolun başlanğıcında bunlar mümkündür, həqiqəti axtaran şagirdsə sirləri açmaq və onlarda olan şəri dərk etməkdən ötrü qoy bunları öyrənsin». Sən desən ki: «Mən təsəvvüfə aid olmasam da, fiqhin sufilərdə bu qədər aşağı pilləyə enməsindən sonra fiqhin onunla birlikdə bütün ayrılıqları və cərəyanları öyrənməyə vaxtımı sərf edə bilmərəm, lakin mən bu fikirlərlə razıyam. Onda nəyə görə deyirsən ki, on-

ların məzhəbləri bunun guya zəruri olduğunu deyir?» Bil ki,– qurtuluş və ruhda yaradılan səadətin əlaqələri – lazımsız şeylərdən qurtulmaq, ruhun təmizlənməsi və ruhda həqiqətin açılması yolu ilə, mükəmməlləşdirilməsi ilə ruhda zəruri olanlar yaradılır. Bu isə tərbiyədən və xarakterin yaxşılaşdırılmasından, Allahın (121) yaratdıqlarının sirləri açılana qədər, yer və göy məmləkətləri barədə düşüncələrdən sonra yaranır.

Fiqhə isə ehtiyac vardır, çünki bədən buna ehtiyaclıdır. Axı bədən orqanizm haqqında elm olan təbabətsiz və din haqqında elm olan fiqhsiz mövcud ola bilməz, zira insan elə yaradılmışdır ki, vəhşi heyvanlar kimi tək yaşaya bilməz və onun yemək, paltar və digər şeylərin hazırlanmasında bir-birlərinə kömək edən insanların cəmiyyətinə ehtiyacı vardır. Əgər insanlar bir yerə yığışıblarsa, onda onların istifadə etdikləri münasibətlərdəki qanunlara və ədalətin bərqərar olmasına zərurət yaranır və əgər bunlar olmasaydı, onlar mübahisə edər, vuruşar və sonda məhv olardılar. Fiqh – bu, qanunun izahı və müfəssəl müzakirəsidir, o, nikah, münasibətlər və cəzalar barədə olan fəsillərdən ibarətdir. İnsan Allah-Təalaya (121) doğru hərəkət edən zaman onun bədənini həcc yolundakı dəvəyə və içməli su ilə dolu olan qaba bənzətmək olar. Bədəndən gələn fayda dəvədən gələn fayda kimidir. Orqanizmlə bağlı olan elmlərsə su üçün lazım olan qablarla, onun hazırlanması və təmizlənməsi ilə əlaqəli olan peşəyə bənzəyir. Onların yol barədə, hazırlıq və son məqsəd haqqında dedikləri doğrudursa, onda onun vəziyyətinin özünün məqsədinə olan münasibəti həmin peşənin onun məqsədinə münasibəti kimidir. Onlar deyirlər ki, əgər dünyanın inkişafını Allah (121) istəməsəydi, onda bütün pərdələr qalxar və insanların bütün laqeydlikləri yox olardı, onda bütün insanlar məqsədlərindən uzaq olduqlarını unudaraq Allaha (121) tərəf çevrilərdilər, lakin indi onların hər biri «...öz malik olduqlarına sevinirlər» (30-32). Dünya da bunun üzərində bərqərar olub və əgər belə olmasaydı, insanlar nəsə bir şey istehsal etməkdən imtina edərdilər. Əgər dərzi, toxucu və ya ölçügötürən onların hər birinə öz peşələrini sevdirən şeylər barədə düşünməsələr, onda öz işini tərk edər və hamı daha xeyirxah əməlin ardınca gedərdi, bütün peşələrsə yox olardı. Bu ona görə vacibdir ki, sənətkarlar mövcud olsun və onların hansısa bir mənada laqeyd olmaları Allahın (121) mərhəmətindəndir. Bəzi alimlər Peyğəmbərin (122): «Mənim ümmətimdəki[42] fərqlər mərhəmətdəndir», - ifadəsini

məhz buna aid edirlər. Burada onların fəaliyyətlərindəki növ fərqləri nəzərdə tutulur və əgər süpürgəçi öz peşəsi barədə həqiqəti dərk etsəydi, onda bu peşədən imtina edər və alimlər, hökmdarlar (xəlifələr) və övliyalar özləri bu işlə, həmçinin dəriaşılama, dəmirçilik, kənd təsərrüfatı və bütün başqa peşələrlə məşğul olmalı olardılar. İnsanlar fiqhi, qrammatikanı, fonetikanı və təbabəti sevirlər və əgər Allah-Təala (121) belə etməsəydi, bütün bu elmlər yox olar və bütün nizam itərdi. Özünü bütünlüklə biliklərin qazanılmasına və ya hansısa bir peşəyə həsr edən insan vacib deyil ki, ondan yüksək mövqedə duran insanla öz vəziyyəti arasındakı nisbəti bilsin, qoy o, öz vəziyyəti ilə özündən aşağı mövqedə duranın vəziyyəti arasındakı nisbəti görsün. Elmlərin bütün pillələrini yalnız bütün bu elmlərdəki biliklərə sahib olan şəxs görə bilər və bu, o şəxsdir ki, Allah (121) özü ona müdriklik əta etmiş və şeyləri əslində necədirsə, elə də ona göstərmişdir. Bu, həmin şəxslərə mənim cavabımdır. Bundan sonra özün həll et: sənin hal-hazırkı vəziyyətinlə kifayətlənməlisən, yoxsa onların yolu ilə irəliləyərək həmin növü axtarıb onun haqqında əsl həqiqəti bilməyə çalışmalısan

Onuncu vəzifə. Şagirdin hal-hazırda oxuduqları hakimiyyət, zənginlik, səfehlərin qarşısında lovğalıq və ya alimlərlə mübahisə etmək naminə deyil, ruhun və əxlaqın kamilləşdirilməsi, axirət həyatında isə Allaha (121) yaxınlaşmaq məqsədilə olmalıdır, çünki rəhmətlik Peyğəmbərimiz (122) buyurub: «Axmaqların qarşısında lovğalıq göstərmək üçün və alimlərlə mübahisə etmək naminə bilik əldə edənlər Cəhənnəmə vasil olacaqlar».

Artıq deyilmişdir ki, elmlər öz mövqelərinə və Allaha (121) yaxınlaşdırmalarına görə fərqlidirlər, bu elmlərlə məşğul olmaqsa müharibə zamanı sərhəd məntəqələrinin müdafiəsinə oxşayır. Əgər hər bir kəs öz vəziyyətindən xəbərdardırsa, ona haqq qazandırırsa və bununla da Allahın (121) razı qalmasına səy göstərirsə, həmin şəxs öz mükafatını alacaqdır, zira Allah (121) onun malik olduğu biliklərə görə ona həm bu dünyada və həm də axirət dünyasında ucalıq əta edəcəkdir. Allah-Təala (121) buyurub: «Eləcə də sizə: «Qalxın!» - deyildikdə qalxın ki, Allah da sizdən iman gətirənlərin və elm bəxş edilmiş kimsələrin dərəcələrini ucaltsın» (58:11). O bir də buyurub: «Onların Allah yanında dərəcələri vardır» (3:163). Sufilərin fikirləri barəsində dediklərimiz isə sənin elmlərdəki coşqunluğunu soyutmamalıdır, çünki onlar

elmlərə nifrət edirlər, lakin hər bir müsəlman onlara hörmət etməli və onları uca tutmalıdır. Onların dedikləri isə peyğəmbərlər və Allaha (121) yaxın olanların pilləsinə aiddir və bu, ona bənzəyir ki, əgər sən soltanlarla və vəzirlərlə müqayisə edərək pul dəyişənlərə nifrət bəsləyirsənsə, bu heç də həmin adamların aşağı mövqe tutmaları demək deyildir, axı onlar süpürgəçilərlə və dəriaşılayanlarla müqayisədə daha yüksək mövqedədirlər. Yüksək pillə ilə müqayisədə aşağı olmaq heç də alçaqlıq deyildir, axı ən yüksək pillə peyğəmbərlərin və Allaha (121) yaxın olanların pilləsidir, sonra alimlər gəlir və onlar tutduqları mövqelərinə görə fərqlidirlər, daha sonra isə xeyirxah əməllərin sahibləri gəlir. Ümumiyyətlə isə, «Kim zərrə qədər yaxşı iş görmüşsə, onun xeyrini görəcəkdir» (99:7). Öz biliyi ilə Allaha (121) yaxın olmağa səy göstərənlərə, şübhəsiz ki, Allah (121) da kömək edər və onları ucaldar. Bu, bilik əldə edənin vəzifələridir.

Müəllimin və məsləhətçinin isə səkkiz vəzifəsi vardır. Lakin bundan əvvəl bil ki, bilik qazanan insan sərvət əldə edən şəxs kimi dörd vəziyyətdə olur. Birincisi odur ki, sərvət sahibi fayda götürən vəziyyətdə olur, yəni o, əmlak əldə edir. İkincisi odur ki, o, əldə etdiyindən müəyyən ehtiyat yaradır ki, bunun da sayəsində onun başqasından təmənna etməyə ehtiyacı olmur. Üçüncüsü odur ki, əldə etdiyindən özünə sərf etdikdə fayda qazanır. Dördüncüsü isə odur ki, başqalarına pul verərkən səxavətli və əliaçıq olur ki, bu da ən yaxşısıdır. Bilik də eynən sərvətə bənzəyir: onun sahibi ona lazım olan şeyi əldə etdikdən sonra fayda götürən vəziyyətdə olur və başqalarından nəsə təmənna etməyə ehtiyacı olmur. Və o, qazandıqlarının üzərində fikirləşdikdə düşünmə vəziyyətində və ya başqalarına məsləhətlər verir, onlara bilik tədris edir – bu ən yüksək vəziyyətdir. Biliyi qazanan, ondan istifadə edən və başqalarına da bununla fayda verən şəxs həm özü üçün, həm də digərləri üçün işıq verən günəşə və ya həm başqalarına rayihə paylayan, həm də bu zaman özü də ətirli olan müşkə bənzəyir. Başqalarına fayda verən, lakin özü faydalanmayan şəxs isə, başqalarının istifadə etdiyi, bu zaman özü heç nə əldə etməyən dəftərə, başqa predmetləri itiləyən, özü isə kəsməyən bülöv daşına, ya da başqalarına işıq verərək özü yanıb qurtaran çıraq piltəsinə bənzəyir.

Müəllimin birinci vəzifəsi isə odur ki, o, öz şagirdinə oğlu kimi yanaşmalıdır, bu haqda Peyğəmbər (122) buyurub: «Doğrudan da, mən sizin üçün ata kimiyəm». Qoy şagird düşünsün ki,

müəllimin hüquqları doğma atasının hüquqlarından artıqdır, çünki müəllim onun əbədi həyatının, atası isə fani həyatının səbəbidir. «Kim sənin üçün daha qiymətlidir – sənin müəllimin, yoxsa atan?» - deyə İskəndərdən soruşduqda, o: «Mənim müəllimim!» - deyə cavab vermişdir. Necə ki, eyni atanın oğulları bir-birlərini sevməli və öz aralarında mübahisə etməli deyillər, o cür də bir müəllimin oğulları və bir imanın oğulları da eynən belə olmalıdırlar, çünki onlar hamısı Allah-Təalanın (121) yanına gedəcəklər və onlar bu yolla da hərəkət edirlər. Bu yolda bir-birini müşayiət etmək üçün onlara yaxşı münasibətlərdə olmaq vacibdir, məziyyətlərdə qardaşlıq isə doğma qardaşlıqdan daha yüksəkdir. Qarşılıqlı nifrətin səbəbi isə onların bilik vasitəsilə hakimiyyətə can atmalarıdır və bununla da Allah (121) yolundan və Onun: «Həqiqətən, möminlər qardaşdırlar» (49:10), - sözlərindən kənar düşürlər. Belələrinə Onun: «Müttəqqilər istisna olmaqla, o gün dostlar bir-birinə düşmən kəsiləcəklər» (43:67), – kəlmələri uyğun gəlir.

İkinci vəzifə. O, Allahın Rəsuluna (122) oxşamağa səy göstərməli, təhsilə görə əvəz və ya mükafat təmənna etməməlidir. Allah-Təala bu barədə buyurub: «De ki: «Mən bunun (islam dininin) əvəzinə sizdən bir əvəz istəmirəm»» (6:90). Var-dövlətə və dünyəvi nemətlərə can atanlar isə öz ayaqqabısının dabanını sifəti ilə təmizləyən insana bənzəyirlər, ona görə ki, Allah (121) paltarı və qidanı bədənin nökəri, bədəni isə ruhun qulluqçusu kimi yaratmışdır. O, ruhu biliklərin ağası deyil, nökəri kimi yaratmışdır. Var-dövlət və əmlak isə ağa deyil, nökərdir. Əgər bunlar hamısı əksinə olsaydı, onda səhv olardı. Lakin təəccüblüsü budur ki, biz əks istiqamətə hərəkət etdiyimizdən və bizim dövrümüzdə alimlər az miqdarda olduğundan şagird öz müəllimini təqlid etməyə çalışır ki, bundan mənfəətlənsin və onun qarşısında oturaraq, fayda götürmək əvəzinə, dünyəvi nemətlərə can atır – bu, əsl nəsli pozulmadır, bunun səbəbi isə müəllimlərin hakimiyyətə can atmalarında və onların bilik səviyyələrinin çatışmamazlığı ucbatından özlərini çoxlu sayda şagirdlərlə zinətləndirmələrində və özlərinin şəxsi bilikləri ilə fərəhlənməmələrindədir. Buna görə də şagirdləri onlara tərəf can atırlar.

Üçüncü vəzifə. O, şagirdlərdən heç nə gizlətməməli, onlara məsləhətlər verməli və onları söz atmaqla və ya birbaşa qadağalarla nöqsanlardan mühafizə etməli, onların layiq olmadıqlarından yüksək mövqe tutmağa və edə bilməyəcəyi şeyləri etməyə səylə-

rini hüdudlandırmalı, bütün bu elmlərin təyinatına onların fikirlərini cəlb etməlidir. Doğrudan da, bunlar dünyəvi nemətlər deyil, axirət səadətidir. Əgər o görsə ki, kimsə yalnız hakimiyyətə çatmaq üçün və ya alimlərlə mübahisə etmək naminə oxuyur, həmin şagirdi təhsildən kənarlaşdırmamalıdır, çünki şagirdin bunun üçün böyük səy göstərərək oxumağı ümumiyyətlə oxumamaqdan daha yaxşıdır, belə ki, həmin şagird bilikləri qazanaraq axirət həyatı və şeylərin həqiqi mahiyyəti barədə düşünməyə başlayacaqdır. Alimlər məhz bunu nəzərə alaraq deyirlər: «Biz Allah naminə oxumurduq, lakin biliyin özü Allahdan qeyri bir kimsə üçün olmaq istəmədi». Lakin mən deyirəm ki, əgər insanlar Allah (121) naminə oxumaq istəmirlərsə, onda onları hakimiyyətə gətirmək həvəsi ilə biliklər verilməlidir, yəni onları hakimiyyətə cəlb edərək, tədricən həqiqəti onlara anlatmaq lazımdır. Buna görə də fiqhdə elmi mübahisə kimi elm növləri vardır, zira təkəbbür göstərmək üçün əvvəl bununla məşğul olurlar, sonradan insan bu məqsədinin nöqsanlı olduğunu anlayır və doğru yola yönələrək islah edilir. Bu, ona bənzəyir ki, məsələn, öz övladımızın hakimiyyətə çatması üçün təhsillə incitdiyimiz zaman oyunlarla, quşlar və digər şeylər almaqla onu bəzən həvəsləndiririk ki, o, əvvəlcə buna, sonra isə son məqsədinə can atsın. Allah-Təala (121) şəriəti və bilikləri qorumaq üçün insanda biliklər qazanmaq yolu ilə hakimiyyətə can atmaq istəyi yaratmışdır. Şagirdi hakimiyyətə və şöhrətə çatmaq arzuları ilə başdan çıxarmaqla bilik qazanmağa sövq etmək insan nəslinin artması və yaşaması üçün Allah-Təala (121) tərəfindən onda yaradılmış iştahaya və cinsi həvəsə bənzəyir. Elmi mübahisənin əgər bu faydası olmasaydı, onda heç bir halda ona icazə verməzdilər, çünki bu, məzhəbin dəyişməsinə və şəxsi fikirlərdən imtinaya gətirib çıxarmır.

Dördüncü vəzifə. Müəllim birbaşa deyil, üstüörtülü yolla qadağan olunan şeyləri qadağan etməlidir, çünki dolayısı yolla qadağan etmək günah sayılan şeylərdən imtinaya daha çox səbəb olur, həmin adama nəyisə birbaşa qadağan etdikdə isə o, həmin şeyi dərk etmək üçün daha çox can atır. Peyğəmbər (122) deyib: «Əgər peyin ovmaq insanlara qadağan olunsa, onda: «Burada nəsə var ki, bizə qadağan etmişlər», - deyə öz işlərinə davam edəcəklər». Adəm (123) və Həvva[44], onlara qadağan olunan şey haqqında rəvayətdə də bu haqda söhbət açılır. Belə deyirlər ki, üstüörtülü söz birbaşa sözdən daha artıq təsir göstərir. Bu ona görədir ki,

nəcib qəlbli insanlar mühakimələrə və gizliləri açmağa sevgi ilə yanaşdığından üstüörtülü, gizli ifadələrə daha artıq hörmət göstərirlər ki, düşünərək özləri əsl mənasını tapa bilsinlər. Üstüörtülü sözlər hörmət pərdəsini qoruyur, açıq sözlər isə bu pərdəni tamam açır və bu da insana itaət göstərməmək üçün cürət verir ki, əgər bu dəfə olmasa da, gələn dəfə o, mütləq zidd gedəcəkdir.

Beşinci vəzifə. Müəyyən bir elmlə məşğul olan insan digər elmləri şagirdlərinin gözündə alçaltmalı deyildir və tez-tez belə hallar baş verir ki, qrammatika müəllimi şagirdlərinə fiqhi pisləyir və onunla məşğul olmağı qadağan edir, qanunşünas alimlər isə dini elmləri yamanlayır və şagirdlərinə bu elmlərlə məşğul olmağı qadağan edir. Yox, müəllim öz şagirdlərinə daha yüksək elmlərin məziyyətlərini göstərməlidir ki, onlar da hal-hazırda öyrəndikləri elmi başa vurduqdan sonra onunla məşğul olsunlar. Müəllim əgər iki elm üzrə biliyə malikdirsə, onda bunlardan birinin tədrisini başa vurduqdan sonra nizamlılıq qaydalarına riayət edərək öz şagirdini gərək digərinin zirvələrinə yüksəltsin.

Altıncı vəzifə. O, yolun başlanğıcında və şagirdlərin dərketmə səviyyələrinə görə onların anlamaq vəziyyətində olan şeylərlə kifayətlənməli, onlarla məlum şeylərin təfərrüatına varmamalı, aşkar şeylərin gizli tərəflərinə daxil olmamalıdır və bütün insanların Müəllimi və Məsləhətçisinə bənzəməyə çalışmalıdır. Peyğəmbərimiz (122) buyurub: «Biz peyğəmbərlərə insanların layiq olduqları şeyləri onlara vermək və onları dərketmə səviyyələrinə görə başa salmaq əmr olunmuşdur». Həm də deyib: «Əgər bir insan adamlara nitqlə müraciət etdiyi zaman onlar bu nitqin bir hissəsini anlamaq vəziyyətində deyillərsə, onda bu hal bu insanların bəzilərinin ürəyində şübhə və həyəcan toxumu səpəcəkdir». Əli (124) də öz sinəsinə işarə edərək demişdir: «Doğrudan da, burada o qədər çox biliklər vardır və mən çox istərdim ki, onları daşıya bilən kəsi tapım». Peyğəmbər (122) buyurub: «İnsanlara onların dərk etdiyi şeylərlə müraciət edin və onların inkar etdiklərini saxlayın. Məgər siz onların Allahdan və Onun Rəsulundan üz döndərmələrini istəyirsiniz?» Allah-Təala da deyib: «Əgər Allah (əzəldən) onlarda bir xeyir (olacağını) bilsəydi, (haqq sözü) onlara eşitdirərdi» (8:23). Bir alimdən nə isə soruşulduqda, o cavab vermədən susmuşdu. Belə olduqda soruşan şəxs: «Məgər sən Allahın Rəsulunun: «Kim faydalı biliyini gizləyərsə, Qiyamət günündə atəşlə noxtalanmış halda gələcəkdir», - sözləri barədə eşitməmi-

sən? Alim: «Noxtanı saxla və çıx get, əgər mənim yanıma başa düşən biri gəlsə və mən ondan öz biliyimi gizlətsəm, onda qoy məni onunla noxtalasınlar, zira Allah-Təala: «Allahın sizə dolanmaq üçün bəxş etdiyi malları səfehlərə verməyin» (4:5), - buyuruğu ilə biliyi korlayan adamdan onu qorumağın və mühafizə etməyin daha mühüm olduğuna işarə etmişdir. Və O daha sonra: «Əgər ağıla dolduqlarını hiss etsəniz, mallarını özlərinə qaytarın», - deyərək işarə etmişdir ki, elmdə müəyyən səviyyəyə çatmış şəxslə birlikdə məlum və aşkardan ta müfəssəl və gizli şeylərə yüksələrək həmin adama həqiqi bilikləri vermək zəruridir. Layiq olan insana bunları verməmək ədalətsiz olduğu kimi, layiq olmayan şəxsə bilik vermək də haqsızlıqdır. Əcdadlarımızdan biri demişdir:

Cahillə öz biliklərini bölən onları itirir,
Ləyaqətli insana isə bunu verməyən haqsızlıq edir.

Layiq olan insandan həqiqi bilikləri gizlin saxlamaq böyük günahdır». Allah-Təala buyurur: «Allah kitab əhlindən: «Siz onu gizlətməyib, insanlar üçün aydınlaşdırmalısınız!» - deyə əhd aldığı zaman onlar bu əhdə dal çevirdilər və bir az qiymətə satdılar» (3:187).

Yeddinci vəzifə. Məhdud şagirdə onun dərk edə bildiyi dərəcədə anlatmaq lazımdır və ona: «Mənim sənə dediklərimdən sonra müfəssəl öyrənmələr və tədqiqlər vardır ki, mən bunları səndən gizlədirəm», - demək olmaz. O, bunu başa düşməyə bilər, buna görə də bunlarla bacarana qədər və daha yüksək pilləyə qalxana kimi qoy elə fikirləşsin ki, bunlar elə hamısıdır. Buradan aydın olur ki, aşkar şeylərə inanan və əxlaqlı, şəriət tərəfdarı olan sadə insanlarla necə rəftar etmək lazımdır: onun inamına qarışıqlıq salmaq və aşkar şeyləri izah etmək lazım deyil, zira bu, onun şəriətdən azad olmaq istəyinə gətirib çıxara bilər və sonra onu geri qaytarmaq mümkün olmaz, şərlə onun arasındakı maneələr yox olar, o, şeytana və yaramaz bir kəsə çevrilər. Lakin onu ibadətin aşkar məsələlərinə, məşğul olduğu peşəsində təmiz olmağa öyrətmək lazımdır ki, Quranda deyildiyi kimi, ürəyi qorxu və pərəstişlə dolsun və onun qəlbinə şübhə toxumu səpilməsin. Əgər şagirdin qəlbində belə bir şübhə yaranarsa və o, bunu həll etmək istəyərsə, onda yalnız sadə sözlərlə – bunlar hətta əsl dəlillər olma-

sa da – bu şübhələrdən onu qurtarmaq lazımdır. Onun qarşısında axtarış və tədqiq qapısı açmaq lazım deyil, çünki bu addım dünyanın çiçəklənməsində və insanlara fayda verməsində onun əməllərinə zərər vura bilər. Bununla kifayətlənmək lazımdır, lakin əgər o, ilahi həqiqətləri qəbul edəcək qədər özünü ağıllı göstərərsə, onda bütün bu şübhələrdən qurtulana qədər ona təhsildə kömək etmək lazımdır. Deyirlər ki, hansısa bir cəmiyyətdə təhsildən əvvəl şagirdin xarakterini öyrənərdilər və əgər onda hansısa bir nöqsan aşkar edərdilərsə, həmin şagirdə təhsil almağı qəti qadağan edərdilər. Onlar deyirdilər ki, bu halda bilik nöqsanlar tərəfindən istifadə olunur və həmin bilik şərin alətinə çevrilir. Lakin əgər şagirdi ləyaqətli sayardılarsa, onda onu bilik evində bağlı saxlayar və elmin bir hissəsi ilə kifayətlənməsindən və onun ruhunun mükəmməl ola bilməməsindən, bununla da həm özünün, həm də başqalarının inamlarına zərər vura bilmək ehtimalından ehtiyatlanaraq sona qədər heç bir yerə buraxmadan orada ona təhsil verərdilər. Buna görə də deyirlər: «Allah-Təala bizi yarımilahiyyatçıdan və yarımtəbibdən qorusun, çünki birincisi imanı, ikincisi dünyəvi həyatı korlayır».

Səkkizinci vəzifə. Şəriət üzrə praktiki bilikləri tədris edən müəllimin sözlərinin əməllərinə zidd olmaması üçün öz öyrətdiklərinə özü əməl etməlidir, əks halda insanlar onun tapşırıqlarından və ağlından uzaq qaçacaqlar, çünki biz əməlləri gözlərimizlə, biliyi isə ağlımızla görürük və gözlə görənlər ağılla dərk edənlərdən çoxdur, buna görə də öz biliyini artırmaqdansa və yaymaqdansa, qoy əməllərini mükəmməlləşdirməyin qayğısını çəksin. Əgər təbib nəyi isə özü qəbul edib həmin şeyi insanlara qadağan edərsə və bunun öldürücü zəhər olduğunu, buna görə də ona toxunmamalarını tapşırarsa, onda onlar düşünəcəklər ki, təbib onları ələ salır, əslində isə bütün şeylərdən daha faydalıdır və təbib bu şeydən yalnız özü istifadə etmək istəyir. Belə olduqda, bu cür qadağalar yoldan azdırma və təhrik etməyə çevrilir. Şagirdin müəllimə nəzərən vəziyyəti gilin möhürə və ya kölgənin budağa nəzərən vəziyyətinə bənzəyir: heç bir şəkli olmayan möhür gilin üzərində necə şəkil sala bilər və ya özü əyri olan budaq necə düz kölgə yarada bilər? Buna görə də belə deyirlər ki:

Özün tərk etmədiyin şeyi başqalarına etmə qadağan,
Əgər sən belə etsən tamam rüsvay olarsan!

Allah-Təala (121) da buyurur: «Siz insanlara yaxşı işlər gör-

mələrini əmr etdiyiniz halda, özünüz unudursunuz?» (2:44). Həm də deyirlər ki, alimin günahı bir başqasının günahından daha ağırdır, ona görə ki, o, başqalarına nümunə göstərir. Peyğəmbərimiz bu barədə deyib: «Kim pis işlər görərsə, o həm bunun əzabını və həm də onun arxasınca gedənlərin əzabını ta Qiyamət gününə qədər çəkəcəkdir». Hər kim ki günah əməllər sahibidir, iki şeyi etməlidir – bu əməli tərgitməli və başqalarına göstərməməlidir, əgər o, bu əməli tərgidərsə, onda hər iki vəzifəni, əgər onu başqalarına göstərməzsə, onda yalnız bir vəzifəni yerinə yetirmiş olur. Buna görə də Əli (124) deyib: «Məni iki cür adam öldürür: birincisi, mömin cahil və digəri əxlaqsız alim, çünki cahil öz möminliyi ilə, alimsə öz əxlaqsızlığı ilə başqalarını cəlb edir».

## ZƏNGİNLİYİ ƏLDƏ ETMƏK VƏ BU ZAMAN DİQQƏT YETİRİLMƏLİ OLAN ŞEYLƏR HAQQINDA

Bil ki, dünyəvi həyata bağlılıq – bütün səhvlərin bünövrəsidir, bu fani həyatda nə əkiriksə, axirət dünyasında da onu biçəcəyik və bunda həm faydalı nemətlər, həm də öldürücü zəhərlər mövcuddur. O elə bir ilana bənzəyir ki, ovsunçu onun zəhərini götürür və ondan padzəhr düzəldir, cahil adamsa buna səy göstərərsə, onun xəbərsizliyi ucbatından ilanın zəhəri onu öldürər. Belə deyirlər ki, zənginlik orta nemətlərdən biridir, çünki o bir tərəfdən fayda, digər tərəfdənsə ziyan gətirir və onun məhvedici tərəfini unudaraq, yalnız faydalı tərəfini diqqətə almaq olmaz. Bunun əsası isə həmin zənginliyin hansı məqsədə yaranmasını bilməkdir, çünki hər bir şeyin bünövrəsi – şeylərin həqiqi mahiyyətini dərk etməkdir və biz deyirik ki, axirət dünyasındakı səadətə can atan hər bir kəsin üzərində həm gəlir, gəm də xərc tərəfdən müəyyən vəzifələr vardır. Qazanılan şeylərin yaxşı cəhətləri, onun əldə olunmasındakı niyyətlə müəyyən olunur.

Birinci vəzifə zənginliyin rolunun dərk olunmasıdır. Biz artıq demişdik ki, insan üç şeyi – ruhi, sonra cismani, sonda zahiri şeyləri əldə edir. Zahiri şeylər öz mövqeyinə görə ən aşağılardır və zənginlik də zahiri olanlardandır. Bunun da ən aşağı mövqedə olanları dirhəm və dinarlardır, çünki bunlar digərlərinin xidmətçiləridir və onların özünə isə heç nə xidmət göstərmir, zira ruh biliyin və ruhi məziyyətlərin əldə olunmasına xidmət göstərir, bə-

dənsə ruha qulluq edir və onun aləti rolunu oynayır; qida və paltar bədənə xidmət göstərir, dinarlar və dirhəmlərsə qidaya və geyim şeylərinə xidmətdədir. Biz artıq bunu da demişdik ki, qidanın təyinatı bədənin həyatının davam etməsidir, bədənsə özünükamilləşdirməyə yardım edir. Bu ardıcıllığı dərk edən və bunu qiymətləndirən insan pulun dəyərini bilir və yalnız kamilləşmə üçün zəruri olduğuna görə bu dəyərin mövcud olduğunu anlayır. Şeylərin təyinatını bilən və onları bu təyinata görə istifadə edən hər bir kəs bütünlüklə deyil, yalnız bu məqsədə çatmaq üçün lazım olan miqdarla kifayətlənərək bu məqsədə səy göstərir. Bu zaman həmin şəxs Allah-Təalanın (121) gah: «Bilin ki, mal-dövlətiniz və övladınız sizin üçün (Allah qarşısında) ancaq bir imtahandır» (8:28), - deyərək bu zənginliyi pislədiyini, gah da: «O, sizə mal-dövlət, oğul-uşaq əta edər» (71:12), - sözləri ilə təriflədiyini görərək şübhəyə düşə bilər. Axirət səadətinə çatmaqda bir vasitə kimi zənginlik nemətdir, lakin axirət həyatından insanı yayındırdığına görə pis şeydir. Buna görə də Peyğəmbər (122) buyurur: «Allaha yalvarırıq ki, bizi yarımçıq ilahiyyatçıdan və yarımçıq təbibdən qorusun, zira birincisi insandakı imanı, ikincisi isə dünyəvi həyatımızı puç edir». Buna görə də Peyğəmbər (122) soruşur: «Hansı nemət təmiz mal-dövlətdir?» Allah-Təala (121) cavab verir: «Ey iman gətirənlər! Nə mal-dövlətiniz, nə də oğul-uşağınız sizi Allah zikrindən yayındırmasın! Hər kəs bunu etsə (Allahı yada salmasa), belələri əsl ziyana uğrayanlardır» (63:9). Öz heyvanına çovdar yığan, sonradan isə nə etməli olduğunu unudaraq çovdarları bir-bir sayan adam axı necə ziyanda olmaya bilər? O, öz ətrafına hündür divar çəkir, heyvan isə acından ölür və bu, dünyəvi həyatın insanı axirət dünyasından necə ayırdığı və yetirdiyi zərər barədə bir örnəkdir, lakin bu cür hərəkət bütün insanlara məxsusdur ki, dünyəvi həyatın gözəlliyinə tamahsılanaraq özünü bütünlüklə ondan həzz almağa sərf edir. Belə bir ibrətamiz rəvayət də vardır ki, bir neçə nəfər gəmi ilə gözəl bir ölkəyə, orada yüksək mövqe tutmağa gedirlər, lakin gəmi onları şirlər və pələnglər qaynaşan bir adaya gətirir. Əmr edirlər ki, hamı təmizlik işlərinə görə adaya çıxsın və bununla birlikdə onlara adadakı təhlükə barədə xəbərdarlıq da olunur. Bu adamlar orada gözəl daş və qönçə gül görürlər – bunlar onların çox xoşuna gəlir və bu şeylərə ehtirasla vurulurlar. Bu üzdən də gəmini və gedəcəkləri yeri unudaraq çox uzağa gedirlər. Onlar gəmi yola düşüb gedənə qədər və gecə düşənəcən şadlanır

və oynayırlar. Gecə onların üzərinə şirlər hücum çəkir və nə daşlar, nə də qönçə güllər onların köməyinə çatmır. Həmin adamlardan biri: «Kaş (bu əzabı görməmək üçün) torpaq olaydım» (78:40), digəri: «Mal-dövlətim mənə heç bir fayda vermədi. Mülküm, səltənətim də məhv oldu getdi!» (69:28-29), üçüncüsü isə: «Allaha itaət barəsində etdiyim təqsirlərə görə vay halıma!» (39:56), - qışqırır. Tövbə və təəssüf etməkdən, ilanlarla qonşuluqdan, biabırçılıqdan və nümunəvi cəza çəkməkdən başqa heç nə qalmır və bu göstərdiyimiz misal dünyəvi həyatın ləzzətlərinə aldananlara ünvanlanmışdır. Allahın (121) dostu İbrahim (123) bu cür böyük bir təhlükədən qorunmaq üçün yalvarmışdır: «Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə!» (14:35). Bütlər dedikdə, o, qızılı və gümüşü nəzərdə tutmuşdu, çünki peyğəmbər sadə daşlardan düzəldilmiş şeyləri allah saymaqdan çox uzaqdır. Buna görə də Əli (124) deyirdi: «Ey qırmızıca, məni deyil, başqalarını yoldan azdır, ey ağca məni deyil, özgələrini yoldan çıxart». Buna görə də Peyğəmbər (122) dinarlara və dirhəmlərə can atanları, onlara vurulanları bütlərə sitayiş edənlərə oxşadaraq demişdir: «Dirhəmlərin qulu olan, köləsi olan bədbəxtdir və əgər o, bu bədbəxtliklərdən şəfa tapmazsa, bu tikan ona batarsa, heç kim onu çıxarmayacaqdır».

İkinci vəzifə gəlirlərin və xərclərin qayğısını çəkməkdir. İnsan özü qazandıqda, ya da bəxti gətirib gözlənilmədən hədiyyə və ya vərəsə aldıqda, xəzinə tapdıqda bunlar gəlir hesab olunur. Əmək haqqının üsulları məlumdur. Şəriət tərəfindən günah sayılan mənbədən götürən şəxs yalnız elə oradan götürməlidir. Düzgün yollar da şəriətdə məlumdur. Əgər o, nəsə faydalı və icazəli bir şey taparsa, qoy onu götürsün. Lakin əgər həmin şey bütün tərəflərdən qadağan olunmuşsa, onda kənar olsun. Əgər tapdığı bir şeyin qadağan olunmuş olması ehtimalı vardırsa və əgər o, icazəli bir mənbədən götürə bilərsə, qoy o, birincidən imtina etsin. Belə ki, toxunulmaz bir şeyin qoruyucusu onun hüdudlarını pozmağa yaxındırsa və əgər onun icazəli mənbələrdən götürə bilmək ehtimalı yoxdursa, hətta icazəli mənbələrdən yalnız böyük zəhmətlərdən və uzun zamandan sonra götürə bilmək ehtimalı varsa, qoy o, bu icazəli olmayandan ona lazım olan qədər götürsün. Əgər o, fiziki əməklə məşğul olan qulların sırasındandırsa, onda icazəli (halal) şeyi əldə etmək üçün qoy işləsin, ona görə ki, halalı qazanmaq üçün çalışmanın özü də digər ibadətlər kimi bir ibadətdir.

Lakin əgər o, ürəyi və biliyi olan şəxslərdəndirsə, onda təmiz halal əldə etmək üçün vaxtını itirməli olacaqdır və bu da həm ona, həm də məşğul olduğu işə zərər vuracaqdır, buna görə də həmin şəxs olan şeylərdən özünə lazım olan qədər götürə bilər, belə ki, qadağan olunan şey daha böyük təhlükə altında icazəli olana çevrilə bilər, buna görə də, yemək tikəsi boğazında qalan adam ölməsin deyə spirtli içki qəbul edə bilər[45]. Bilik və ürəyin əməli də başqa şeylə müqayisə oluna bilməz, hər bir şey buna xidmət edir. Bu, başqasına məxsus olan bir şeydən özü üçün istifadə etməyə, hətta müəyyən hallarda donuz əti yeməyə də bənzəyir. Bu dediklərimiz insanların bilik əldə etmələri üçün onlara şübhəli şeylər xüsusunda verilən icazəyə də aiddir. Ola bilər ki, cahillər burada qəti etiraz edib: «Əgər alim bunu yeyibsə, nəyə görə biliksiz adama qadağan edilir?» - deyə bilər. Həmin adam onun özünün dəqiqəsi ilə alimin dəqiqəsi arasındakı fərqin böyüklüyünü başa düşmür və alim də bu zaman diqqətli olmalıdır ki, şeytanın ipini tərpətməsin.

Üçüncü vəzifə götürülən şeyin miqdarında mötədillik göstərməkdir. Sən artıq bilirsən ki, götürülən şeyin miqdarı böyük məna kəsb edir. Sənin geyimə, evə və qidaya ehtiyacın vardır və bunların hər birinin də aşağı, orta və yüksək pillələri vardır.

Mənzilin ən aşağı pilləsi karvansara, məscid və bu kimi çəpərlənmiş müəyyən torpaq sahələridir. Onun orta pilləsi dar olmayan və istədiyin zaman bir otağında tək qala bildiyin, bütün ömrün boyu yaşaya biləcəyin bir şəxsi əmlakdır ki, bu da abadlıq səviyyəsinə və otaqların sayına görə ən aşağı bir dərəcədir – bu, varlılığın hüdududur. Ən yüksək pillə isə çoxlu otaqları və əlavələri olan geniş, böyük və gözəl evdir ki, bunları dünyanın güclü şəxslərində və vəzifəli adamlarında görürük. Birincisi zərurilik pilləsidir, zira mənzil – vəhşi heyvanlardan qorunmaq üçün divarlarla sərhədlənmiş, günəşin yandırıcı istisindən qorunmaq üçün damla örtülmüş torpaq sahəsidir yalnız ürəkdən Allaha (121) etibar edənlər bununla kifayətlənirlər. İkincisi kafilik pilləsidir və bunun hüdudlarından kənara çıxmaq imanın hüdudlarından çıxmaq, fani dünyaya bağlılıq deməkdir, mən bu halda həmin adamın bu dünyanın gözəlliyinə batıb qalmasını nəzərdə tuturam. Bu cür mənzildə laqeyd insanlarla bir yerdə yaşamaq, bundan həzz almamaq və sakitləşmək icazə verilən şeylərdəndir. Lakin buranın gözəlləşdirilməsinə vaxt sərf etmək sadə adamların işidir, bu, sadə adamları cahil sayan və onları təhsis etməyin mümkün olmadığını

deyən fiqhin rəyinə görədir, lakin təsəvvüfün rəyinə görə, bu, qadağandır, təsəvvüf dedikdə, mən insanın yalnız Allaha (121) yaxın olması və ibadət üçün yarandığını nəzərdə tuturam. Buna görə də deyirlər ki, sufilərə görə, icazə verilən şeylər zəruridir, zəruri olan şeylər isə onlar üçün icazəlidir, daha doğrusu, onlar icazəli şeylərdən yalnız lazım olan qədər miqdarla kifayətlənir və həmişə zəruri olana icazə verilən qədər riayət edirlər və bu, onlar üçün icazə verilən kimidir.

Qida isə çox vacib bir əsasdır, çünki mədə həm yaxşıya və həm də pisə bir açardır. Bunun da üç pilləsi vardır ki, ən aşağı pilləsi zəruri olanıdır, bu da yaşamaq və ibadət üçün insanın gücünü saxlamağa kifayət edən qida miqdarıdır. İnsan özünü getdikcə daha aza qane etməyə alışdıraraq bu miqdarı azalda bilər və nəticədə on və ya iyirmi gün ac qalmağa adət edə bilər. Bəzi tərkidünyalar gündə yalnız bir noxud dənəsi ilə kifayətlənə bilirlər, bəziləri isə iyirmi gün, bəzən deyirlər ki, hətta qırx gün yeməkdən dayana bilirlər, bu isə elə yüksək bir pillədir ki, çox az adam buna nail ola bilər. Əgər insan bununla kifayətlənə bilmirsə, onda onun üçün əvvəllər dediyimiz kimi, mədəsinin üçdə ikisini təşkil edən ikinci pillə nəzərdə tutulur. İnsan gərək şəriətin təyin etdiyi həddi keçməsin, çünki bu artıq acgözlük kimi qəbul olunacaqdır. Hər bir şeydə orta miqdarla qane olan kəs necə də xoşbəxtdir, lakin həmin orta miqdar müxtəlif zamanlarda müxtəlif ola bilər, insan bəzən öz qidası haqqında düşünmür və bəzən də onun qayğısını çəkir. Bu, onunla sona yetə bilər ki, həmin şəxs fikrində özünə uzun ömür tutar və ürəyini ömürlük azad etmək istəyində olar. Ola bilər ki, sonradan ehtiyac əmələ gələr və o, ehtiyat yaradaraq özünü təmin etmək istəyər – bu isə böyük aldanmadır. Gələcək üçün ehtiyat üç cür olur: bunlardan ən kiçiyi bir gecə-gündüz üçün qida ehtiyatıdır, ən böyüyü bir ildən artıq müddətə ehtiyat, orta ehtiyat isə bir il müddətinə olan qidadır. Ən yüksək pillədə olan şəxs yalnız sabahkı gününü düşünən və öz səylərini yalnız bir gün üçün qida ehtiyatına sərf edən insandır, həmin şəxs sonradan bu ehtiyatı bir gündən bir saata, bir saatdan bir nəfəs almağa sərf olunan müddətə qədər azaldır və yola hazırlanır, çünki düşünür ki, o, hər bir an bu dünyanı tərk edə bilər. Bununla məşğul olmayan və özü üçün bir illik qidadan daha çox ehtiyat yığmaq üçün çalışan insan rədd olunmuşlardandır və belələri barədə deyilmişdir: «Və elə zənn edər ki, mal-dövləti onu əbədi yaşadacaqdır» (104:3).

Geyimə gəldikdə, bunda da üç pillə vardır: miqdarca ən azı – auratını[46] və ya bədənin örtülməsi qəbul olunan yerlərini gizlədən, ən qaba və pis parçadan tikilmiş bir geyimdir ki, geyilmə müddəti də bir gecə – gündüz üçün nəzərdə tutulur. Ömər (124) haqqındakı rəvayətlərdən birində söylənir ki, o, öz paltarına ağac yarpaqlarından yamaq saldıqda ona: «Bu, çox davam etməz», - dedikdə, o: «O dağılana qədər mən yaşayacağammı?» - deyə cavab vermişdir. Geyim üçün orta pillə şəxsin mövqeyinə uyğun olan, təmtəraqsız, ifratçılıq olmayan, ipək kimi qadağan olunmuş parçadan istifadə olunmadan hazırlanan paltardır. Geyimin ən yüksək pilləsi paltar toplamaq və geyimdə lazım olmayan şeylərə səy göstərməkdir ki, bu, dünyəvi həyatdakı insanların çoxuna məxsus bir haldır.

Qadınlarla əlaqələrə gəldikdə, bunun sayca miqdarı buna səy göstərənlərin arzularına görə artır və buna nisbətdə ehtiyac da çoxalır. İntim əlaqələrdə nəyin yaxşı, nəyin pis olduğu barədə biz artıq söhbət açmışdıq və bu deyilənlər inandırıcıdır. Əgər intim əlaqələrdə özü üçün kafi sayılan miqdarı tapmaq xoşbəxtliyinə nail olan, buna baxmayaraq, daha çoxunu axtaran təkcə mağmun deyil, həm də lənətlənmiş adamdır. Peyğəmbər (122) buyurub: «Səhərlər sakit ürəklə, sağlam bədənlə yuxudan duran, qarşıdakı gün üçün yeməyi olan insanın bu dünyada hər şeyi vardır». Bu ona görədir ki, dünyəvi həyat insanı axirətə aparır və bu miqdar məqsədə çatmaq üçün ona kifayət edir, qalanları isə artıq şeylərdir və ağıllı adam üçün onların olması ilə olmaması eyni şeydir.

Dördüncü vəzifə gəlirlər və xərclər xüsusundakı qayğılardır. Gəlirlər vacib olduğu kimi, xərclər də vacibdir və burada nizam-intizama diqqət vermək lazımdır, belə ki, həm gəlirlər və həm də xərclər təriflənən və pislənən formalarda olurlar. Bunlardan tərifli olanı insanı ədalətli edəndir, bu, zəruri sədəqələr və öz ailəsini dolandırmaq üçün çəkilən xərclərdir. Bunların arasında eləsi var ki, insanı azad və səxavətli edir, bu zaman insan şəriətdə göstərilən kimi, başqalarını özündən yüksəkdə tutur. Pislənənlər də iki cür olur ki, bunlar da sui-istifadə və xəsislikdir. Sui-istifadə (ifrat) – lazım olandan artıq xərcləməkdir və belə olduqda həmin adamın var-dövləti lazım olmayan şeylərə davam gətirmir, bu, bədxərclikdir və ən vacib olanı unudaraq ondan aşağı işlərlə məşğul olmaqdır. Xəsislik (təfrit) – insanın lazım olan zəruri xərclərdən imtina edərkən və onun mövqeyinə uyğun olan ölçünü azaldan zaman gö-

stərdiyi simiclikdir. Əgər qul icazə veriləndən götürərsə və bu cür şeyə xərcləyərsə, bu, yaxşı hesab olunur və buna görə əvəzi veriləcək. Əgər sən Allahın (121) bəxtli yaratdığı və var-dövlət verdiyi insanlar barədə soruşsan və həmin şəxslər üçün almağın, yoxsa verməyin daha yaxşı olduğunu öyrənmək istəsən, bil ki, belə vəziyyətlərdə insanlar üç qismə bölünürlər: birincisi özlərini bütünlüklə bu dünyaya həsr edərək axirətlərini unudanlardır ki, bunlar çoxluq təşkil edirlər. Allahın (121) Kitabında beləbləri bütpərəstlər, heyvanların ən pisləri və s. kimi adlandırılmışlar. Digər qisim insanlar əvvəlkilərin tam əksi olanlardır – onlar bütün ruhları və bədənləri ilə axirət həyatına tərəf yönəlmişlərdir və dünyəvi həyata heç bir fikir vermirlər. Üçüncü qisim bunların içərisində ən yaxşılarıdır, onlar ortadadırlar və hər iki Mənzillərini diqqətdə saxlayırlar. Bütün peyğəmbərlər bunların arasındadır, çünki Allah (121) onları Özünün bütün qullarının həm indiki, həm də ki gələcək həyatlarında faydalanmaları üçün göndərmişdir. Belə deyirlər ki, Allah-Təalanın (121): «Siz (ey insanlar) üç zümrəyə ayrılacaqsınız. Sağ tərəf sahibləri. Kimdir onlar?! Sol tərəf sahibləri. Kimdir onlar?! Və bir də öndə olanlar, öndə olanlar! Bunlar (Allah dərgahına, Allahın lütfünə və mərhəmətinə) yaxın olanlardır. Bunlar Nəim Cənnətlərində olacaqlar» (56:7-12). Bu dünyanın işləri ilə məşğul olan və dini təyinatları lazım olan formada yerinə yetirən, onları birləşdirən insan – Allahın (121) yer üzündəki Elçisi bütün insanların ən yaxşısıdır. Əgər sən: «Axı Allah-Təala (121): «Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!» (51:56) – buyurub», - deyə soruşsan, onda bil ki, qulların faydası üçün qayğılanmaq ibadətin bir növüdür və ibadətlərin ən yaxşısıdır. Peyğəmbərimiz (122) buyurub: «Bütün yaradılanlar Allahdan asılıdırlar və onun qulları üçün başqalarından daha faydalı olan insanı Allah başqalarından daha çox sevir». Əgər sən: «İnsanlar üç cür olurlar: birincisi bu dünyasının zərərinə gələcək həyatı üçün çalışanlardır – onlar uduşdadırlar. İkincisi bu dünyadakı həyatı onu gələcək həyatından uzaqlaşdıranlardır – beləbləri məhv olmuşlardır. Üçüncüsü hər ikisi ilə məşğul olanlardır – belə insanlar təhlükəyə məruz qalır və risk edirlər, buna görə də qalib olmaq təhlükəyə məruz qalmaqdan daha yaxşıdır», - desən, bil, bunun sirri də ondadır ki, yalnız təhlükələrə üstün gələnlər necə yüksək mövqeyə nail ola bilərlər. Bu da insanları mühafizə etmək üçün və

Allahın (121) qullarının diqqətini Onun canişinliyinə yönəltmək üçün deyilibdir ki, kim həmin şeylərə qabiliyyətli deyildirsə, bunlara yaxın düşməsin.

Belə rəvayət edirlər ki, ədalətli bir hökmdarın öz biliyi və müdrikliyi sayəsində yüksək vəzifə tutmuş oğlu tərkidünyalığa üz tutmuş və dünyəvi həyatdan üz çevirmişdi. Bir padşah ona aşağıdakı məzmunda məktub yazır: «Bizim malik olduğumuz şeylərdən sən imtina etdin və əgər sənin seçiminin bizimkindən daha yaxşı olduğuna əminsənsə, onda xəbərdarlıq etmək üçün bizə bu barədə danış və əsaslı sübutlar olmadan sənin dediklərinə inanacağıma bel bağlama». O isə belə cavab verir: «Bil ki, biz Mərhəmətli Allahın qullarıyıq və O, bizi düşmənlərlə vuruşmaq üçün göndərmiş və məqsədi – ya qalib gəlmək, ya da ondan yaxa qurtarmaq – də aydın göstərmişdir. Biz hücum etdiyimiz zaman üç qismə bölündük: birinci qisim qorxaqdır ki, düşməndən qurtulmaq istəyir və buna görə də kənara çəkilir. Onu heç kim qınamır və təriflәmir. İkinci qisim ağılsız və ehtiyatsız şəxsdir ki, heç bir şey düşünmədən irəli atılır nəticədə düşmən onu yaralayır və ona qalib gəlir, bununla da öz ağasının qəzəbinə düçar olur. Üçüncüsü isə – cəsarətli, eyni zamanda hücum zamanı hiyləgərdir ki, bütün qüvvəsi ilə döyüşür və igidliklə vuruşur – bu, əsl qalibdir. Əgər məni zəif və qələbə üçün ən kiçik səy göstərən birisi hesab edirsənsə, onda, ey şah, sən özün Allah tərəfindən ən çox sevilən yaxşı qisim insanlardan ol». Bu sözlər həqiqəti aydınlaşdırır və Allah-Təalanın (121) buyurduğu: «Allahın sənə verdiyindən özünə axirət qazan. Dünyadakı nəsibini də unutma. Allah sənə yaxşılıq etdiyi kimi, sən də yaxşılıq et. Yer üzündə fitnə-fəsad törətməyə cəhd göstərmə» (28:77) – sözlərin doğruluğuna işarə edir. Yaxşılığı müsəlmanlara pul verib onları sevindirmək yolu ilə də etmək mümkündür, lakin bu, çox təhlükəlidir, belə ki, bu, şəxsin ağlı və biliyi hələ tamam möhkəm olmaması səbəbindən bilməyərəkdən özü üçün ziyan olan şeyi edə bilər və bunda (zənginlikdə) gizlənən həmin təhlükənin səbəbinə görə buna çox ciddi yanaşılmışdır.

Beşinci vəzifə – o, götürdüyü və tərk etdiyi zaman niyyəti xeyirli olmalıdır, o, ibadəti üçün ona kömək edən şeyi almalıdır və ibadəti üçün ona qüvvə verən şeyi yeməlidir. O, mötədillik göstərərək, imtina və nifrət edərək tərk etdiyi şeyi tərk etməlidir, çünki Peyğəmbər (122) buyurub: «Şəxs Sünnədə yazılan şəkildə özünə qida axtararsa onda bu, onun cihadıdır». O, (122) İbn-Məsuda de-

mişdir: «Doğrudan da, mömin adam hər şeydə, hətta öz əliylə qadınının ağzına yaxınlaşdırdığı bir tikə yeməyə görə də mükafatlandırılır». Mömin dedikdə, o, (122) bunun mahiyyətini bilən və etdiyi hər bir şeydə Allaha (121) yaxın olmaq niyyətində olan və yaxud Onun (121) yolu ilə getməyə kömək edən şeyləri axtaran adam nəzərdə tutulur. Buradan aydın olur ki, zahid heç də heç bir şeyi olmayan şəxs deyildir, əslində, bütün dünyanın var-dövlətinə sahib olsa da, ona bağlanmayan şəxsdir, buna görə də Əli (124) deyib: «Əgər insan bütün yer üzündə olan şeylərin hamısını götürərsə və bunu Allahın adı ilə edərsə, o yenə də arzulayan şəxs olmayacaqdır». Qoy sənin bütün hərəkətlərin və dayanmaların Allahın (121) naminə və ona ibadət etməklə, ya da bu ibadətə kömək edən şeylərlə əlaqədar olsun, çünki qul bunlarsız keçinə bilməz, məsələn, heç bir insan qida qəbul etmədən və ehtiyacını təmin etmədən dolana bilməz, bunlar, əslində, ibadətdən çox uzaq olmasına baxmayaraq, ibadət üçün zəruri şeylərdir. Mükəmməl ruha malik olan insanın bu halda dünyəvi həyata münasibəti ilanı tutan, onun zəhərindən qorunaraq ondan yalnız vacib olanını götürən ustad ilanovlayana bənzəyir. Cahilsə ona oxşamağa çalışaraq həmin şəxsin ilanın yalnız zahiri görkəmi və zahiri görünüşünə meyllənib, onu sığallayaraq və ünsiyyətdə olaraq əlinə götürdüyünü görür və bu cür düşünür. Əgər o, bu cür düşünərsə və onun hərəkətini təkrar edərsə, ilan onu öldürər. Dünyəvi həyatı da bununla müqayisə edərək deyirlər: «Fani dünya toxunduqda yumşaq görünən, lakin ölümcül zəhər buraxan ilan kimidir». Kor adamın görənin ardınca hər şeyi təkrarlaması, dağların zirvəsini və dənizləri fəth etməsi, dolanbac cığırlarla hərəkət etməsi mümkün olmadığı kimi, biliksiz insan da kamil şəxsin ardınca onun dünya həyatı ilə rəftarını təkrar edə bilməz. Əgər sən Süleymanın (123) var-dövlətinə və ona əta olunan peyğəmbər mövqeyinə nəzər yetirsən, başa düşərsən ki, zahidlik mövqedə deyil, ruhda olur. Dünyəvi həyat peyğəmbərlərə və Allaha (121) yaxın olanlara necə zərər vura bilər, axı onlar bu həyatın daşıdığı zərəri və faydanı, onun mövqeyini yaxşı anlayırlar və bilirlər ki, insan öz mövcudluğunda üç pilləni – anasının qarnında, bu dünyanın açıq məkanında və ölümdən sonrakı həyatda – keçir.

Dünyəvi həyat insanlar üçün bir karvansaradır. Səyyah buraya ikinci pillədə çatır və bu zaman artıq onun üçün vasitələr, zaman və qida hazırlanmış olur ki, bunlar onun istifadəsində olsun və ona

kömək etsin. Həmin səyyah burada borc olaraq götürdüyü şeyləri aldığı zaman bunları şükür edərək qəbul etsin və özündən sonra gələnlərin istifadə edə bilməsi üçün saxladığı zaman ürək rahatlığı ilə saxlasın. Lakin bir dəfə bu karvansaraya səfehlər gəlir və belə düşünürlər ki, bu karvansara guya onların öz doğma evidir və verilən şeylər müvəqqəti və borc kimi deyil, həmişəlik bir hədiyyə şəklində verilir və onlar bu şeylərdən elə yapışırlar ki, yalnız qollarını sındırdıqdan və yaxud canını aldıqdan sonra bunları onların əllərindən bunları qoparıb almaq olar. İnsanın mövqeyini və ona bu dünyada verilən şeyləri növbəti bir misalla göstərmək olar: bir şəxs böyük ev inşa edərək onu qonaqlar üçün hazırladıqdan sonra buraya qonaqları tək-tək dəvət etməyə başladı. Qonaqların biri gəlir və qızıl qab, onun da içərisində gözəl iyli maddə və ətirlər gətirirlər ki, qonaq bunları iyləsin və özündən sonra gələcək qonaqlar üçün saxlasın, özü ilə götürməsin. Lakin qonaq bu qaydanı bilmir və belə qərara gəlir ki, bunlar ona hədiyyə verilir, ondan bu şeyləri geri qaytarmasını tələb etdikdə, o narazı qalır, bunu ürək ağrısı ilə qarşılayır və əzab çəkir. Lakin qaydaları bilən şəxs bunlardan istifadə edir və buna görə təşəkkürünü bildirir, sonra isə sakitcə geri qaytarır. Bunlar dünyəvi həyatda əmlaka aid olan birbaşa vəzifələrdir.

## DÜNYƏVİ HƏYATDA KƏDƏRDƏN QURTULMAQ YOLLARI HAQQINDA

İnsan ruhən sakit və bədəncə sağlam olduqda acmır, bu zaman onun dünyəvi həyatdan ötrü çəkdiyi kədər onun dar düşüncəli və səfeh olduğuna görədir, ona görə ki, kədər insanda aşağıdakı üç səbəbin birindən doğur: o ya olub keçmiş bir iş üçün təəssüf hissi keçirir, ya gələcəkdən qorxur, ya da hal-hazırda mövcud olan səbəbə görə kədərlənir. Əgər bu keçmişə görədirsə, onda ağıllı adam başa düşür ki, olub keçən bir iş üçün kədərlənmək səfehlikdir, axı sınanı yapışdırmaq, qırılanı düzəltmək mümkün olmadığı kimi, bu işdə də heç bir şey etmək mümkün deyil. Allah-Təala (121) buyurub: «Bu, sizin əlinizdən çıxana kədərlənməməyiniz və sizə verilənə də sevinib qürrələnməməyiniz üçündür» (57:23). Bir şair də deyib: «Məgər qəm-qüssə mənə şöhrət gətirir? Onda mən kədərlənəcəyəm». Əgər bu kədər indiki zaman üçündürsə, onda

bu ya onun tanıdığı adamlardan hansınasa verilən nemətə görə paxıllıqdan irəli gəlir, ya öz kasıblığına görədir, ya da mövqeyini, zənginliyini və başqa dünyəvi həyat vasitələrini itirməkdən yaranmışdır. Bunun da səbəbi onun fani dünyanı bilməməsidir, əgər o, ürəkdən bunu bilsəydi, onda Allah-Təalaya (121) minnətdarlıq edərdi ki, onu ağır yük altında gedənlərdən deyil, yüngül və asan yeriyənlərdən biri kimi yaratmışdır. Əgər məhəbbətə düçar olmuş bir şəxs onun vurulduğu gözəlliyin sonda nəyə çevriləcəyini düşünsə, onun məhəbbəti soyuyardı, ona görə ki, bu dünyanın özündə çətinliklər daşıdığını, onun suyunun bulanıq olduğunu, hər bir parçasının bədbəxtliklər gətirdiyini anlayardı. Hər bir insan istənilən anda üç oxun – qisas oxunun, bədbəxtlik oxunun və ölüm oxunun qurbanı ola bilər. Onlar bir-birilə yarışır, bəzən səhv edir və bəzən də hədəfi vururlar. Hər kim ki, öz təcrübəsindən anlayırsa ki, bu dünyada hər gün kimsə özünün malik olduğu şeylərdən məhrum olur, həmişə insanların başına bədbəxtliklər gəlir və bütün bunlara görə onlar nə qədər kədərlənirlər o zaman həmin şəxs nəsə itirdikdə təəssüflənməyəcəkdir. Buna görə də bir nəfərdən: «Sən nəyə görə kədərlənmirsən?» – deyə soruşulduqda, o: «Ona görə ki, itirdiyim zaman məni kədərləndirə biləcək heç nəyim yoxdur», - deyə cavab verdi. Əgər bir şəxs fani həyatdakı insanların axirət həyatına münasibətdə necə laqeyd olduqları haqqında və bu həyatdakı bədbəxtliklərin sayı barədə düşünsə, onda sakitləşər və yüngülcə ondan imtina edər.

Bir sufi hər gün xəstəxanaya gedərək xəstələrin mərəzlərini və çəkdikləri ələmi görməyi, soltan həbsxanasına gedərək canilərə və onların edama necə aparıldıqlarına tamaşa etməyi, qəbiristanlığa gedərək mənasız olaraq kədərlənən – ölmüşləri axı diriltmək olmaz – adamlara baxmağı özü üçün gündəlik vəzifə olaraq seçmişdi. Daha sonra isə o, evə qayıdaraq bütün günü ona verilən böyük nemətlərə və həmin bədbəxtliklərin heç birinin ona üz vermədiyinə görə Allaha (121) dua edir, Ona (121) öz mərhəmətinə görə minnətdarlığını bildirir. İnsan da dünyəvi həyatda mövcud olduğu bütün müddət ərzində özündən aşağı vəziyyətdə olanlara baxmalıdır ki, öz mövqeyinə görə minnətdar olsun, dində isə özündən mövqecə yuxarıda olanlara nəzər yetirməlidir ki, həmin mövqelərə yüksəlmək üçün özü də cəhd göstərsin. Şeytan insanın ağlına hakim olduqda isə bu baxış alt-üst olur və özünün əksinə çevrilir. Əgər insandan: «Sən nəyə görə bu pis əməli edirsən?» -

deyə soruşulduqda, o, özünə bəraət qazandıraraq başqa birisinin bundan daha pis əməlləri həyata keçirdiyini söyləcəkdir, lakin günahda və imansızlıqda müqayisə ola bilməz. Əgər ondan soruşulsa ki, nəyə görə özündə olan şeylərlə kifayətlənmir, o cavab verəcək ki, digər kimsə ondan daha varlıdır və həmin adam «onun dözdüyünə dözməmişdir». Bu isə yanlış fikirdir və tam cahillikdir. Kədər bu cür nöqsanla rastlaşdığı zaman paxıllıq səbəbindən həmin ələm yoxa çıxacaqdır. Əgər Allah (121) layiq olan bir kimsəyə öz şəfqətini əta edibsə, həmin şəxs kədərlənməyəcəkdir, əgər o, buna layiq deyilsə, bu, ona faydadan daha çox ziyan gətirəcəkdir. — KEÇMİŞƏ AİD KƏDƏR

Əgər kimsə gələcək üçün kədərlənirsə və bu kədər həyata keçə bilməyən və ya ölüm kimi mütləq baş verməli olan bir şeyin səbəbindəndirsə, onda bunun dərmanı yoxdur. Əgər həmin şeyin həyata keçmək ehtimalı varsa, onda bu şəxs baxmalıdır: əgər bu, ölüm kimi labüddürsə, bu halda kədərlənmək axmaqlıqdır. Lakin əgər ondan qurtulmaq mümkündürsə, bu halda kədərlənmək ağılsızlıqdır, onda o, kədərə boyun əyməməli, diqqətlə düşünərək hərəkət etməlidir. Əgər bundan yaxa qurtarmaq üçün o, əlindən gələni edərsə, Allahın (121) qərarını və Onun sərəncamını gözləyərək, Allahın (121) qərarından qaçmağın mümkün olmadığını bilərək ürəkdən arxayın olacaqdır. O çəkinmədən sakitcə bunu qəbul edəcək və əmin olacaqdır ki, əvvəlcədən təyin olunmuşdan qaçmaq olmaz və Allahın (121): «Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o bir kitabda (lövhi-məhfuzda) yazılmamış olsun» (57:22) (və ayətin sonuna qədər). Doğrudan da, insanların dünyəvi həyatda daha çox vəsait yığmağa səy göstərməsi təkəbbürlüyün və onların bütün bəlaların ötəcəyinə və xoşbəxt zamanın gələcəyinə ümid bəsləmələrinin bünövrəsidir, lakin təəssüf ki, Əli (124): «İnsanlar başqalarına: «Təskinlik tapın», - dedikləri zaman həmin anda onların zamanını məyusluq gününə qədər gizlədəcəkdir»», - dediyi kimidir. Şair necə də doğru deyib:

> Gecələr, doğrudan da, heç kimə xeyirxahlıq etmirlər,
> Yalnız xeyirxahlıq etdikdən sonra zərər vururlar.

Əbu-Mənsur əl-Səalibi bu fani dünyanı təsvir etdikdə heç bir şeyi nəzərdən qaçırmamışdır:

Fani dünya haqqında unut və onu özünə gəlin seçmə.
Onu özünə gəlin seçmə; onunla evləni o öldürür,

Onun sənə gətirəcəyi sənin ondan istədiyindən
çox dəhşətlidir,
Onun şəri sənin düşündüyündən daha çoxdur.
Onun haqqında çox yazılıbdır:
Yalnız toylarda içilən sulafdır[47]
Və elə bir köhləndir ki, əgər sən
onun tərkinə minərək
Həzz almaq istəsən, onun
nə qədər vəhşi olduğunu görəcəksən.
Gözəlliyi insanları heyran edən qəşəng insanın da
Sirri və nöqsanları vardır.

İdraklı adam da əgər diqqətlə bütün bunları araşdırarsa, öz ürəyini kədərlərin çoxusundan azad edə bilər, əgər onun və sevgilisinin – bunun insan, əmlak, zənginlik, iş, vəzifə, hakimiyyət və ya digər nəsə olmasından asılı olmayaraq – arasında qırılmaz bir bağlılıq varsa, bu halda nə qədər ki, o, bu bağlılığı qırmayıb, kədər və ələmlərdən qurtulmayacaqdır. O, bu şeylərdən yalnız tədricən uzaqlaşaraq başqa nəyisə – hətta bu təzəsi ondan qurtulma vacibliyinə görə əvvəlkinə oxşasa da – özünə cəlb edərək bunu edə bilər və daha yapışqan, daha çirkli şeyi qanla yuyub təmizləmək dəhşətli deyildir. Adətdə olduğun şeydən bir anda qurtulmaq, doğrudan da, çox çətindir və hətta mümkün deyil. Buna görə də özünü aparmaq qaydalarını öyrənən uşağa əsa ilə və quşlarla oyunu vəd verməklə təlim prosesini tədricən inkişaf etdirirlər. Sonra o, zənginliyə, əmlaka, gözəl paltarlara və başqa şeylərə cəlb olunaraq oynamağı tərgidir. Daha sonra isə şöhrətə, tərifə, yüksək mövqeyə və hakimiyyətə həvəslənərək daha da yüksəyə qalxır. Lap sonda isə onu axirət səadətinə həvəsləndirərək daha da yüksəklərə qaldırırlar.

Bu cür müalicə təhlükələrlə və bəlalarla doludur, lakin əgər onu bunlardan daha pis olan şeylərlə müqayisə etsək, onda çox vacibdir və bu sanki insanın bir-birinin ardınca dəf edərək qalxdığı həyat dövrləri və pillələridir və bu tədriclik qaçılmazdır. Həmin insan qoy bunu onun ruhuna sahib olmuş və onunla möhkəm bağlı olan bütün keyfiyyətlərə münasibətdə həyata keçirsin: yalnız bu bağlılıqları qıraraq insan kədərdən qurtula bilər.

# ÖLÜMDƏN QORXMAĞIN LÜZUMSUZLUĞU HAQQINDA

İnsanda iki hal olur – ölüməqədərki hal və ölümdən sonrakı hal. Ölümə qədər insan Peyğəmbərimizin (122): «Məhv edən sevinci tez-tez xatırlayın», - sözlərini unutmamalıdır, ona görə ki, əgər insan çətinə düşdükdə onu xatırlayarsa, qəlbinə bir yüngüllük gələcəkdir, əgər o, bunu xoşbəxt anlarında edərsə, onda bu, onun sevincini azaldacaqdır. İnsanlar bu münasibətdə iki qrupa bölünürlər. Buna biganə olanlar ölüm haqqında və ondan sonra olacaqlar barədə düşünməyən, yalnız ölümdən sonra onun qalacaq övladları və miras barədə düşünən əsl səfehlərdir, o, öz vəziyyəti barədə düşünmür və yalnız rəhmət duası oxunduqda yadına düşür və yalnız şüursuz olaraq: «Doğrudan da, biz Allahınıq və Onun yanına da qayıdacağıq», - deyə bildirirlər. Lakin o, Allahın (121) yanına öz əməlləri ilə deyil, yalnız sözləri ilə qayıdır və onun sözləri, əslində, yalandır. Ağıllı və nüfuzlu adamsa həccə gedən insan kimi həmişə ölüm haqqında fikirləşir, axı həccə yollanan şəxs öz məqsədini – həcci heç vaxt yadından çıxarmır. Uzun yol və gecə dayanacaqları onu öz məqsədini unutmağa qoymur. Ümumiyyətlə isə, əgər insan ölümü haqqında düşünərsə, boş arzulardan və ümidlərdən qurtular – bu, çətinlikləri yüngülləşdirər, insanı özbaşınalıqdan mühafizə edər. Ölüm haqqında unutmayan şəxs özünün malik olduğu az bir şeylə kifayətlənir, paxıllıqdan qurtulur, tövbəyə can atır və sürətlə ötüb keçən fani həyata bağlanmır, o, ibadətlə bütün mümkün olanları edir. İbadətə laqeyd olan isə hər gün tezliklə öləcəyini təsəvvür etməlidir, belə ki, bu, doğrudan da, ola biləcək bir şeydir. Lakin əgər o düşünsə ki, bir neçə ildən sonra öləcək, bu düşüncə onu ibadətə səy göstərməyə qoymayacaq və onun fani dünyaya bağlılığı zəifləməyəcək, lakin o, özünə bir gündən artıq möhlət verməli deyil və hər səhər həmin gün yola düşəcəyi fikri ilə oyanmalıdır. Hər hansı bir anda onu hakim öz yanına çağıracağını hər gün gözləyən şəxs həmişə cavab verməyə hazır olmalıdır, əgər belə olmazsa, onu çağıran adam bu şəxs hazır olmadıqda nazil ola bilər və o, öz xoşbəxtliyindən məhrum olacaqdır. İnsan hər dəqiqə ölümü öz qarşısında görməlidir. Əgər sən desən ki, ölüm uzaqdadır, onda mən cavab verərəm ki, xəstəlik nazil olanda ölüm uzaqda olmayacaqdır – bu isə bir gündən də az bir müddətdə baş verə bilər və səndən iraq deyildir.

Ölüm səbəbindən kədərlənmək həmin insanın dərrakəsizliyini göstərir, belə ki, bu kədər dörd növdə olur: ya öz qarnının və cinsi həvəsin istəyinə görə, ya özündən sonra qalacaq əmlaka görə, ya ölümdən sonra onun başına nə gələcəyini və hara gedəcəyini bilmədiyinə görə, ya da özünün işlədiyi günahlara görə.

Əgər bu kədər qarnına və cinsi həvəsə görədirsə, onda o, xəstəliyi arzulayan bir adama bənzəyir ki, bunu digər bir xəstəliklə qarşılasın, belə ki, qidanın qəbul olunmasında məqsəd aclıqdan doğan ağrılardan qurtulmaqdır. Buna görə də mədə dolduqdan və aclıq keçib getdikdən sonra insanın bir az əvvəl arzuladığı şey artıq onda mənfi hisslər oyadır, bu sanki qızınmaqdan ötrü günəşin şüaları altında oturmaq istəyən və sonra da kölgəyə çəkilərək həzz almaq arzusunda olan, ya da günəşin altında istirahət edib, sonra da soyuq buz kimi sudan və ya içkidən ləzzət almaq arzusunda olan şəxsə bənzəyir. Bu, axmaqlıq və qanmazlıqdır. Əgər o, özündən sonra qalacaq əmlaka görə kədərlənirsə, deməli, həyatın mənasızlığını və onun möminlərə vəd olunan zənginliklə və əbədi nemətlərlə müqayisədə nifrətə layiq olduğunu bilmir. Əgər bu kədər ölümdən sonra onun başına nələr gələcəyini bilməməzlikdəndirsə, onda həmin insan ölümdən sonra nələr baş verdiyini ona izah edən əsl həqiqəti axtarmalıdır. Harisə Peyğəmbərə (122) müraciətlə: «Mənə elə gəlir ki, öz gözlərimlə Allahımın taxt-tacını görürəm və mənə elə gəlir ki, Cənnət əhlini, onların bir-birinə necə qonaq getdiklərini və Cəhənnəm əhlini, onların bir-birinə necə nifrət etdiklərini görürəm». Bu biliksə ruh haqqındakı, onun nə olduğu, bədənlə hansı əlaqədə olduğu, nə üçün yaradıldığı, öz xüsusiyyətləri və mükəmməlliyi ilə, ona mükəmməlliyə çatmaqda mane olan çatışmamazlıqlarla birlikdə necə həzz alması barədə həqiqətin axtarışı nəticəsində yaranır. Şəriət tez-tez buna işarə verərək səma və yer məmləkətləri barədə olduğu kimi, eyni zamanda ruh haqqında düşünməyi də əmr edir. Əgər bu kədər onun bu həyatda etdiyi günahlara görədirsə, onda bu kədər heç bir şeyə gətirib çıxarmayacaqdır, yalnız zəruri müalicə – ürəkdən tövbə etməyi və öz xətalarını düzəltməyi arzulamaq lazımdır. Lakin əgər o kədərlənərsə və öz vəziyyətini düzəlməyə səy göstərməzsə, onda hansısa damarından qanama baş verən, qanı axan və bu qanı kəsə bildiyi, özünün ən qiymətli sərvəti olan həyatını qurtarmaq iqtidarında olduğu halda heç bir şey etmədən oturub itirdiyi qanı üçün qəm çəkən adama bənzəyəcəkdir. Bu isə axmaqlıqdır, ona

görə ki, keçmişi geri qaytarmaq mümkün olmadığı kimi, onun haqqında təəssüflənmək də heç bir fayda verməz, yalnız gələcək üçün çalışmaq lazımdır.

İkinci hal – insan ölüm anında olduğu haldır. İnsanlar belə vəziyyətdə üç cür olurlar. Birincisi ağıllı insandır. O, həyatın onu əsirlikdə saxladığını, ölümün isə onu azad etdiyini başa düşür və insan dünyəvi həyatda nə qədər uzun ömür sürsə də, bu yenə də səmada bir anlıq parlayan və yenidən sönən bir şimşək kimidir. Bu həyatı tərk etmək onun üçün asan deyildir, lakin o yalnız Allaha (121) xidmətdə və Ona yaxınlaşmaqda əlindən qaçırdıqları üçün təəssüflənir, o yalnız ona nə deyəcəkləri və onun da nə cavab verəcəyi barədə narahatdır. Bir nəfərdən onun nə üçün qorxmadığı və həyəcan keçirmədiyi barədə soruşduqda, o: «Ona görə ki, mən bilmədiyim yolla gedirəm, görmədiyim Allaha tərəf yaxınlaşıram və məndən nə soruşacaqlarını, mənim nə cavab verəcəyimi bilmirəm», - cavab verir. Belə insanlar ölümdən qaçmırlar, lakin əgər onlar ibadət etməkdə daha çox səy göstərə bilmirlərsə, yəqin ki, bunu arzulayırlar. Kimsə Allaha (121) müraciətlə: «Allahım, ölüm iqamətgahında əgər Səndən həyat barədə xahiş edirəmsə, bu, o demək deyildir ki, mən Səndən uzaqlaşmaq istəyirəm və Sənə yaxınlaşmağı arzulamıram. Çünki Sənin Peyğəmbərin və Seçdiyin (122) buyurub: "Kim Allahla görüşmək istəyirsə, Allah da onunla görüşmək istəyir, lakin kim Allahla görüşü arzulamırsa, onunla Allah da görüşməyi arzulamır"». İkincisi uzağı görə bilməyən, ürəyi ləkəli, dünyəvi həyata batmış və onunla bağlı olduğuna görə çirklənmiş insandır. Belə insan dünyəvi həyatdan razıdır, bu həyatda rahatdır və qəbirdəkilər üçün qəmlənən dinsizlər kimi, o da axirət həyatı üçün kədərlənir. Lakin əgər o, Əbədilik Sarayına can atarsa, bu, ona – gecənin küləyi peyin qurduna ziyan gətirdiyi kimi – zərər verəcəkdir. O əgər dünyəvi həyatın natəmizliklərindən çıxarsa, onda Ali dünya və Yüksək Cəmiyyətin Nuru onu qəbul etməyəcəkdir və o, Allah-Təalanın (121) buyurduğu: «Bu dünyada (Allahın dəlillərini, möcüzələrini görməyib gözü və qəlbi) kor olan axirətdə də kor olar və haqq yoldan daha da çox azar!» (17:72), - ayəsində adı çəkilənlərdən olacaqdır. Doğrudan da, dünyəvi həyat birincilər üçün zindan, ikincilər üçünsə Cənnətdir. Birincisi ağasının öz yanına çağırdığı qul kimidir; o, sevinc içərisində ağasına cavab verir, ona yaxınlaşır və ən yaxşı formada ona qulluq etməyə səy göstərir. İkinci isə ağasının yanına əlləri bağlı

halda, zorla gətirilən qaçaq qul kimidir və o, öz sahibinin gözləri qarşısında etdiyi xətaya görə başını aşağı salaraq dayanacaqdır. Bu ikisinin arasındakı fərq nə qədər böyükdür! Üçüncüsü isə bunların arasındakı vəziyyətdə olan adamdır, o, bu dünyanın bəlalarını görən və burada olmağa nifrət edən, lakin sonradan bu həyata adət edərək dözən şəxsdir. O sanki çirkli və qaranlıq otağa öyrəşən və bundan yaxşı heç bir şey görməyən biridir ki, bu otağa girmək belə nifrət doğuran bir iş olsa da, yenə buranı tərk etmək istəmir. Lakin əgər o, buradan çıxıb Allahın (121) möminlərə vəd etdiyini görərsə, əlindən buraxmaq istəmədiklərini itirdiyinə görə təəssüflənməyəcək və deyəcək: «Qəm-qüssəni bizdən uzaq edən Allaha həmd olsun. Həqiqətən, Rəbbimiz bağışlayan və qədir biləndir. Elə bir Rəbb ki, öz lütfü və kərəmi ilə bizi (əbədi qalacağımız) iqamətgahda yerləşdirdi. Orada bizə nə bir yorğunluq üz verəcək, nə də bir məşəqqət, əziyyət toxunacaqdır!» (35:34-35). Tamamilə bu da ola bilər ki, insan nədənsə heç cür ayrılmaq istəmədiyi halda, sonradan bu ayrılıq baş verdikdə heç bir təəssüf hissi keçirməsin və bu ona bənzəyir ki, körpə doğulduğu anda onun keçirdiyi ağrılara görə ağlamasına baxmayaraq, sonradan böyüdüyü zamanda həmin hala dönmək istəmir. Ölüm də bizə əvvəldə malik olmadığımız kamilliyi – bir şərtlə ki, buna qədər həmin kamilliyi qəbul edən fəza bəlalar və əngəllərlə dolmamış olsun – verən ikinci doğuluşdur. Bu, körpə bətndə olduğu zaman onun malik olmadığı mükəmməlliyi – bir şərtlə ki, həmin körpə bətndə olduğu zaman ona sonra mükəmməllik qazanmağa mane olan hər hansı bir hadisə baş verməmiş olsun – ona bəxş edən bir doğuluşa bənzəyir. Ölümün mükəmməlliyə səbəb olduğu barədə bir nəfər demişdir: «Biz Cəbrailə (123) və Mikailə (123) dua etdiyimiz kimi, Əzrailə (123) də dua etməli və ona təşəkkür etməliyik, ona görə ki, Cəbrail (123) və Mikail(123) bizim Məhəmməd (122) vasitəsilə dünyəvi həyatdan qurtulmaq və axirətdəki xilasımız haqqındakı biliklərimizin iki səbəbidir. Ölüm mələyi isə bizim həmin dünyaya çıxmağımızın səbəbidir və bu daha əsasdır, buna görə də ona minnətdar olmalıyıq». Belə nağıl edirlər ki, keçmiş zamanlarda elə müdriklər yaşamışlar ki, onlar bir şəxsi müqəddəs saymış və onu fani dünyada göstərdiyi köməyə görə deyil, onların fikrincə, onun ölümə – rəzil həyatdan qurtuluşa səbəb olduğuna görə yüksəklərə qaldırmışlar.

## ALLAH-TƏALAYA DOĞRU GEDƏN YOLUN BİRİNCİ PİLLƏSİNİN ƏLAMƏTİ HAQQINDA

Bil ki, Allah-Təalaya (121) doğru gedən yolla addımlayanlar az, özlərini bu yolda gedənlər kimi göstərənlər isə çoxdur. Biz isə sənə iki əlamət haqqında danışacağıq ki, bunları sən nəzərdən qaçırmamalısan və bunların köməyi ilə sən özünü və başqalarını yoxlaya bilərsən. Birinci əlamət: insanın öz şəxsi arzusu ilə törətdiyi bütün əməllər şəriətin mizanında ölçülüb-biçilmiş olmalı, onun əvvəlcədən təyin etdiyi arzulara və əməllərə, irəliyə hərəkətə və geriyə çəkilməyə uyğun olmalıdır, ona görə ki, bizim əvvəldə söylədiyimiz kimi, insan özünü şəriətdə göstərilən məziyyətlərlə zinətləndirmədən və xarakterini tərbiyə etmədən bu yolla hərəkət etmək mümkün deyildir. İnsan əgər halal sayılan şeylərin də bəzilərindən imtina etməzsə, onda buna çata bilməz. Bəs çirkin əməllərdən imtina etməyən şəxs buna necə çata bilər və əgər insan bəzi miqdarda əlavə ibadətləri həyata keçirmədən buna nail ola bilməzsə, onda vacib sayılan ibadətlərə biganə olanlar buna necə nail ola bilərlər? Lakin şəriət insanlara bir vəzifə olaraq tapşırdıqda, vacib olanla və qadağan edilənlə özünü məhdudlaşdırdılar və bütün insanlar da bunda bərabərdirlər, belə ki, bununla məşğul olmaq dünyanın dağılmasına gətirib çıxarmır. Lakin Allaha (121) doğru gedən şəxs dünyəvi həyatdan imtina edir və bütün insanlar bu əməldə ona oxşamağa çalışsalar, onda dünya məhv olar, belə ki, kimsə əlavə olanlardan əl çəkib, özünü yalnız vacib və lazım olanlarla məhdudlaşdırmaqla buna nail olmaq istəməz. Buna görə də Allah-Təala (121) buyurub: «Nə qədər ki, Mən onu sevməmişəm, Mənim qulum Mənə əlavə ibadətlər vasitəsilə yaxınlaşmaqda davam edir, lakin Mən onu sevdiyim zaman onun qulaqlarına və gözlərinə çevriləcəyəm və o, Mənimlə görəcək və eşidəcəkdir». Ümumiyyətlə isə, vacib olanlara qarşı laqeydliyin və əlavə olanlara nifrətin səbəbi tənbəllik və istəklərin insana üstün gəlməsidir. Tənbəlliyin və istəklərin qulu sayılanlar Allah (121) yolunda necə hərəkət edə bilərlər?

Əgər sən: «Öz arzuları və tənbəlliyi ilə mübarizə aparanlar Allah (121) yolu ilə gedənlərdir, bəs bu şər qüvvələrə qalib gələnlər artıq öz məqsədinə nail olaraq daha bu yolla hərəkət etmirlər?», – deyə soruşsan, onda sənə cavab verilməlidir ki, bu, əsl təkəbbür və doğru yol haqqında, birlikdə

götürdükdə isə məqsəd barədə məlumatın olmamasıdır, hətta insan bütün nöqsanlarından qurtulsa da, nəzərdə tutulmuş məqsədə münasibətdə bu, həccə getməyi planlaşdıran və onu bu yolda müşayiət edənlərə özünün əvvəldən olduğu borcu ödəyən şəxsin əməlinə bənzəyir.

Zira bədənin xassələri insanların boğazından yapışan sələmçilər kimi və ya onların ardınca düşərək əlindəki yeməyi qoparmağa cəhd edən vəhşi heyvanlar kimi adamları idarə edir və əgər kimsə bunları məhv edərək onlardan kənarlaşarsa, əlaqələrdən qurtular və bundan sonra yola başlaya bilər. Lakin onu bu yaxınlarda dul qalmış və ya boşanmış qadınla müqayisə etmək olar ki, hakimin onunla evlənməyini arzulayır və ona mane olan iddə[49] müddəti də az müddətdir ki, başa çatmışdır. Bu qadın qərar vermişdir ki, bütün bunlar onun öz arzusuna çatması üçün yetərlidir, lakin özü maneələr yox olduqdan sonra arzuladığını qəbul etməyə hazırlaşmaqdan qeyri heç bir şey etməmişdir və yalnız hakimin istəyi və razılığı qalmışdır, lakin bu, İlahi bir hədiyyədir və hər dəstəmaz alan şəxs beş dəfə namazı yerinə yetirə bilmir və iddə müddəti başa çatmış hər bir qadın öz arzusuna çatmır. Əgər sən: «Allaha (121) doğru gedən insanın (salih) dərəcəsi, onun bəzi vacib ibadətlərdən azad olması və bəzi qadağan olan şeylərin artıq ona heç bir ziyan vura bilməməsi ilə başa çatırmı və buna aid bəzilərinin etinasızlığı barədə bizə gəlib çatanlar doğrudurmu?», - deyə soruşsan, bil ki, bu ən yüksək səviyyədə olan təkəbbürdür və tədqiqatçılar bu barədə deyirlər: Əgər sən suyun üstü ilə addımlayan və həm də şəriət qanunlarının əksinə gedən bir nəfəri görsən, bil ki, bu, şeytandır və doğrudan da, belədir. Əgər lazım gələrsə və buna zəruriyyət varsa, həqiqi şəriət belə yerdə lütfkardır, şəriətdə buna icazə (rüxsə) vardır, lakin əgər kimsə icazə verilən bu hüdudu da keçərsə, onda artıq bu, zəruriyyətdən deyil, istək və həvəsdən yaranmış olur.

İnsan nə qədər ki, bu dünyadadır, o hətta öz arzularını itaət altına alsa da belə, onun təsirindən qurtula bilməz, buna görə də ehtiyatlı olmalı və ondan qorunmalıdır. Dəbdəbəyə, rahatlığa, hansısa arzuya və ya tənbəlliyə can atmaq şəriətə qarşı getməyin səbəbi ola bilər, bütün bunlar həmin qüsurların onu itaət altına saldığını göstərir. Əgər kimsə öz ruhunu təmizləyərsə və onu zəruri olan şeylərlə qidalandırarsa, belə ki, Allaha (121) ibadət etmək üçün gecə tək qalmaq ondan ötrü sevimli bir işə çevrilərsə, bu artıq lazım olan birinci pillənin əlamətləridir və bu, onu sonuncu pilləyə

qədər müşayiət edir, baxmayaraq ki, Allah-Təalaya (121) doğru gedən yolda bu pillələrin sayı-hesabı yoxdur. Bu yolda sona qədər irəliləməyə ölüm mane olur və hər bir insan ölümdən sonra öz həyatında nail olduğu pillədə qalır, çünki insan necə yaşayıbsa, o cür də ölür. Əgər onun ürəyi heç bir məcburiyyət olmadan böyük sevinc içərisində Allah-Təala (121) ilə olarsa, onda ikinci əlamət elə budur. Bu ünsiyyət zamanı onun ürəyi önündə açılan Allahın (121) Böyüklüyü və Əzəməti qarşısında itaətlə, yalvarışla və razılıqla döyünməlidir və heç bir vaxt, heç bir şəraitdə, hətta bədənin tələb etdiyi şeyləri yerinə yetirdiyi anda, məsələn, yemək yedikdə, ehtiyac dalınca getdikdə, paltar yuduqda və digər işlər zamanı bu ünsiyyət davam etməlidir, o, öz sevgilisinin intizarında olan, yatmadan onu gözləyən bir aşiq kimi olmalıdır ki, sonda sevgilisi gəlib çıxır və o çox şad olur, lakin o, ehtiyac dalınca getməlidir və buna görə də sevgilisini tərk etməlidir. O, ehtiyacını ödəməyə gedir və məcburən sevgilisini tərk etməyə məcbur olur. O, ayaqyoluna gedir və cismani olaraq sevgilisindən uzaqlaşmağa məcburdur, lakin ürəyi onunla qalır, belə ki, əgər bu anda kimsə ona müraciət edərsə, o, bütün fikri ilə sevgilisinə qovuşduğu üçün heç bir şey eşitməyəcəkdir – bu vəziyyət onunla sevgilisi arasında heç bir maneə yarada bilməz, çünki belə bir şərait zəruridir. Allah (121) yolu ilə gedən insan gündəlik işlərində bu cür olmalıdır, lakin bədəninin tələb etdiyindən qeyri onun digər işləri olmamalıdır və ürəyi bu anlarda həmişə Allaha (121) tərəf çevrilməli, Onu tərifləməli və Onun qarşısında itaətdə olmalıdır. Əgər intim əlaqə insana istiqamət verərsə, onda bu, həmin arzunun öz itaəti altına saldığı şəxsin xüsusiyyətidir və o, murdar, çirkli bir damcıdan əmələ gələn insanın yalnız zahiri gözəlliyini görür və öz müqabili olan meyitə yaxınlaşır, o isə bu zaman özündə ifrazat daşıyır və bu halda hüdudları olmayan Allahın (121) Əzəmətinə və Onun Gözəlliyinə nail olmaq çox çətin olar. Ümumiyyətlə isə, güclü səy və böyük istək olmadan bu yolla irəliləmək mümkün deyil. Güclü istək və səy isə cəhd və arzu olunan məqsədin gözəlliyini dərk etdikdən sonra yarana bilər. Məqsədin gözəlliyinin dərk olunması isə onun diqqətlə öyrənilməsi və tədqiq olunması ilə əmələ gəlir, bu zaman qalan hər bir şey bir tərəfdə qalır. Allahın (121) Əzəmətini gördüyün anda sənin ürəyində məhəbbət və arzu cücərməyə başlayır və məqsədə doğru hərəkətin başlanır. Sonra isə ünsiyyət zamanı sənin göstərdiyin səylər güclənə bilər, əgər indiyə qədər

gizli qalan məziyyətlər sənə aydınlaşarsa, onda sənin məhəbbətin də güclənəcəkdir. Elə bunun kimi, sənə aydınlaşan İlahi Gözəllik də - yeni başlayan şagirdin kifayət qədər dərketməsi olmadığı səbəbindən – əsl həqiqətin yalnız çox kiçik bir hissəsi ola bilər, lakin əgər həmin şagird məqsədə çatmaq üçün çalışarsa və çox güclü arzulayarsa, həmin Gözəllik barədə dayanmadan düşünərsə, onda ona yeni-yeni məziyyətlər aydınlaşacaq, onun məhəbbəti getdikçə möhkəmlənəcək və böyüyəcəkdir.

Aşiq öz sevgilisinə yaxın olmağı arzuladığı kimi, şagird də Allah-Təalaya (121) yaxın olmağa səy göstərir. Lakin bu, bədənlərin səthinin toxunması ilə müşayiət olunan məkan yaxınlığı deyil və onun zahiri gözəlliklə heç bir əlaqəsi yoxdur – o yalnız öz ürəyinin görmə gücü ilə Onu, həqiqətən, öz qarşısında görə bilər, bu, fəza deyil, kamilliyin yaxınlığıdır və misallar bunu çox səthi olaraq anlada bilər, lakin bu misalların ən yaxşısı kimi bu yaxınlığı şagirdin öz müəlliminə olan məhəbbəti və mükəmməllikdə ona yaxın olmaq arzusu ilə müqayisə etmək olar. Belə ki, şagird öz müəlliminin öyrətmə üsulunda ona bənzəməyə çalışır və bu yolda yavaş-yavaş ona yaxınlaşır, lakin onun məqsədi pillədir. Bəzən o, buna nail olur, bəzən isə nail ola bilmir, lakin onun hal-hazırda uzaq olduğu pilləyə qalxa bilməsi mümkündür və nisbi olaraq tədricən yaxın olacaqdır. Burada tam nailiyyət mümkün deyildir, lakin ən aşağı pillədən aliyə tərəf istiqamətdə hərəkət mümkündür. Ola bilər ki, şagird hansısa müəyyən pilləni öz məqsədi kimi qarşısına qoyur. Ona görə yox ki, o öz müəlliminin pilləsini aydın dərk etmir, ona görə ki, o, pillə – pillə irəliləmək arzusundadır və öz baxışlarını həmin pillədən daha yüksəkdə olana dikmişdir. Bunun kimi, alim olmayan insan da peyğəmbərlərin varisləri olan alimlərdən örnək götürməlidir. Alimlər övliyalara, peyğəmbərlərsə insani əlamətlərini itirərək ta insan sifətində olan mələklərə çevrilənə qədər onlara oxşamağa çalışırlar. Mələklərin də öz pillələri vardır, bunlardan ən yüksəkdə olanları və onlardan aşağı pilləni tutaraq məqsədi yüksəkdəki pillə olanları da vardır. Allaha (121) ən yaxın olanlar ilə Allah-Təala (121) arasında heç bir vasitəçi yoxdur, onlar özlərindən aşağıda yerləşən gözəl və kamil varlıqlardan daha təmiz gözəlliyə və mükəmməl əzəmətə malikdirlər. Sonra isə, bütün bu əzəmət və mükəmməllik Allahın (121) Əzəməti ilə müqayisədə çox mənfur görünür – Allaha (121) yaxın olmağı sən məhz belə təsəvvür etməlisən. Allah-Təalanın (121)

Cənnətin hansısa bir pilləsində olduğunu və sənin Cənnətin qapısına yaxınlaşmağınla Ona qovuşduğunu təsəvvür etmək düzgün deyil. Bu zaman sənin Ona yaxınlaşmağın məkanda baş verir, Allah (121) bunlardan çox yüksəkdir, sənin öz ibadətlərini Ona bağışladığını və buna görə də Onun sevindiyini, bu ibadətləri qiymətləndirdiyini və səndən razı qaldığını da düşünmək düzgün olmaz. Yalnız dünyəvi hökmdarların məmnunluğunu qazanmaq və bununla da öz məqsədinə çatmaq üçün onlara belə yaxınlaşırlar və buna yanaşma deyilir; Allah (121) bunlardan çox yüksəkdədir və Onun keyfiyyətləri dünyəvi hökmdarlara məxsus olan qəzəb, məmnunluq, öz vəzifəsindən və rəiyyətlərinin itaətkarlığından, onların tabeliyindən və onun ardınca getməsindən hiss etdiyi sevinc kimi keyfiyyətlərdən fərqlidir. Bütün bu cür şeylərə inanmaq cahillikdir və əgər sən sadə insanların çoxunun məhz belə düşündüyünü söyləsən, onda mən sənə cavab verərəm: Dabbaq dükanında ənbər axtaran insan öz məqsədinə nail olmaqdan nə qədər uzaqdır! Arzu etdiyin pilləyə necə çata bilərsən ki, sən təkcə insanlar barədə həqiqəti deyil, həm də eşşəklər haqqında olan həqiqəti də bilirsən! Zira heç bir vaxt bilik almayan insanların çöldə dolaşan, şirlərdən qaçan eşşəklərdən heç bir fərqi yoxdur. Məgər sən görmürsən ki, onlar Allah (121) barədə nələr düşünürlər? Guya ki, Allah (121) yaşıl talvarın altındakı taxtda oturmuşdur və bu kimi əlamətlərlə Onu insana bənzədirlər. İnsanların çoxu bənzədirlər və müqayisə edirlər, lakin bu, özünün pillələrinə malikdir: kimsə hərəkətdə və zahiri görünüşdə oxşadır və Onun əllərinin, gözlərinin olduğunu iddia edir. Bəziləri qəzəbin, məmnunluğun, acığın, sevincin olduğunu deyirlər, lakin Allah (121) bütün bunlardan yüksəkdədir, bu sözlər birbaşa mənasında işlədilməmişdir, bunu anlayanlar öz anladıqlarını, inkar edənlər öz inkar etdiklərini yalnız yozma yolu ilə edirlər və əgər bütün insanlar dərk etməkdə eyni olsaydılar, onda Peyğəmbərin (122): «Kimsə biliyi ondan daha çox bilənə aparır, biliyi daşıyan kimsə də ümumiyyətlə heç nə bilmir», - sözləri öz mənasını itirərdi. Gəlin bu mövzuda söhbətimizə yekun vuraq.

## KİTABIN[50] REDAKTORU TƏRƏFİNDƏN SON SÖZ

Ey ilahi elmlərə can atanlar və dini biliklərə vurulanlar! Mənə yaxın gəlin və mənə diqqətlə qulaq asın! Səadət çırağı olan kitab budur, o, doğru yolu işıqlandırır və o, həqiqət nuru haqqında olan bilikdir. «Mizan əl – əməl» (Əməllərin mizanı) adlanan bu kitab ləyaqəti ümumi və ayrılıqda bütün insanlara məlum olan, islamın ən böyük nüfuz sahiblərindən biri kimi qəbul olunmuş imam Əbu Hamid Məhəmməd əl–Qəzali tərəfindən yazılmışdır. Bu kitab idrak (əql) və rəvayətlər (nəql) üçündür, o, insanı Əzəmət Sarayına müşayiət edən əməllər və digər çoxlu sayda mövzular haqqında sübut olunmuş islam biliklərini özündə birləşdirir və bu kitab – müəllifi kimi – öz məziyyətlərində yeganədir. Bu, imamı digərlərindən fərqləndirən xüsusiyyətləri – böyük bir idrakdan doğan biliklərinin həqiqiliyini və onun yüksək səmimiliyindən yaranan əməllərinin gücünü bilənlər üçün sirr deyildir. Bu insanın tutduğu yüksək mövqeyə onun «Əl-ərbain fi üsul əd-din» kitabının naşiri şeyx Mühyi əd-Din Səbri əl-Kürdi əl-Kanimaşkani, qardaşı şeyx Məhəmməd Hüseyn Nüəymi əl-Kürdi və əl-Kürdi kimi tanınmış şeyx Əbd ül-Qadir diqqət yetirmiş və onlar bu «Əməllərin mizanı» kitabını nəşr etmək arzusunda olmuşlar. Onların nəşr etmək istədikləri kitabın variantı mənim öz gənclik illərimdə ali kitabxanaların birindən köçürdüyüm nüsxə olduğuna və əxlaqa dair elmlər sahəsindəki biliklərimə görə yalnız yaxşı tərəfdən məni tanıdıqları üçün bu əlyazmanın təshihində onlara kömək etməyimi xahiş etdilər. Rəğbət hissimdən irəli gələrək mən səylə və dərindən öyrənə-öyrənə düzəlişlər apararaq, səhvlərdən təmizləyərək bunu etdim və bu kitab mənim istədiyim kimi, qüsursuz oldu. Bu, mükəmməl, doğru və düzgün kitabdır. Oxucu bu kitabı azca da olsa dayanmadan qiraət edir və cümlələrin kamilliyi sayəsində mənanın asan qavranılmasından həzz alır. Əgər oxucu kitabın təshihində nə qədər əmək sərf etdiyimizi bilsəydi, onda bizim bu kitabı Allaha (121) şükür ki, yoxluqdan əmələ gətirdiyimizə əmin olardı və bu kitabı mövcud olan digər variantlarla müqayisə etməyə çalışan hər bir kəs mənim dediklərimə bir daha əmin olar. Həqiqətə and olsun ki, əgər əsl faydalı kitablara qarşı insanların diqqətini görürüksə, onda hər şeyi həmin insanlara həm bu dünyada, həm də axirət dünyasında fayda vermək üçün onların rifahı naminə edirik. Allah-Təalaya (121) yalvarırıq ki, bizə təmiz fayda

gətirən şeylərdə kömək olsun, doğrudan da, O – dualara Diqqətli Olan və onları Yerinə Yetirəndir.

*Əlyazmanın redaktoru*

---

[1] Dinar – pul vahidi.

[2] Qəzali insanların həqiqi qrupunu Quranda istifadə olunmuş (9:122) firqə sözü ilə ifadə etmişdir.

[3] Dirhəm – pul vahidi.

[4] Övliya – vəli sözünün cəmi olub, «yaxın dost» deməkdir.

[5] Cihad – müqəddəs müharibə, iki növə ayrılır: böyük (silahın köməyi ilə) və zərərli arzularla və çatışmamazlıqlarla mübarizəni özündə birləşdirən kiçik (mənəvi) cihad.

[6] Ruh – ruh, can.

[7] Aişə – Peyğəmbərin (122) arvadı.

[8] Fəqih – müsəlman qanunlarının bilicisi, fiqh alimi.

[9] Hədis – Peyğəmbərin (122) özünü həyatda necə apardığı barədə rəvayətlər. Bu, onun sözlərinin ifadə edilməsi, əməlləri haqqındakı hekayələr və ya təqdir etdiyi şeylər barədə ola bilər.

[10] Fiqh – şəriət məsələlərindən bəhs edən dini elmlərdən biri.

[11] Həcc – Kəbə ziyarəti, islamın dayaqlarından biri.

[12] Zəkat («paklanma») – zəruri sədəqə, islamın dayaqlarından biri.

[13] Ayət – Quran misrası (surənin hissəsi).

[14] Şəhid – din uğrunda həlak olan, əzabkeş.

[15] Doğrucul (əs-Siddiq) – Peyğəmbərin (122) silahdaşı Əbu Bəkri (124) səmimiliyinə və doğruluğuna görə belə adlandırırdılar.

[16] İstixarə – çətin dəqiqələrdə vəziyyətdən çıxmaq zamanı vacib qərar qəbul etmək lazım gəldikdə xahişlə Allaha (121) olunan müraciət.

[17] Bunlar barədə əvvələ bax.

[18] Əli ibn Əbu Talib – dördüncü xəlifə, Peyğəmbərin (122) kürəkəni.

[19] İman – inam, etiqad.

[20] Səlat (fars. namaz) nəzərdə tutulur – gündə altı dəfə həyata keçirilən ibadət, islamın dayaqlarından biri.

[21] Ağıllı şagirdlər, əlbəttə ki, vərdişlə təhsil arasındakı fərqi həmin an hiss edə bilərlər, çünki bunlardan birincisi – valideynləri tərəfindən hər hansı bir şeyin əsl mahiyyəti barədəki biliyi vermədən sadəcə olaraq uşaqlarını ona öyrəşdirdikləri kimi – heç də həmişə biliklə müşayiət olunmur.

[22] Sirat – Qiyamət günü imtahan kimi üzərindən keçilməli olan körpü. O, tükdən nazik və qılıncdan itidir.

[23] Rükət – Quranın əsası, müəyyən duruşlardan və hərəkətlərdən ibarət olan ibadət növüdür ki, özündə dua düsturlarının və ayələrinin ifadəsini də birləşdirir.

[24] Zikr – Allahı (121) yada salma, ibadətin bir növü.

[25] Təsəvvüf – sufilik təriqəti.

[26] Rəbiyə – (Rəbiyə əl-Ədəuyyə) – öz dindarlığı və möminliyi ilə məşhur olan qadın.
[27] Axirət – «son», «o biri dünya».
[28] İmam – rəhbər, başçı. Burada: dövlətin başçısı.
[29] Qüreyş – Peyğəmbərin (122) qəbiləsi.
[30] Hidayət – «yol göstərmə», «doğru yola çağırma».
[31] Rüşd – «düzgün rəhbərlik», «doğru yola yönəltmə».
[32] Təsdid – «doğru yol tutma».
[33] Təyid – «yardım», «kömək».
[34] Tovfiq – «kömək», «köməklik», «yardım».
[35] Peyin böcəyi – bədii ifadə. Pis ailədən olan qız nəzərdə tutulur.
[36] Hilm – «həlimlik», «yumşaqlıq».
[37] İblis – «iblis», «şeytan».
[38] Alim – alim, yüksək biliyə malik olan insan, burada əsl alim, daha doğrusu, Allahın (121) adından bilik əldə edən və onu əməllə uyğunlaşdıran alim nəzərdə tutulur.
[39] Şəhadət – «şahidlik etmə». «Allahdan başqa allah yoxdur, Məhəmməd onun rəsuludur» ifadəsinin bərkdən deyilişi və ürəkdən təsdiqi nəzərdə tutulur. İslamın dayaqlarından biri.
[40] «Cərəyan», «məslək».
[41] Mizan – Qiyamət günü insanların əməllərinin və ya əməl kitablarının ölçüləcəyi tərəzi.
[42] Ümmət – icma.
[43] İsgəndər – Makedoniyalı İsgəndər.
[44] Həvva – Həvva, Adəmin arvadı.
[45] Başqa heç bir içkinin olmadığı bir vəziyyət nəzərdə tutulur.
[46] Aurat – bədənin örtülməsi vacib olan hissələri.
[47] Sulaf – yüksək keyfiyyətli şərab.
[48] Əzrail, Cəbrail, Mikail – mələklərin adları.
[49] İddə – ərindən boşandıqdan və ya əri öldükdən sonra qadının yenidən ərə getməsinə icazə verilməyən müddət.
[50] Kitabın əlyazma variantı nəzərdə tutulur.

*Mərhəmətli və Rəhmli Allahın adı ilə*

*Allaha, dünyaların yaradıcısına eşq olsun və Ondan bütün möminlər üçün xobəxt bir axirət diləyək. Onun Peyğəmbəri Məhəmmədə və onun nəslinə xeyir-dua və rəhmət olsun.*

*Bil ki, bir şagird şeyx, imam, islamda hörmətli şəxslərdən biri olan Zeyn-əd-Dinə sədaqətlə xidmət edirdi. Bu Əbu Hamid Məhəmməd əl-Qəzali (124) idi. O, imamın yanında bütün elmləri incəliklərini dərk edənə və bütün ruhi məziyyətlərlə özünü zinətləndirənə qədər təhsil aldı. Bir dəfə öz vəziyyəti barədə düşüncələrə dalarkən o, öz-özünə dedi: «Mən çox növdə elmləri öyrəndim, öz ömrümün ən gözəl illərini bilikləri və onların məcmuələrini dərk etməyə sərf etdim, indi isə bunların hansının sabahkı günümdə və qəbir evimdə mənə faydalı olacağını öyrənməliyəm. Mənim üçün faydalı olmayanları isə mən artıq öyrənməməliyəm. Allahın Elçisi (122) deyib: «Ey Allah! Faydasız biliklərdən qurtulmaq üçün mən sənə sığınıram». Bu fikir onu uzun müddət məşğul etdi və o, hörmətli şeyx, imam, islamda ən möhtərəm simalardan biri sayılan Məhəmməd əl-Qəzaliyə yazaraq ondan məsləhət istədi. O, bir neçə sual verərək ona məsləhət verməsini və dua öyrətməsini xahiş etdi: «Şeyxin «Əhya» və digər əsərlərində mənim suallarıma cavab verilməsinə baxmayaraq, mən istəyirəm ki, şeyx mənə lazım olan şeyləri bir neçə səhifədə yazsın ki, mən bütün ömrüm uzunu onları yanımda saxlayım və Allah istəsə, varlığım boyu orada yazılanlara əməl edim». Şeyx ona cavab olaraq bu məktubu yazdı və bu haqda ən yaxşısını Allah (121) bilir.*

Əziz və sevimli oğlum, Allah (121) Onun ibadətində sənin həyatını uzun etsin və qoy səni Allahı (121) sevənlərin yolu ilə aparsın, bil ki, bu nəsihət Müqəddəs Kitab əsasında yazılıb və əgər həmin Kitabdan müəyyən nəsihətləri dərk etmisənsə, onda mənim öyüdlərim sənin nəyinə gərəkdir? Yox əgər dərk etməmi-

sənsə, onda mənə söylə: bu keçən illər ərzində sən nə əldə etmisən?

Ey oğul, Allahın Rəsulunun (122) öz icmasına öyrətdiklərindən götürülmüş sözlər belədir: «Qulun özünə heç bir xeyri olmayan işlə məşğul olması Allahın öz qulundan üz döndərməsini göstərir və doğrudan da ibadət üçün yaradılan, lakin bircə saatını ibadətsiz keçirən insan əbədi kədər içində yaşamağa layiqdir. Qırx yaşına çatmış, xeyirxah əməlləri şər işlərindən az olan insan qoy Cəhənnəm oduna hazır olsun». Bu məsləhət alimlər üçün kifayət edər.

Oğul, məsləhət vermək asan, onu qəbul etməksə çətindir, ona görə ki, öz arzularına sədd çəkməyənlər üçün bu məsləhət acı görünə bilər, çünki onların ürəkləri haram şeyləri sevir. Bu, əsasən də, formal biliklərə və öz nəfsi üçün nemət saydığı şeylərə can atan, fani dünyanın cığırları ilə addımlayan insanlara aiddir. Belə adam elə hesab edir ki, biliklər özü-özlüyündə onu xilas edər, Cəhənnəmdən qurtarar və ona heç bir xeyirxah əməl həyata keçirmək lazım deyil. Filosofların inancı məhz belədir. Böyük Allaha həmd olsun! Bu cür təkəbbürlü şəxs bilmir ki, əgər o, biliklər əldə edib, onlara uyğun hərəkət etmirsə, bu, onun ziddinə olan ən inandırıcı sübutdur, zira Allahın Rəsulu (122) buyurub: «Qiyamət günündə ən çox əzab çəkənlər Allahın verdiyi biliklərdən istifadə etməyən alimlər olacaq».

Cüneyd (124) haqqında belə rəvayət edirlər ki, onun ölümündən sonra bir nəfər onu öz yuxusunda görür və ondan soruşur: «Ey Əbu əl-Qasim, nə xəbər var?» O isə cavabında: «Gecə yarısı qıldığımız rukətlərdən başqa, bütün cümlələr, bütün əlamətlər yox oldu və bizə heç bir şeyin köməyi olmadı», - demişdir.

Ey oğul, xeyirxah əməllərdən, ümumiyyətlə, kənarda qalmaqdan və hər bir mövqedən məhrum olmaqdan çəkin və yadda saxla ki, biliklərin öz-özlüyündə heç bir faydası yoxdur. Buna misal olaraq, səhrada gedən və özü ilə on ədəd hind qılıncı və digər əsləhələr daşıyan insanı göstərmək olar və bu adam eyni zamanda çox hünərli bir döyüşçüdür. Əgər onun üzərinə nəhəng və dəhşətli bir şir hücum edərsə, necə düşünürsən, o, bu silahlardan istifadə etməzsə və onlarla zərbə endirməzsə, bu silahlar onu müdafiə edəcəkmi? Məlumdur ki, silah yalnız onu oynatdıqda və onunla vurduqda insanı müdafiə edir. Eynilə bunun kimi, əgər insan yüz min elmi sualı oxuyub onların cavablarını öyrənsə, lakin bu biliyini

praktikada istifadə etməsə, ona heç bir fayda verməyəcəkdir. Bunu isə sarılıq azarına mübtəla olmuş və yüksək qızdırması olan bir insanla müqayisə etmək olar: bu xəstəliyi sirkə qarışdırılmış balla və başqa dərmanlarla müalicə etmək mümkündür, lakin bunlardan istifadə olunmazsa, heç bir xeyir olmayacaqdır.

Hərgah iki min ritl[1] şərab da ölçsən,
Sən sərxoş olmazsan, bundan içməsən.

Və hətta əgər sən yüz il müddətində elm qazansan da, minlərlə kitab oxusan da, xeyirxah əməllər həyata keçirmədən Allahın (121) mərhəmətinə hazır olmayacaqsan. Zira buyurulub: *«Heç bir günahkar başqasının günahına yüklənməz!»* (53:38), *«Kim Rəbbi ilə qarşılaşacağına (Qiyamət günü dirilib haqq-hesab üçün Allahın hüzurunda duracağına) ümid bəsləyirsə (yaxud qiyamətdən qorxursa), yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın!»* (18:110), *«Qazandıqları günahların cəzası (əvəzi) olaraq az gülüb, çox ağlasınlar» (9:82), «İman gətirib yaxşı işlər görənlərin mənzili isə Firdovs cənnətləri olacaqdır! Onlar o cənnətlərdə əbədi qalıb oradan ayrılmaq (başqa yerə getmək) istəməyəcəklər!»* (18:107-108), *«Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi. Biz onları (Cəhənnəmdəki) Ğəyy dərəsinə atacağıq. Tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa! Onlar heç bir zülm və haqsızlıq görmədən Cənnətə daxil olacaqlar»* (19:59-60).

Sən bu hədis haqqında nə deyə bilərsən: «İslam beş əsas üzərində qərar tutmuşdur: Allahdan başqa allah yoxdur və Məhəmməd onun Rəsuludur – şəhadət, namaz qılmaq, zəkat vermək, ramazan ayında oruc tutmaq və yolu dəf etməyə imkanı olanlar üçün həcc ziyarəti».

Ey oğul, iman dil vasitəsilə ifadə etmək, dediyini ürəyinlə təsdiqləmək və əl-ayaqlarınla əməlləri yerinə yetirməkdən ibarətdir. Əməl dəlilləri əsassızdır və qul Cənnətə yalnız Allahın (121) mərhəməti və Onun səxavəti sayəsində, yalnız ibadətlər və itaət nəticəsində buna hazır olduqdan sonra nail olur, zira «Allahın mərhəməti yaxşılıq edənlərə çox yaxındır!» (7:56). Əgər kimsə: «Buna həm də sadəcə olaraq imanın vasitəsilə də yetmək olar, – deyə söyləsə, biz ona cavab verərik ki, bəs buna nə zaman nail olunur? Və hansı sayda çətin dəf olunan maneələri keçdikdən sonra buna nail olmaq mümkündür? Bu maneələrin birincisi isə iman

maneəsidir: o, öz imanını qoruyub saxlaya biləcək, yoxsa yox? Əgər buna nail olarsa, bu zaman o, müvəffəqiyyətsiz və heç bir şeysiz qalmayacaq ki? Həsən əl-Bəsri deyib: «Allah-Təala Qiyamət günü öz qullarına deyəcək: «Mənim qullarım, Mənim mərhəmətim sayəsində Cənnətə daxil olun və öz əməllərinizə uyğun olaraq onu öz aranızda bölün».

Oğul, əgər sən xeyir əməllər etməsən, mükafat almayacaqsan. Belə deyirlər ki, İsrail tayfasından bir nəfər yetmiş il ərzində Allah-Təalaya (121) ibadət və itaət etdi. Allah-Təala (121) onu öz mələklərinə təqdim etmək istədi. Allah (121) həmin adama o nə qədər ibadət etsə də, onun Cənnətə daxil olmağa layiq olmadığını bildirmək üçün elçisini göndərdi. Elçi onun yanına gəlib bu xəbəri ona dediyi zaman qul: «Biz ibadət üçün yaradılmışıq və biz də ibadət etməliyik», - cavabını verdi. Mələk qayıdaraq: «Mənim Allahım, onun cavabını Sən məndən yaxşı bilirsən», - söylədi. Bu zaman Allah-Təala (121) buyurdu: «Əgər o, Bizə olan ibadətindən dönmədisə, onda Biz də Mərhəmətimizlə ondan üz döndərmərik. Mələklər, şahid olun ki, Mən onu bağışladım».

Allahın Rəsulu (122) deyib: «Nə qədər ki, sizdən haqq-hesab çəkilməyib, özünüz özünüzdən haqq-hesab çəkin. Nə qədər ki, sizin əməlləriniz ölçülməyib, özünüz öz əməllərinizi ölçün». Əli (124) deyib: «Heç bir səy göstərmədən Cənnətə nail olmaq haqqında düşünən kəs boş bir xəyalpərəstdir. Lakin Cənnətə yalnız cəhd etməklə nail olacağını düşünən insanın başqa heç bir şeyə ehtiyacı yoxdur». Əl-Həsən (124) deyib: «Cəhd etmədən Cənnətə nail olmaq səyi günahlardan biridir». O həm də deyib: «İnsanın öz əməllərini tərgitməsi deyil, əməllərinə əhəmiyyət verməsindən əl çəkməsi onun düzgün yolda olmasına bir işarədir». Allahın Rəsulu (122) deyib: «Özünü borc naminə sərf edən və ölümdən sonrakı üçün əmək sərf edən şəxs ağıllı adamdır, öz ehtiraslarına mane olmayan və Allahdan öz istədiyini almağı arzulayan isə ən axmaq adamdır».

Oğul, oxuyaraq, əzbərləyərək, özünü yuxudan məhrum edərək neçə gecə yatmamısan? Buna səni nə təhrik edibsə, mən bilmirəm. Əgər bu, dünyəvi nemətlərə çatmaq, bu həyatın sevinclərinə nail olmaq, yüksək mövqe tutmaq, həmyaşıdlarının və özün kimilərinin qarşısında lovğalıq etmək üçündürsə, onda səni bəla, böyük bəla gözləyir. Lakin əgər Peyğəmbərin (122) qanunlarını bərpa etmək, özünü tərbiyələndirmək, sənə şər işləri görməyi əmr edən

nəfsinə qalib gəlmək üçündürsə, onda səni nemət, böyük nemət gözləyir. Bu sətirləri söyləyən adam çox haqlıdır:

Əgər gözlər Səndən qeyri bir başqası üçün yatmırsa,
bu - itkidir,
Əgər onlar Səndən qeyri bir başqası üçün ağlayırsa,
onda bu - xətadır.

Oğul, necə istəyirsən yaşa – bu həqiqətdir ki, sən ölüsən; necə istəyirsən sev – bu həqiqətdir ki, sən ondan ayrı düşəcəksən; nə istəyirsən et – bu həqiqətdir ki, buna görə mükafatlanacaqsan.

Oğul, Əzəmət Sahibindən fərqli olaraq, ilahiyyatdan, fikir ayrılığından, təbabətdən, məcmuələrdən, şeir sənətindən, ulduzlardan, qafiyələrdən, söz birləşmələrindən, söz formalarından yalnız vaxt itirməkdən qeyri sənə nə qalacaqsa, bilmirəm. Doğrudan da, mən İsanın (123) İncilində bu sətirlərə rast gəlmişəm: «Mərhuma ölü duası oxunması üçün onun uzandıran andan məzara sallayan ana qədər Allah (121) Öz Əzəməti ilə ona qırx sual verəcəkdir. Bunlardan birincisi budur: «Mənim qulum, uzun illər ərzində başqa insanlar qarşısında yaxşı görünmək üçün səy göstərmisən, lakin Mənim qarşımda yaxşı görünmək üçün bircə saat da olsa vaxt sərf etməmisən». Və hər gün sənin ürəyinə baxaraq deyir: «Sən Mənim nemətlərimlə əhatə olunduğun halda, başqaları üçün çalışırsan. Sən karsan və heç bir şey eşitmirsən!»».

Oğul, əməlsiz bilik – dəlilikdir, lakin əməlin özü də biliksiz mümkün deyil.

Yadında saxla ki, bu gün səni pis əməllərdən qorumayan və səndə ibadətə maraq oyatmayan bilik sabah səni Cəhənnəm odlarından xilas etməyəcəkdir. Əgər sən elə bu gün öz biliyini əməldə istifadə etməsən və keçmişdə itirdiyinin yerini doldurmasan, onda sabah: «Məni yaxşı əməllər həyata keçirməkdən ötrü bir daha geri qaytar», - deyəcəksən. Sənə isə: «Axmaq, sən axı özün oradan gəlirsən!», - cavabını verəcəklər.

Oğul, bütün gücünü ruhuna yönəlt və nəfsinə qələbə çal, (yadında saxla ki,) bədən fanidir, ona görə ki, sonda mütləq məzara daxil olacaqsan və məzar sakinləri isə sənin nə vaxt gələcəyini həmişə gözləyirlər. Onların yanına ehtiyat götürmədən getməkdən qorun. Doğrucul Əbu Bəkr (124) demişdir: «Bu bədən quşlar üçün olan qəfəs, ya da heyvanlar üçün bir qabdır və düşün ki, sən bunların hansına aidsən? Əgər sən yüksək səmalarda qanad çalan quş-

lardan birisənsə, onda: «Öz Allahına doğru qayıt», - çağırışını eşidən zaman Cənnət çadırlarının ən yüksək pilləsinə çatana qədər səmalara cumacaqsan, bu haqda Allahın Rəsulu (122) buyurub: «Səd ibn Muazın[2] ölümündən Mərhəmətli Allahın Taxtı həyəcandan titrədi». Allah (121) bizi heyvanlar sırasında olmaqdan qorusun ki, bu haqda Allah-Təala (121) buyurub: «Onlar heyvan kimidirlər, bəlkə də, (ondan) daha zəlalətdədirlər» (7:179). Düşünmə ki, sənin öz evinin bir küncündən Cəhənnəm uçurumlarına yerini dəyişməyin mümkün deyildir. Belə rəvayət edirlər ki, Həsən əl-Bəsriyə (124) içmək üçün bir az su verdilər, o isə stəkanı əlinə aldıqda bir anda bayıldı və stəkanı əlindən saldı. Özünə gəldiyi zaman ondan soruşdular: «Sənə nə olmuşdu, Əbu Səid?» - o isə cavabında: «Mən Cəhənnəm əhlinin Cənnət əhlinə müraciət edərək: «Üstümüzə bir az su tökün və ya Allahın sizə verdiyi ruzilərdən bizə bir qədər ehsan edin!»(7:50) - dediklərini xatırladım», - söyləmişdir.

Oğul, əgər bilik sənin üçün özü-özlüyündə kifayət edərdisə və sənin bununla bərabər heç bir yaxşı əmələ ehtiyacın olmasaydı, onda «Yalvaranlar varmı? Bağışlanmalarını təmənna edənlər varmı? Tövbə edənlər varmı?» - müraciəti lüzumsuz və faydasız olardı. Belə danışırlar ki, Allahın Rəsulunun (122) iştirak etdiyi bir məclisdə onun silahdaşlarından biri Abdulla ibn Öməri (124) yada saldıqda Peyğəmbər (122) dedi: «O əgər gecə dualarını yerinə yetirsəydi, bütün insanların ən yaxşısı olardı». O (122), öz ardıcıllarından birinə müraciətlə: «Sən gecələr çox yatmalı deyilsən, ona görə ki, gecə çox yatmağın nəticəsi Qiyamət günündən həmin insanın heç nə ilə qalmasına səbəb olur».

Oğul, «Gecənin bir vaxtı durub ancaq sənə xas olan əlavə (təhəccüd) namazı qıl» (17:79) – əmrdir, «Səhərlər isə (Allahdan) bağışlanmalarını diləyirdilər» (51:18) – təşəkkürdür, «Sübh vaxtı Allahdan bağışlanmaq diləyənlərdir (sübh namazına qalxanlardır)» (3:17) – zikrdir. Peyğəmbər (122) deyib: «Üç səs Allahın xoşuna gəlir: xoruz səsi, Quran oxuyan şəxsin səsi və sübh vaxtı öz bağışlanması üçün yalvaran insanın səsi». Sufyan əs-Səuri (124) demişdir: «Allah (121) zikr və istiğfarları toplayaraq, onları Qüdrətli Allahın dərgahına aparan sübh küləyini yaratmışdır». O həmçinin demişdir: «Gecə başlandığında Taxt-tacın altından dəvət gəlir: «Qoy ibadət edənlər qalxsın». Onlar qalxıb Allahın (121) istədiyi qədər dua-səna edirlər. Sonra həmin səs gecənin yarısı çağırır:

«Qoy möminlər qalxsın». Onlar qalxırlar və sübhə qədər dua edirlər. Gecə sona yetəndə o bir daha müraciət edir: «Qoy bağışlanmaları üçün yalvaranlar qalxsın». Onlar qalxır və bağışlanmaları üçün dua edirlər. Səhər açılmağa başladıqda bir daha müraciət olunur: «Qoy laqeydlər qalxsın». Onlar məzarlardan yığılmış meyitlər kimi yerlərindən qalxırlar».

Oğul, deyirlər ki, Müdrik Loğmanın vəsiyyətlərində yazılıb: «Oğul, qoy xoruz səndən ağıllı olmasın. O, gecə başa çatmamışdan əvvəl banlayır, sənsə bu vaxt hələ yatırsan!» Aşağıdakı sətirləri deyən şəxs necə gözəl ifadə etmişdir:

Gecənin yarısı budağa qonub göyərçin
Quruldamağa başladıqda yatırdım mən.
Kəbəyə and olsun ki, yalançıyam, əgər sevsəydim,
Fəryadda məni ötə bilməzdi göyərçin.
Mən Allahımı dərin eşqlə sevdiyimi sanıram,
Lakin heyvanlar ağladıqda mən ağlamıram.

Oğul, itaətin və ibadətin nə olduğunu bilmək – həqiqi bilik elə budur.

Bil ki, itaət və ibadət şəriətin əmr və qadağan etdiklərinə söz və əməllə riayət etməkdir. Bu o deməkdir ki, sən bütün dediklərində, etdiklərində və etmədiklərində şəriətə əməl etməlisən. Məsələn, əgər sən İdədə və ya Təşrik günlərində[3] oruc tutsan, qanunu pozmuş olursan, ya da əgər sən başqasının əlindən zorla alınmış paltarla dua etsən, zahirən bu ibadət olsa da, sən mütləq cəzalanacaqsan.

Oğul, sənin sözlərin və hərəkətin şəriətə uyğun olmalıdır, ona görə ki, bilik və əməl şəriətə uyğun deyilsə, onda bu, xətadır və sən bayılma anına, sufilərin məclislərinə heyran olmamalısan. Bu yolla getmək cihad və cismani arzularla mübarizə tələb edir, gərək nəfsin istəklərini boş və uydurma şeylərlə deyil, tərbiyənin qılıncı ilə məhv edəsən.

Bil ki, çox danışan dil və bağlı ürək, tam biganəlik və arzulara itaət etmək – bədbəxtlik nişanələridir və əgər sən həqiqi cihad vasitəsilə öz nəfsini öldürməsən, sənin ürəyin bilik nuru ilə işıqlanmayacaq.

Bil ki, sənin suallarından bəzilərinə nə yazılı, nə də şifahi olaraq cavab vermək mümkün deyil. Əgər sən həmin hala nail olsan, onda bunun nə olduğunu anlayarsan, əgər nail olmasan, onda bunu

bilməyəcəksən. Zira bunu yalnız özündə hiss etməklə dərk etmək mümkündür və şirinin şirinliyi, acının acılığı kimi şeylərin heç birini sözlə ifadə etmək mümkün deyil, onları yalnız dadmaqla bilmək olar. Belə danışırlar ki, bir zəif adam öz dostuna məktub yazaraq ondan xahiş edir: «Cinsi əlaqə zamanı hiss olunan ləzzəti mənə izah et, bu necədir?» Dostu ona bu məzmunda cavab yazır: «Mən səni gücsüz bir adam sanırdım, lakin indi bildim ki, sən həm də axmaqsan. Ona görə ki, bu həzzi yalnız sınaqdan keçirməklə bilmək olar. Əgər sən bunu sınaqdan keçirməyə nail ola bilsən, onda bunun nə olduğunu anlayarsan, yox buna nail ola bilməsən, onda bunu nə sözlə, nə də məktubla izah etmək mümkündür».

Oğul, sənin bəzi sualların da buna bənzəyir, cavab vermək mümkün olan digərləri haqqında isə biz «Elmlərin yenidən yaranması» və başqa əsərlərdə söhbət açmışıq. Bunların da bir hissəsini sənə izah edək və beləliklə:

Allah (121) yolu ilə gedən insana dörd şey lazımdır:

Birincisi, yeni heç bir şey tətbiq olunmadan həqiqi və doğru iman.

İkincisi, səmimi tövbə ki, bundan sonra yenidən xətalar etmək üçün geriyə yol yoxdur.

Üçüncüsü, qeyri dostları əzizləmək, ona görə ki, heç kimə heç nədə borclu olmayasan.

Dördüncüsü, Allah-Təalanın (121) bütün əmrlərini yerinə yetirmək üçün kifayət qədər şəriət barədə bilik əldə etmək, yalnız bundan sonra xilasa aparan digər elmləri qazanmaq.

Belə deyirlər ki, Əş-Şəbali (124) dörd yüz müəllimə xidmət etdi və dedi: «Mən dörd min hədis oxudum və öyrəndim, sonra isə onlardan yalnız birini seçdim və ona əməl etdim, qeyrilərini kənara qoydum, ona görə ki, mən həmin hədisi oxuduqda öz xilasımı və qurtuluşumu onda tapdım, onunla kifayətləndim. Bu, Allahın Rəsulunun (122) öz ardıcıllarından birinə müraciətidir: «Öz dünyəvi həyatın üçün burada olduğun müddətin dərəcəsində çalış və öz axirət həyatın üçün orada olacağın müddətin həddində səy göstər, Allah üçün özünün Ona olan ehtiyacın ölçüsündə çalış və Cəhənnəmdən qurtulmaq üçünsə ona dözə biləcəyin həddə səy göstər».

Oğul, əgər sən bu hədisi bilirsənsə, onda çox miqdarda biliyə ehtiyacın yoxdur. Və digər rəvayətlərə də qulaq as. Məsələn, Xatim əl-Əssam (124) Əş-Şəkik əl-Bəlahiyyənin (124) dostu idi və bir dəfə ona belə bir sualla müraciət etdi: «Sən otuz il ərzində mə-

nim dediklərimə əməl etmisən. Bu müddət ərzində nəyə nail olmusan?» O isə cavabında belə dedi: «Mən səkkiz sayda faydalı şeyə nail olmuşam və bunlar haqqındakı biliyim kifayət edər, belə ki, mənim qurtuluşumun və azad olmağımın məhz bunlarda olduğuna mən əminəm». Şəkik ondan soruşdu: «Bunlar hansılardır?» Xatim əl-Əssam cavab verdi: «Birincisi, mən mövcudatı öyrəndim və gördüm ki, bunların hər birinin sevdiyi və onun tərəfindən sevildiyi sevgilisi vardır. Bu sevgililərdən bəziləri insanı ölənə qədər, bəziləri isə məzarın divarlarına qədər müşayiət edir, sonra hər biri geri qayıdır, onu tək qoyur və bunların heç biri onunla məzara varid olmur. Mən bu haqda düşündüm və öz-özümə dedim: ən yaxşı sevgili öz sevdiyi ilə məzara girən və onun təkliyini bölüşəndir. Mən mömin əməllərdən başqa buna uyğun gələn heç nə tapmadım və özümə onları sevgili sifətilə qəbul etdim ki, onlar məzarda mənim üçün çıraq kimi işıq saçsınlar, mənimlə orada birlikdə olsunlar və məni tək qoymasınlar.

İkincisi, mən gördüm ki, insanlar öz arzularına mane olmurlar və nəfslərinin istədiyinə can atırlar. Mən Allah-Təalanın: «Amma kim (Qiyamət günü) Rəbbinin hüzurunda durmaqdan qorxmuş və nəfsinə istəyini, şəhvəti qadağan etmişsə, həqiqətən, onun yurdu Cənnətdir!» (79:40-41) sözlərini öyrəndim və əmin oldum ki, Quran – əsl həqiqətdir. Mən öz nəfsimlə ona istədiyini verməməklə mübarizəyə başladım və o, Allah-Təalaya (121) itaət edənə və Ona tərəf yönələnə qədər bu mübarizəni apardım.

Üçüncüsü, mən gördüm ki, hər bir insan dünyəvi həyatın fani şeylərini daha çox yığmağa səy göstərir, sonra da onu öz əllərində sıxır və mən də Allah-Təalanın (121): «Sizdə olan (dünya malı) tükənər, Allah dərgahında olan (axirət nemətləri) isə əbədidir» (16:96) sözlərini öyrəndim. Mən malik olduğum şeylərin hamısını kasıblara paylamaqla Allah (121) yolunda xərclədim ki, bu, mənə Allah-Təalanın (121) dərgahında durduğum zaman kömək etsin.

Dördüncüsü, mən gördüm ki, insanların bir hissəsi belə hesab edir ki, onların ləyaqəti və alicənablığı özlərinin tayfasından və nəslindən asılıdır və bununla da fəxr edirlər. Başqaları isə fikirləşirlər ki, bu keyfiyyətlər əmlakın və uşaqların çox olmasında özünü göstərir və bununla fəxr edirlər. Bəziləri düşünürlər ki, nəciblik və ləyaqət insanların əlindən varını almaqda, onlarla ədalətsiz davranmaqda və qanlarını tökməkdədir. Bir qrup adam belə hesab edir ki, bu keyfiyyətlər öz var-dövlətini xərcləməkdə və on-

ları yelə verməkdədir. Mən isə Allah-Təalanın (121): «Allah yanında ən hörmətli olanınız Allahdan ən çox qorxanınız, pis əməllərdən ən çox çəkinəninizdir» (49:13), - sözlərini oxuyub öyrəndim və Allahdan (121) qorxmağı seçdim və özümü əmin etdim ki, Quran – əsl həqiqətdir, başqalarının düşündüklərinin və hesab etdiklərinin hamısı isə yalan və uydurmadır.

Beşincisi, insanların bir-birini ləkələdiyini və pislədiyini gördükdə, mən başa düşdüm ki, bütün bunlar var-dövlətə, mövqeyə, elmə olan paxıllıqdan əmələ gəlir. Mən də Allah-Təalanın (121): «Dünyada onların dolanacaqlarını öz aralarında Biz bölüşdürdük» (43:32), - sözlərini öyrəndim və bildim ki, hər bir şeyi Allah-Təala (121) hələ ruh yaranmamışdan qabaq bölüşdürmüşdür. Mən də Allah-Təalanın (121) bu bölgüsü ilə razılaşaraq heç kimə paxıllıq etmədim.

Altıncısı, mən gördüm ki, insanlar bir-biri ilə hər hansı bir şeyə və ya hər hansı səbəbə görə rəqabət və mübarizə aparırlar. Mən isə Allah-Təalanın (121): «Həqiqətən, Şeytan sizin düşməninizdir, onu (özünüzə) düşmən tutun» (35:6), - sözlərini diqqətlə öyrəndim və anladım ki, şeytandan başqa heç kimlə düşmənçilik etmək olmaz.

Yeddinci, mən gördüm ki, hər bir insan özünün bütün gücünü və qüvvəsini sərf edərək mövcudluq üçün lazım olan vasitələrin əldə olunmasına səy göstərir və bu zaman hansısa bir anda şübhəyə daxil olur və harama əl atır, özlərini biabır edir və ləyaqətlərini alçaldırlar. Mən də Allah-Təalanın (121): «Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, Allah onun ruzisini verməsin» (11:6), - sözlərini öyrəndim və mənə aydın oldu ki, Allah (121) məni qida ilə təmin edir və bunun məsuliyyətini O, öz üzərinə götürmüşdür. Mən də Ona sitayiş etməyə başladım və Ondan qeyri başqalarına ümid etməkdən və nə isə digər birini arzulamaqdan əl çəkdim.

Səkkizinci, mən gördüm ki, bütün insanlar hansısa bir yaradılana: bəziləri dinara və dirhəmə, digərləri var-dövlətə və əmlaka, bəziləri də məşğuliyyətə və peşəyə, kimsə də özü kimi başqa bir yaradılmışa söykənir. Mən Allah-Təalanın (121): «Kim Allaha təvəkkül etsə, Allah ona kifayət edər. Allah öz buyruğunu yerinə yetirəndir. Allah hər şey üçün bir ölçü (hədd, müddət) təyin etmişdir», - sözlərini diqqətlə öyrəndim və Allaha (121) təvəkkül etdim. Mənə O bəsdir və O necə gözəl bir Qəyyum və Qoruyandır!»

Şəkik dedi: «Allah sənə kömək olsun, doğrudan da, mən Tövratı, Bibliyanı, Zəburu və Quranı oxuyub öyrəndim: bu kitabların hamısı bu səkkiz faydaya əsaslanmışdır. Kim bu faydalara uyğun hərəkət edərsə, bütün dörd kitaba əməl etmiş olur».

Oğul, bu iki rəvayətdən sənə aydın oldu ki, böyük sayda bilik qazanmağa ehtiyacın yoxdur. İndi isə mən sənə həqiqət yolunda gedən adam üçün nə lazım olduğunu izah edim.

Bil ki, bu yolçunun elə bir şeyxə və mürşidə ehtiyacı var ki, öz tərbiyəsi ilə yolçunu mənfi keyfiyyətlərdən qurtara və yalnız bundan sonra əvəzində müsbət keyfiyyətlər qazana bilsin. Tərbiyə öz mənasına və əhəmiyyətinə görə əkdiyi tinglərin yaxşı bitməsi və çiçəkləməsi üçün onların arasındakı tikanları qoparan və alaq otlarını təmizləyən kəndlinin gördüyü işə bənzəyir. Bu yolun yolçusu da onu tərbiyə edən və Allah-Təala (121) yolu ilə aparan şeyxə ehtiyaclıdır, ona görə ki, Allah (121) qullarına düzgün yolu göstərmək üçün onlara Rəsulunu (122) göndərmişdir. Peyğəmbər (122) özündən sonra canişinlərini saxlamışdır ki, onlar da öz növbəsində insanlara Allah-Təala (121) yolunu göstərsinlər. Allahın rəsulunu (122) əvəz etməyə münasib olan şeyx də alim olmalıdır, lakin hər bir alim onun (122) canişini ola bilməz.

Mən sənə ümumi formada onun nişanələrindən söhbət edim ki, onlardan hər hansı biri özünü mürşüd adlandıra bilməsin. Və biz belə hesab edirik: bu şəxs dünyəvi həyatla bağlılığını və yüksək mövqeyə məhəbbətini saxlayan kəsdir; o, bilikli şəxsin – varislik silsiləsini təşkil edənlərdən biri olan şeyxin ardınca gedir, bu silsilə (ruhi bağlılıq) də cənabi Peyğəmbərə (122) qədər davam edir; o, qidasının, sözlərinin və yuxusunun miqdarını azaltmaqla, ibadətlərin, sədəqənin və orucunun sayını artırmaqla öz üzərində işləyir. Həqiqi şeyxin ardıcılı olaraq öz xarakterində səbir, ibadət, təşəkkür, təvəkkül, möhkəm inam və bilik, zahidlik, ruhən sakitlik, xeyirxahlıq, itaətkarlıq, bilik, səmimiyyət, təvazökarlıq, sədaqət, ciddilik, az danışmaq, müntəzəmlik və başqa bu kimi müsbət keyfiyyətləri tərbiyə edir. Əgər o, Peyğəmbərin (122) nuru ilə işıqlanmışsa, – onda onun ardıcılı olmaq mümkündür. Lakin belə insanlar qırmızı kükürddən də azdır. Belə bir şeyxi tapmaq xoşbəxtliyi üzünə gülən şəxs - əgər şeyx onu öz yanına qəbul etmişsə - həm daxilən, həm də zahirən şeyxə hörmət etməlidir. Zahiri hörmət ondan ibarətdir ki, hətta əgər bilsə də ki, şeyx səhv edir, yenə də onunla hər bir məsələdə mübahisə etməməlidir. Onun qarşısında

öz xalçasını açmamalıdır. Yalnız ibadət zamanında bunu etməli, ibadət qurtardıqdan sonra da onu götürüb qaydaya salmalıdır. Onun iştirak etdiyi məclisdə həddindən çox əlavələr həyata keçirməməlidir. O, öz gücü və imkanı daxilində yalnız şeyxin göstərişlərini yerinə yetirməlidir. Daxili hörmətsə o deməkdir ki, həmin adam şeyxindən zahiri eşitdiklərini və qəbul etdiklərini öz qəlbində nə əməllərlə, nə də sözlə inkar etməlidir, yoxsa o, riyakar olar. Əgər o, bunu etməyə bilmirsə, onda daxili dünyası zahiri formalara uyğun gələnə qədər qoy öz şeyxindən ayrılsın. O, şeytanın, cinlərin və insanların onun ruhu üzərindəki hakimiyyətini zəiflətmək üçün pis adamlarla ünsiyyətdən qaçmalı, şeytanların murdarlığından təmizlənməli və kasıblığı zənginlikdən üstün tutmalıdır.

Onu da bil ki, təsəvvüfün iki hissəsi var: bunlar Allah-Təalaya (121) düzgün münasibət, Onun yolunda (istikama) dözümlü olmaq və həmçinin də insanlarla sakit rəftardır.

Allaha (121) münasibətdə özünü düzgün aparan və insanlara yaxşı münasibət bəsləyən, onlarla xeyirxah davranan şəxs sufidir. İstikama isə Allah-Təalanın (121) əmrlərini öz maraqlarından üstün tutmaqdır. İnsanlarla xoş rəftar etməksə insanları öz nəfsinin istədiyi əməllərə məcbur etmək deyil, onların arzularına uyğun və şəriətə düz gələn hərəkət etməkdir.

Sonra sən məndən ibadət barədə soruşursan ki, bu da özündə üç şeyi birləşdirir: birincisi, şəriətin əmrlərinə əməl etmək, ikincisi, taleyə və Allah-Təalanın (121) hökmlərinə boyun əymək, üçüncüsü isə Allahın (121) razı qalması naminə öz şəxsi rifahından imtina etməkdir.

Sən məndən həm də təvəkkül haqqında soruşursan: bu isə Allah-Təalanın (121) vəd etdiklərinə inanmaqdır, yəni hətta əgər dünyanın bütün adamları bunun əksinə getsə də belə, sənin alnına yazılmış şeylər mütləq baş verəcəkdir və dünyanın bütün adamları sənin üçün nəyəsə can atsalar da belə, sənin qismətində olmayan şey baş verməyəcəkdir.

Sən məndən səmimilik haqqında soruşursan: bu, hər şeyi Allah-Təalanın (121) adı ilə sənin ürəkdən etməyindir ki, bu zaman sənin qəlbin insanların təriflərindən sevinmir və onların tənələrinə də əhəmiyyət vermirsən. Bil ki, özünü yalandan nümayiş etdirmək insanların tərifləməsindən yaranır. Əgər sən onların iradədən asılı insanlar olduğunu və onların heç bir səadətin və bədbəxtliyin səbəbi ola bilməyən bir predmet kimi var olduqlarını düşünsən, onda

sən həmin pis xüsusiyyətlərdən qurtula bilərsən. Bu, səni onların qarşısında özünü göstərməyə can atmaqdan qurtarar. Əgər sən onların qüdrət və iradə sahibi olduqlarını düşünürsənsə, onda onların qarşısında özünü göstərməkdən qurtula bilməyəcəksən.

Oğul, sənin qalan suallarının bəzilərinin cavablarını mənim əsərlərimdə axtar, onların bəzilərinə cavab vermək günahdır. Sənə məlum olanları et, onda sənə məlum olmayanlar da sənin üçün aydınlaşar.

Oğul, sənin nəyi başa düşmədiyin şeyləri yalnız ürəyin dili ilə məndən soruş, axı Allah-Təala (121) deyib: «Əgər onlar sən qarşılarına çıxıncaya qədər səbir etsəydilər, (bu, Allah yanında) onlar üçün, əlbəttə, daha yaxşı olardı» (49:5). Və əl-Xızırın məsləhətinə qulaq as və o, bu cür ifadə edilir: «Səbəbini sənə izah etməyincə, məndən heç bir şey haqqında soruşma!» (18:70). Zamanı gələnə qədər tələsmə, həmin an gəldikdə isə o, özü sənə aydınlaşacaq və sən onu görəcəksən: «Ayələrimi (Peyğəmbərin dediyi sözlərin düzgün olmasını, əzabımı tezliklə) sizə göstərəcəyəm. Hələ Məni tələsdirməyin!» (21:37). Məndən onun zamanı gəlincəyə qədər soruşma və bil ki, öz suallarına cavabı yalnız o halda taparsan ki, bir yerdə dayanıb durmayasan, axı Allah-Təala (121) özü buyurub: «Məgər onlar yer üzündə dolaşıb özlərindən əvvəlkilərin axırının necə olduğunu görmürlərmi?» (35:44).

Oğul, Allah (121) xatirinə səndən xahiş edirəm, gəz-dolaş və sən çoxlu möcüzələr görəcəksən, öz qəlbini buna qurban et. Zunnun əl-Misri (124) öz şagirdlərindən birinə dedi: «Əgər sən öz qəlbini qurban etməyə hazırsansa, onda buyur, əgər yox, onda sufilərin məşğul olduqları ilə məşğul olma».

Oğul, mən sənə məsləhət görürəm ki, biliyinin Qiyamət günündə sənin rəqibin olmamağı üçün məndən bu səkkiz şeyi götür. Bunlardan dördünü yerinə yetir, dördünü isə saxla.

Saxlamalı olduğun şeylər bunlardır:

Birincisi, öz imkanların daxilində heç kimlə heç bir məsələ barədə mübahisə etmə, çünki mübahisə bir çox bəlaların səbəbidir və ona görə olan cəza onun faydasından çoxdur. Ona görə ki, bu, özünü göstərmək, paxıllıq, təkəbbür, nifrət, düşmənçilik, lovğalıq və bu kimi nöqsanların ilkin səbəbidir. Bəli, əgər səninlə bir şəxsin və ya bir qrupun arasında mübahisəli məsələ yaranıbsa və sən istəyirsən ki, həqiqət itməsin, qələbə çalsın, onda mübahisə etmək olar, lakin bu cür istəyin iki əlaməti var. Birincisi, həqiqətin sənin

və ya bir başqasının tərəfindən açılmasının sənin üçün heç bir təfavütü olmamalıdır. İkincisi, mübahisənin cəmiyyət içərisində baş verməsindənsə, təklikdə olması sənin üçün daha üstün olmalıdır. Mənə qulaq as və mən sənə faydalı bir məsləhət verim, bil ki, mübahisə haqqındakı məsələ ürəyin xəstəliyinin nişanəsidir, onun cavabı müalicənin başlanmasıdır. Və bunu da bil ki, cahillərin ürəyi xəstəliyə tutulmuşdur, alimlər isə həkimlərdir və biliyi kifayət qədər olmayan alim yaxşı müalicə edə bilməz. Hətta kifayət qədər elmli alim bütün xəstəlikləri deyil, yalnız sağalan və düzələ bilən xəstəlikləri müalicə edə bilir. Əgər müalicə artıq gecikibsə, xəstəlik xroniki və sağalmaz hala keçmişsə, onda həkimin ustalığı bu xəstəliyin artıq sağalmaz olduğunu və bu xəstəlikdən qurtulmaq üçün səy etməyin lazım olmadığını deməkdən ibarətdir, çünki bu, zamanın boş yerə itirilməsidir.

Bunu da bil ki, cahillik xəstəliyi dörd cür olur: bunlardan yalnız birini sağaltmaq mümkündür, qalanlarını isə yox. Sağalması mümkün olmayanlar bunlardır: birincisi, insan suallar verir və paxıllığından, nifrətindən qəti etiraz edir və sən nə qədər yaxşı və tam cavab versən, sənin cavabların nə qədər bəlağətli və aydın olsa, onun nifrətinə, düşmənçiliyinə və paxıllığına bir o qədər əlavə olunacaq. Yaxşısı budur ki, ona cavab verməyəsən, zira deyilib:

> Sənə paxıllığından düşmən olanın nifrətindən savayı,
> Hər bir nifrətdən və düşmənçilikdən qurtulmaq olar.

Ondan üz döndər və onu öz xəstəliyi ilə baş-başa burax. Allah-Təala (121) buyurub: «Artıq (Ya Peyğəmbər) Bizim Quranımızdan üz çevirib dünya həyatından başqa bir şey istəməyənlərdən üz döndər!» (53:29). Paxıl insan bütün sözləri və hərəkətləri ilə öz əməllərinin odununda ocaq çatır. Peyğəmbərimiz (122) deyib: «Alov quru oduncaqları yandıran kimi, paxıllıq da xeyir əməlləri məhv edir». İkincisi, onun mərəzinin səbəbi səfehlik olduqda, bu xəstəliyi də sağaltmaq mümkün olmur, zira İsa (123) deyib: «Doğrudan da, mən ölüləri dirildə bilirəm, lakin axmaqları sağalda bilmirəm». Belə şəxs biliklərin qazanılması ilə çox məşğul olmur və ilahiyyat elmlərindən və şəriətdən nə isə bir şey öyrənir, sonra isə sual verir və axmaqlığı ucbatından öz ömrünü ilahiyyatın və şəriətin öyrənilməsinə sərf edən böyük bir alimə qarşı qəti etiraz edir. Bu səfeh heç bir şey bilmir və düşünür ki, ona çətinlik törədən nə isə bir şey, yəqin ki, həmin böyük alim üçün də çətinlik yaradacaqdır. Əgər o, bunu anlamırsa, onda onun sualı da səfehliyi

ucbatındandır və ona cavab verib əmək sərf etməyinə dəymir. Üçüncüsü, əgər o, istiqamət üçün xahiş edir, böyük alimlərin sözlərindən anlamadıqlarını öz idrakının zəifliyinə aid edirsə və fayda götürmək üçün soruşursa, onda belə şəxsin də mərəzi sağalmazdır. Bununla birlikdə o, səfehdir və əsas mahiyyəti anlamır – beləsinə də cavab verməyinə dəymir, belə ki, Allahın Rəsulu (122) buyurub: «Biz peyğəmbərlərə əmr olunmuşdur ki, insanlara onların ağlına görə müraciət edək».

Sağalması mümkün olan xəstəliksə odur ki, bu zaman insan məsləhət təmənna edir. Bu zaman həmin şəxsin özü ağıllıdır və əsas mahiyyəti anlayır, onun qəlbinə paxıllıq, qəzəb, yüksək mövqeyə və zənginliyə can atmaq xüsusiyyətləri dolmamışdır. Əgər o, doğru yolla getmək istəyirsə, həsədə, inada görə və yoxlamaq məqsəilə soruşmursa və etiraz edirsə, onda bu, sağalandır və sən ona nəinki cavab verə bilərsən, hətta cavab verməlisən.

İmtina etməli olduğun ikinci şey: müəllim və vaiz olmaqdan ehtiyat et, ona görə ki, sən dediklərini əvvəlcədən özün etməli, daha sonra isə insanları bunu etməyə səsləməlisən və əgər belə etməsən, səni çox böyük bəlalar gözləyir. İsaya (123) deyilənlər haqqında düşün: «Məryəmin oğlu, əvvəl özünə öyüd ver, sonra başqalarına məsləhət gör, əgər belə etməsən, onda öz Allahından utan». Lakin əgər sənin qismətinə belə bir sınaq düşmüşsə, onda iki şeydən özünü qoru.

Birincisi, nitqdə ifratçılıq və sünilik. Bu, cümlələrə, şeirlərdən gətirilən sətirlərə və nümunələrə aiddir, ona görə ki, Allah-Təala (121) süniliyi və hiyləni sevmir, hiyləgər isə odur ki, hüdudları keçir və bu da onun daxilinin xarab olmasını və ürəyinin pozğunluğunu göstərir. Öyüd - axirət həyatındakı Odu və Yaradanın xidmətində kifayət qədər səy göstərmədiyini qulun yadına salmaqdır; ona kömək etməyəcək şeylərə sərf etdiyi keçmiş həyatı barədə düşünməyə onu məcbur etməkdir; naxoşluq və axırətdə onun inamının kifayətsizliyi kimi maneələr haqqında fikrləşməyə onu təhrik etməkdir. Bu, insanın ölüm Mələyinin ağuşunda düşəcəyi vəziyyət barədə və İnkir və Minkirin suallarına cavab verə bilib-bilməyəcəyi haqqında onu düşünməyə məcbur etməkdir ki, həmin şəxs Qiyamət günündəki halı, Sirat körpüsündən müvəffəqiyyətlə keçə biləcəyi və ya sonsuzluğa yuvarlanacağı haqqında təşvişə düşsün.

İnsanlara biliyin öyrədilməsi, bu şeylərin hamısının – insan

laqeydliyinin və qayğısızlığının, insani çatışmamazlıqların – onlara nişan verilməsi və bu əməli elə həyata keçirmək ki, bu odun istisi iştirak edənlərə çatsın və onları gözləyən bəlalar qarşısında onların qəlbini qorxu sarsın ki, onlar keçmiş həyatlarında etdiklərini imkan daxilində düzəldə bilsinlər və qalan günlərini Allah-Təalaya (121) ibadətdən qeyri bir başqa işlə məşğul olmasınlar – nəsihət vermək elə budur. Məsələn, əgər sən görsən ki, bir şəxsin evinə torpaq uçqunu gəlir və həmin şəxs öz ailəsi ilə birlikdə evdədir, belə bir anda sən: «Qaçın! Qaçın! Canınızı qurtarın», - deyə qışqıracaqsan və bu zaman sənin ürəyin həmin evin sahibinə bu xəbəri nitqindəki israfçılığın, süniliyin, kəskinliyin, müqayisənin köməyi ilə verməyi arzulayırmı? Əlbəttə, yox. Vaiz də məhz belə bir vəziyyətdə olur və o, bunlardan qorunmalıdır.

Sənin qorunmalı olduğun ikinci şey odur ki, xütbələrində sənin səylərin ona yönəlməməlidir ki, insanlar bu məclislərdə müəyyən səslər ifa etsinlər və ya öz böyük məhəbbətlərini izhar edib, öz paltarlarını cırsınlar və «Bu ən gözəl məclisdir», - desinlər. Ona görə ki, bunların hamısı dünyəvi həyata can atmaqdır və diqqətsizlikdən irəli gəlir. Sənin səylərin və coşqunluğun insanların dünyəvi həyatdan əl çəkmələrinə və axirət həyatına qayıtmalarına, günahdan itaətə, acgözlükdən zahidliyə, xəsislikdən səxavətə, şübhədən inama, təkəbbürdən təvazökarlığa keçmələrinə istiqamətlənməlidir ki, onlar qəflət yuxusundan oyansınlar. Onları axirət həyatını sevməyə və ürəklərindən fani şeyləri qovmağa çağırmaq, onlara ibadət elmini və zahidliyi öyrətmək lazımdır, bu zaman insanları Allah-Təalanın (121) Səxavətinə və Onun Mərhəmətinə tamahsılandırmaq olmaz, çünki onlar öz təbiətinə görə şəriət yolundan sapmağa və xətalı keyfiyyətlər əldə edərək Allah-Təalanın (121) sevmədiyi şeylərlə məşğul olmağa meyllidirlər. Onların ürəyinə qorxu yerit, onları vahiməyə sal, onları gözləyən dəhşət haqqında xəbərdarlıq et ki, bunlar, bəlkə, onların daxildən və zahirdən dəyişmələrinə səbəb olar, onlarda ibadətə güclü həvəs və səy yaranar, günahlardan isə imtina edərlər. Bu, təbliğ və nəsihət yoludur ki, hər bir vaiz bu yolla getmir və onda həmin vaiz onu eşidən və ifadə edən insanlar üçün təhlükə yaradır. Hətta belə deyirlər ki, belə şəxs insanları yolundan sapdıran, onları məhv edən əjdaha və iblisdir və insanlar beləlırindən uzaq qaçmalıdırlar, ona görə ki, şeytanın özü belə insanları öz yolundan bu cür sapdıra və onların dinlərini bu cür korlaya bilməz. Kim bacarırsa

və buna imkanı varsa, qoy moizə yerlərindən uzaq dursun və buna artıq başlayanlara da qadağan etsin, çünki bunun özü xeyirxah əməl həyata keçirmək və pis işi qadağan etmək tapşırığıdır.

Sənin etməli olmadığın üçüncü şey hökmdarlarla və soltanlarla ünsiyyətdə olmaqdır, sən onları görməməlisən, ona görə ki, onlara baxmaq və onlarla ünsiyyətdə olmaq böyük bəladır və əgər sənin bəxtinə belə bir sınaq düşərsə, onda onlara tərif demə və onları yüksəklərə qaldırma, çünki Allah-Təala (121) nöqsanlı və ədalətsiz adamları tərifləyənləri görmək istəmir. Əgər kimsə pis adamın ömrünün uzanması üçün dua edirsə, deməli, o arzu edir ki, həmin adam Allahın (121) torpağında Ona itaətsizlik göstərsin.

Sənin etməli olmadığın dördüncü şey odur ki, sən hökmdarların hədiyyələrini və bəxşişlərini, hətta onların halal olduğunu bilsən də, qəbul etməməlisən, çünki bu, yaltaqlığa, onların düşüncələrinin qayğısına qalmağa və onların insanlara qarşı ədalətsiz əməlləri ilə razı olmağa gətirib çıxarır. Bütün bunlar imana zərər gətirir və ən kiçik ziyan da odur ki, onların hədiyyələrini qəbul etməklə və sənin üçün yaratdıqları rifahdan istifadə etməklə onları sevməyə başlayırsan. Kimisə sevən, ona uzun ömür arzulayan insan, əgər bu uzun ömür ədalətsiz bir şəxs üçün arzulanırsa, deməli, Allah-Təalanın (121) qullarına ədalətsiz münasibət arzulayır və dünyanın dağılmasını diləyir. İman və Axır üçün bundan pis nə ola bilər? Əgər sən onlardan dinar və dirhəm götürüb kasıblara və bədbəxt insanlara paylasan, bu daha yaxşı olar, çünki onlar bu pulu nöqsanlı və günah şeylərə xərcləyirlər və əgər sən bu pulu yoxsullar üçün sərf etsən, daha gözəl olar, – deyən iblisin və bəzi insanların yalanlarından və aldatmalarından qorun və həqiqətən də, lənətə gəlmiş şeytan bu yolla çox insanları məhv etmişdir və bu haqda biz «İman haqqındakı elmlərin yeni yüksəlişi» kitabında söhbət açmışıq, bu barədə oradan oxu.

Bunlar isə sənin etməli olduğun dörd şeydir:

Birincisi, sənin qulun sənə elə münasibət bəsləyə bilər ki, ona qəzəblənmədən və ondan incimədən bu cür münasibətdən çox razı qalardın, bil ki, sən də öz növbəndə Allah-Təalaya (121) bu cür münasibət bəsləməlisən. Sən öz qulundan nəyə görə narazısansa, Allah (121) da ona görə səndən narazı olacaqdır. Allah-Təala (121) sənin həqiqi Ağandır.

İkincisi, insanların səninlə necə münasibətdə olmaqlarını istəyirsənsə, sən də onlarla o cür münasibətdə ol, ona görə ki, insa-

nın imanı yalnız o vaxt kamil olur ki, özünə arzuladıqlarını başqalarına da arzulayır.

Üçüncüsü, əgər sən hər hansı elmi öyrənirsənsə və ya hər hansı biliyi əldə edirsənsə, onda onlar sənin ürəyini islah edən və ruhunu paklaşdıran şeylər olmalıdır. Məsələn, əgər sən bilsən ki, yalnız bir həftəlik ömrün qalıb, bu halda sən dəqiq olaraq əxlaq, fiqhin əsasları, ilahiyyat və başqa bilikləri öyrənməyəcəksən, çünki bu elmlərin sənə kömək etməyəcəyini bilirsən. Səni dünyəvi həyatla bağlayan şeylərdən kənarlaşaraq, yalnız ürəyi öyrənməklə ruhun xassələrinin tədqiqi ilə məşğul olacaqsan, özünü ruhun rəzil keyfiyyətlərindən təmizləməyə sərf edəcəksən, könlünü Allah-Təalanın (121) məhəbbətinə və Ona ibadətə, müsbət keyfiyyətlərin əldə olunmasına bağlayacaqsan və bil ki, elə bir gecə və gündüz yoxdur ki, qula öz ölümünü gətirə bilməsin.

Oğul, mənə qulaq as və sözlərim barədə onlarda öz xilasını tapana qədər düşün: əgər sənə desələr ki, bir həftədən sonra yanına soltan təşrif gətirəcəkdir, onda mən bilirəm ki, sən yalnız soltanın baxıb fikir verəcəyi şeylərlə, məsələn, paltarla, öz bədəninlə, evinlə, yatacağınla və bu kimi başqa şeylərlə məşğul olacaqsan. İndi isə mənim sənə dediklərim barəsində düşün. Mən bilirəm ki, sən bunun mahiyyətini anlayacaqsan, çünki fərasətli insana bir kəlmə söz də kifayətdir. Allahın Rəsulu (122) buyurub: «Doğrudan da, Allah sizin görünüşünüzə və əməllərinizə deyil, sizin ürəyinizə və niyyətlərinizə baxacaqdır». Əgər sən ürəyin nə olduğu haqqında daha çox bilmək istəyirsənsə, onda bu barədə «İman haqqındakı elmlərin yeni yüksəlişi» və digər əsərlərimdə oxuya bilərsən. Bu bilik hamı üçün zəruridir və Allah-Təala (121) qarşısındakı borcların yerinə yetirilməsi üçün vacib olanlardan başqa, digərləri də müəyyən dərəcədə vacibdir, sən bu bilikləri əldə edənə qədər O, sənə kömək edəcəkdir.

Dördüncüsü, dünyəvi həyatdan yalnız bir il müddətinə sənə lazım olan qədərinə malik olmalısan, Allahın Elçisi (122) də belə etmişdir. O, öz otaqlarının bəziləri üçün məhz bu qədər miqdarda ehtiyat tədarük etmiş və demişdir: «Ey Allah, Məhəmmədin ailəsini kifayət qədər qida ilə təmin et». Lakin O, bunu özünün bütün otaqları[4] üçün deyil, yalnız ürəklərində zəiflik gördüyü qadınları üçün etmişdir. İmanlarının gücünə heç bir şübhəsi olmadığı qadınlar üçünsə yalnız bir günlük və ya yarım günlük qida tədarükü görmüşdür.

Oğul, burada mən sənin xahiş etdiklərin haqqında yazmışam, bunlara əməl et və bu zaman məni yaddan çıxarma. Məni öz dualarında xatırla. Sənin məndən istədiyin dualara gəldikdə isə, bunları mötəbər duaların (Peyğəmbər (122) tərəfindən ifadə edilmiş) arasında axtar və bu duanı həmişə, əsasən də, namazdan sonra oxu:

*«Ey Allah, Səndən bütöv nemət, davamlı himayə, geniş mərhəmət, əmin-amanlıq, sakit və ən xoşbəxt həyat, daha kamil iltifat, ən yüksək mükafat, daha xoş və faydalı mərhəmət diləyirəm.*

*Ey Allah, bizimlə ol və bizim əleyhimizə olma.*

*Ey Allah, bizim həyatımızı xoşbəxtliklə başa vur və bizim daha çox miqdarda arzularımızı həyata keçir, elə et ki, əmin-amanlıq bizim yolumuzu və axirətimizi müşayiət etsin, Öz Mərhəmətinə qovuşdur və Öz Əfvini bizim günahlarımızın üzərində artır, bizi nöqsanlardan qurtulmaqla mükafatlandır və bizim ehtiyatlarımızı savablandır, biz hamımız Sənin dinin üçün çalışırıq, Sənə ümid bağlayırıq və Sənə etibar edirik. Ey Allah, bizi düzgün yolda möhkəmləndir və bizi Qiyamət günündə tövbəyə səbəb ola biləcək şeylərdən qoru, bizim günahlarımızın yükünü yüngülləşdir və bizi əxlaqlıların həyatı ilə mükafatlandır və bizi həm bu dünyada, həm də o dünyada kədərləndirən şeylərdən uzaq et. Bizi pis adamların şərindən, nöqsanlı adamların yalanından qoru və bizi - atalarımızı, analarımızı, qardaş və bacılarımızı Cəhənnəm odundan xilas et, Sənin Mərhəmətini diləyirik, ey Qüdrət Sahibi, ey bütün günahları Bağışlayan, ey Səxavətli, ey bizi Qoruyan, ey gecə və gündüzü Yaradan, bizi fani həyatın kədərlərindən, qəbir cəzalarından və Cəhənnəmdən xilas et, ey hər şeyi Bilən, ey Qüvvət Sahibi, ey Allah, ey Allah, ey Allah! Sənin Mərhəmətini diləyirəm, ey bütün mərhəmətlilərin Ən Mərhəmətlisi, ey əzəlilərin Ən Əzəlisi, ey sonuncuların Ən Sonuncusu, ey Qüdrət və Qüvvət Sahibi! Ey bədbəxtlərə mərhəmət Əta Edən, ey rəhmlilərin Ən Rəhmlisi, səndən başqa Allah yoxdur! Ən Pak Sənsən! Doğrudan da, Sənin qanunlarını pozanlardan biri mən olmuşam! Qoy Allah cənabi Məhəmmədə, onun ailəsinə və bütün yaxın tərəfdarlarına xeyir-dua versin və Allaha, dünyaların Hakiminə həmd-səna olsun!»*

---

[1] Ritl – 449, 28 qrama bərabər olan çəki vahidi.

[2] Peyğəmbərin (122) silahdaşlarından biri.

[3] Təşrik – Qurban bayramından sonrakı üç gün.

[4] Onun arvadlarının otaqları nəzərdə tutulur.

## GİRİŞ

Bütün yazılanlardan və bütün deyilənlərdən çox yüksək olan Allaha həmd olsun. Bələdçiliyi sayəsində bütün yanlışlardan kənarda olduğumuz Allahın Peyğəmbəri və Rəsulu Məhəmmədə, o cümlədən onun ailəsinə və yaxın tərəfdarlarına Allahın xeyir-duası olsun.

Ey mənim iman qardaşım, məndən xahiş etmisən ki, elmlərin məqsədlərindən və onların sirlərindən, biliklərin hüdudlarından və onların dərinliyindən səni agah edim; müxtəlif üsulları və fəaliyyət formalarını üstün tutan cərəyanların toqquşmasından həqiqəti aşkar etdiyim zaman nələrə qatlandığımı sənə nağıl edim; ənənələrin ətəyindən bəsirət yüksəkliyinə qalxmağa necə cürət etdiyim barədə, birincisi - kəlamın öyrənilməsindən əldə etdiyim fayda, ikincisi - imam ənənələri ilə həqiqətə nail ola bilməyən təlimatlar üsulunda mənim qəlbimə yatmayan şeylər, üçüncüsü - filosofluq üsullarında istehza etdiyim şey və nəhayət, sufilərin üsullarında mənim xoşuma gələnlər haqqında sənə danışım. Sən məndən xahiş etmisən ki, insanların mühakimələrini öyrəndiyim zaman həqiqətin hansı incilərinin mənim qarşımda açıldığını çoxlu sayda şagirdlərim olmasına baxmayaraq, nəyə görə elmlərin Bağdadda yayılmağından əl çəkdiyimi və uzun fasilədən sonra Nişapurda bu işlə məşğul olmağa məni vadar edən səbəblər barədə sənə nəql edim.

Sənin istəklərinin səmimiliyinə inandıqdan sonra Allahdan (121) kömək diləyərək, Ona ümid edərək, Ondan yardım və himayə istəyərək sənin xahişlərinə cavab verməyə tələsdim. Bilirsən ki (Allah (121) sizi doğru yola yönəltsin və Öz rəhbərliyi altında sizin həqiqətə doğru getməyinizi asanlaşdırsın), dinə və etiqadlara görə insanlardakı fərqlər, o cümlədən bir dinin daxilində olan məzhəblərdəki ayrılıqlar cərəyanların çoxluğundan və üsullardakı ziddiyyətlərdən yaranır, bu isə sanki dərin bir dəryaya bənzəyir ki, bu dəryada çoxları batıb məhv olmuş və yalnız tək-

tək adamlar üzüb çıxa bilmişlər və hər bir dəstə də öz nəzəriyyəsindən fövqəladə dərəcədə razıdır. Bu da Allahın ən Böyük Elçisinin (122) – o isə heç bir zaman səhv etməmişdir – bizə vəd etdiyidir: «Mənim xalqım yetmiş üç dəstəyə ayrılacaq və bunlardan yalnız biri xilas olacaqdır». Beləliklə, vəd olunan şey baş verdi.

Mənim ömrümün çiçəklənən illərində – kamilliyə çatan dövrdən (kamilliyə isə mən iyirmi yaşına çatmamış nail olmuşam) əlli yaşımdan ötdüyüm bu günlərə qədər - mən daim bu dərin dəryanın burulğanlarına atılaraq bir cəsur tək (təhükəli qorxaq kimi yox) onun dibinə baş vurmuşam, qaranlıq suallar bataqlığına girmişəm, istənilən məsələ ilə üz-üzə gəlmişəm, hər bir çətinliyin içərisindən qorxmadan keçmişəm, doğrunu yalandan və sünni tərəfdarlarını kafir yenilikçilərdən ayırmaq üçün hər bir məzhəbin ehkamlarını öyrənmişəm. Bu zaman heç bir batiniyyə[1] nümayəndəsini onun nəzəriyyəsinin mənası ilə maraqlanmamış, heç bir zahiriyyə[2] nümayəndəsini onun nəzəriyyəsinin mahiyyəti ilə tanış olmaq arzusu ilə yanmamaq üçün əlimdən buraxmamışam; heç bir filosofdan onun fəlsəfəsinin dərinliyinə çatmamış; heç bir mütəkəllimdən onun kəlamının və onun dialektikasının məqsədini öyrənməmiş; heç bir sufidən sufizmin sirlərinə alovlu bir coşqunluqla baş vurmamış; heç bir ortodoksdan onun ortodoksal nəzəriyyəsinin mahiyyətinin nəyə aparıb çıxardığı ilə maraqlanmamış, heç bir kafir allahsızdan onu Allah-Təalanı (121) inkar etməyə və pozğunluğa aludə olmağa məcbur edən tərbiyəsizliyinin haradan yaranmasını izləməmiş əl çəkməmişəm.

Böyük coşqunluqla şeylərin əsl təbiətinə çatmaq müstəqil addım atdığım andan və mənim gəncliyimin ilk günlərindən başlayaraq mənim xüsusiyyətim və gündəlik arzum olmuşdur. Bu, mənim təbii duyğu hissim və anadangəlmə keyfiyyətim idi ki, bunun da məndən asılı olmayaraq və mənim tərəfimdən heç bir səy göstərilmədən Allah (121) tərəfindən mənim təbiətimdə təməli qoyulmuşdur. Bunun sayəsində hələ yeniyetməlik dövrümə yaxınlaşdığım illərdə məndə irsi ehkamlar və ənənələr düyünü məhv olmağa başlayırdı. Çünki mən görürdüm ki, xristian gəncləri xristian, yəhudi yeniyetmələri isə yəhudi tərbiyəsi alırlar. Mən Peyğəmbər (122) haqqında rəvayət eşitmişdim ki, orada bu sözləri deyirdi: «Hər bir körpə əvvəl doğulanda dünyaya gəlir, yalnız sonradan valideynləri onları ya yəhudi, ya xristian, ya da kahin edirlər». Hələ gənc yaşlarımdan mənim qəlbim insanın ilkin təbiətinə,

valideynləri və müəllimləri təqlid etmək yolu ilə əldə olunan ehkamların ilkin təbiətinə çatmağa yönəldi ki, bu ehkamların birinin o birindən nə ilə fərqləndiyini aydınlaşdırım (onların prinsipləri təhsil prosesində öyrənilir və bu ehkamların hansının doğru, hansının yalan olduğunun təyin edilməsində fikir ayrılığı mövcuddur). Mən öz-özümə düşündüm: «Birincisi mənə lazım olan şeylərin həqiqi təbiətini dərk etməkdir, buna görə də idrakın özünün həqiqi təbiətinin nədən ibarət olduğunu bilmək mənim üçün zəruridir». Mənə elə gəldi ki, ən səhih bilik o bilikdir ki, bu zaman dərk olunan şey özünü elə büruzə verir ki, daha heç bir şübhəyə yer qalmır, dərrakənin onun səhihliyinə qiymət vermək qüvvəsinə malik olmadığı zamansa onun özü xəta, xülya imkanları ilə əlaqədar olmur. Bu cür bilik səhvlərdən elə sığortalanmış olmalıdır ki, əgər kimsə onu təkzib etmək iddiasında olarsa, özünün haqlı olduğunu sübut etmək üçün, məsələn, daşı qızıla, əsanı ilana çevirərsə, yenə də bu biliyin doğruluğuna heç bir şübhə və tərəddüd edilməsin. Əgər bilsəydim ki, on üçdən böyükdür və kimsə mənə: «Yox, üç ondan böyükdür və buna sübut kimi bax bu əsanı ilana çevirirəm», - demək fikrinə düşəcək və əgər hətta o, mənim gözlərim qarşısında bunu etsəydi belə, yenə də bir anlıq olsa da, onun haqlı olduğunu ağlıma gətirməzdim. Bu cür insan məndə yalnız onun bunu necə etməsi səbəbindən təəccüb doğurardı, mənim biliyimin səhihliyinə isə heç bir şübhə oyada bilməzdi. Sonradan mənə aydın oldu: əgər mənim biliyim və onun doğruluğu yuxarıda deyildiyi kimi deyilsə, onda bu cür biliyə etibar etmək olmaz – o, etibarsızdır və hər bir etibarsız şey səhih elm deyildir.

## SOFİZMƏ GİRİŞ VƏ ELMLƏRİN İNKARI

Öz biliklərimi sonradan gözdən keçirdikdə aşkar etdim ki, məndə olan bu cür elmlər yuxarıda göstərilən əlamətlərə malik deyildir. Yalnız hissi qavranılan zəruri xarakterə malik olan məlumatlar və prinsiplər istisnalıq təşkil edir. Mən düşündüm: «İndi - mənə məyusluq baş verdiyi zaman öz-özünə aydın olan, daha doğrusu, hissi məlumatlardan və zəruri xarakterə malik prinsiplərdən ibarət olan şeyləri əldə etmək üsulundan qeyri, həqiqi biliklər qazanmağın digər bir üsulu mənim üçün qalmır. Bunun üçün onları əvvəlcədən aşkar etmək lazımdır ki, onların mənim hissi məlumat-

lara olan etibarıma və zəruri xarakter daşıyan prinsiplərin xətasız olması, inamıma uyğun gəldiyinə əmin olum, o cümlədən mənim ənənələrə əsaslanan əzəli inamım və vəziyyətim bir çox insanların inamı kimi mücərrəd yolla qazanılmış vəziyyətdədir, yoxsa bunlar təsdiq olunmuş, yalan olmayan və təhlükəsiz şeylərdir?»

Qarşıma bu məqsədi qoyaraq mən böyük səylə mücərrəd yolla qazanılmış vəziyyətdəki hissi məlumatları təhlil etməyə başladım və onları şübhə doğuran şeylərə çevirməyin mümkün olub-olmadığını yoxlamağa başladım. Uzun düşüncələrin nəticəsində buna şübhə yaratmağa özümü məcbur etdikdən sonra bu fikrə gəldim ki, hətta hissi məlumatlara da etibar etməyə yol verə bilmərəm və bu sonunculara qarşı mənim şübhələrim getdikcə daha da çoxalmağa başladı.

Mən fikirləşdim: «Hissi məlumatlara qarşı inam insanlarda haradan əmələ gəlir? Axı bütün hisslərdən ən güclüsü görmə hissidir. Lakin kölgəyə baxdığın zaman adama elə gəlir ki, o, öz yerində tərpənməzdir və buradan onun öz yerini dəyişmədiyi qərarına gəlirsən. Lakin həmin bu kölgəyə bir saatdan sonra nəzər yetirmək kifayət edir ki, onun hərəkət etdiyini müəyyən edəsən, çünki o, kəskin tullanışlarla deyil, tədricən, çox cüzi hissələrlə və dayanmadan hərəkət edir. Yaxud da, məsələn, ulduzlara baxdıqda sənə elə gəlir ki, onlar çox kiçikdir – dinardan böyük deyillər. Lakin sonradan həndəsi üsullarla sübut olunur ki, ulduz öz ölçülərinə görə Yerdən böyükdür. Digər hissi məlumatlarla da məsələ eynilə bu cürdür. Hər bir yerdə Hiss hakimi bir qərar, İdrak hakimi isə hissi məlumatları inkar edən və onlarda gizlənən yalanları o qədər inandırıcı şəkildə aşkar edən elə bir qərar qəbul edir ki, onları müdafiə etmək üçün heç bir vasitə qalmır».

Mənim hissi məlumatlara olan inamım da tam alt-üst olduqdan sonra düşündüm: «Doğrudur, yalnız idrakın göstəricilərinə etibar etmək olar, çünki «on üçdən böyükdür», «eyni bir şeyə münasibətdə eyni zamanda inkar və təsdiq uyuşmazlıqdır», «eyni bir şey eyni zamanda həm yaradılan və həm də əbədi, həm mövcud olmayan və həm də mövcud olan, həm zəruri və həm də imkansız ola bilməz» mühakimələri kimi prinsiplər məhz onlardır».

Lakin bu zaman hissi məlumatlar dilə gəldi: «Bəs nəyə görə sən belə arxayınsan ki, sənin İdrak göstəricilərinə münasibətdəki inamın bir vaxt hissi məlumatların səndə yaratdığı etibardan fərq-

lidir? Axı sən əvvəllər bizə etibar edirdin, lakin sonra İdrak gəldi və bizi inkar etdin. Əgər İdrak olmasaydı, sən, yəqin ki, yenə də bizə inanmağında davam edərdin. Lakin ola bilməzmi ki, İdrakın əldə etdiyi bacarığın arxasında digər elə bir hakim durubdur ki, İdrakın bir zaman meydana gəldiyi və Hissləri inkar etdiyi kimi, o da meydana gəlməyə və İdrakı inkar etməyə hazır olsun. Əgər bu cür qəziyyəli bacarıq özünü göstərməyibsə, bu heç də onun tam olaraq mövcud olmamağı demək deyildir».

Mənim ağlım müəyyən müddət cavab verməkdə çətinlik çəkdi və bu cür çaşqınlığa yuxugörmənin təbiəti barədəki düşüncələrim səbəb oldu. Mən öz-özümə dedim: «Məgər sən yuxuda öz gördüyün yuxular haqqında fani olmayan və daimi bir şey kimi düşünmürsənmi? Məgər sən yuxuda olduğun vəziyyətində onları hansısa bir şübhə ilə inkar etmirsənmi? Yuxudan oyandıqdan sonra məgər bütün bu yuxularda gördüklərin və inandıqlarının əsassız və əhəmiyyətsiz olduqlarını yəqin etmirsənmi? Onda nəyə görə belə düşünürsən ki, ayıq olduğun zaman hiss və ya idrak sayəsində inandığın hər bir şey sənin vəziyyətinə nisbətdə həqiqidir, hərçənd səndə elə bir hal da yarana bilər ki, onun sənin indiki halına münasibəti indiki halının yuxudakı vəziyyətinə münasibəti kimi olsun və sənin ayıqlığın onun qarşısında yuxudan başqa heç bir şey olmayacaqdır? Beləliklə, əgər sən belə bir vəziyyətə düşsən, inanacaqsan ki, nə vaxtsa sənin idrakında təsəvvür olunan hər bir şey yalnız mənasız fantaziyadır.

Ola bilər ki, sufilərin barəsində danışdıqları onlara məxsus olan vəziyyət elə bu haldır, belə ki, bu sonuncular xəyala daldıqları və hissiyyatlardan imtina etdikləri zaman onların təsdiq etdiklərinə görə elə vəziyyətlərin şahidi olurlar ki, bunlar idrakın göstəriciləri ilə heç cür uyğun gəlmir. Ola bilər ki, bu cür vəziyyət ölümün özüdür, zira birinci və sonuncu peyğəmbərlərin Başçısı (122) deyib: «İnsanlar yatmışlar, öldükləri zamansa oyanacaqlar». Ola bilər ki, bu tərəfdəki həyat o tərəfdəki həyata nəzərən bir heçdir və insan öldükdə şeylər ona bu dünyada göründükləri kimi görünməyəcəkdir. O zaman ona belə müraciət olunacaq: «Biz sənin üstündən pərdəni götürdük və sənin baxışların bu gün daha da itiləşdi».

Bu fikir məni çulğaladıqda, çaxmaqdan ayrılan qığılcım kimi qəlbimi yandırdıqda mən özümü bu mərəzdən sağaltmaq üçün səy göstərdim, lakin bunu etmək asan deyildi, çünki ondan qurtulmaq

yalnız sübutların köməyi ilə mümkün idi, sübutlarsa, əgər ilkin prinsiplərə əsaslanmırlarsa, mümkün deyildir: əgər sonuncuların özləri xətasız deyillərsə, onda, deməli, sübutları da qurmaq mümkün deyildir. Mənim azarım çətin sağalan bir mərəzə dönərək iki aya qədər çəkdi, bu müddət ərzində mən sufilərin nəzəriyyələri üzərində düşündüm. Bu cür düşüncələrə isə məni kənar adamların nitqləri və danışıqları deyil, o andakı halım məcbur etdi.

Allah-Təala (121) məni bu xəstəlikdən və nasazlıqdan qurtarana qədər və ruhum öz əvvəlki sağlamlığına və müvazinətliyinə çatana kimi, zəruri xarakter daşıyan idrak prinsiplərim yenidən münasib və tam, şərtsiz etibarlı hala gələnə qədər belə davam etdi. Bütün bunlara isə ardıcıl sübutlar və nizamlı mühakimələrlə deyil, Allahın (121) mənim ürəyimə saldığı nurun sayəsində nail oldum. Bu nur bir çox elmlərə nail olmaqda açar rolunu oynayır və kim ki həqiqət axtarışında ancaq sübutların kifayət etdiyini düşünür, həmin şəxs Allahın (121) sonsuz mərhəmətinin hüdudlarını dar bir çərçivəyə salır. Allahın Rəsulundan (122) Allahın (121): «Allahın rəhbərliyi altında olmağını arzulayan kəsin ürəyi islam üçün açılır», - sözlərindəki «açılır» kəlməsinin mənası barədə soruşduqda, o cavab verdi: «Bu, Allahın ürəyə saldığı nurdur». Bu zaman ondan sordular: «Bəs onun əlaməti necədir?» Peyğəmbər (122) cavab verdi: «Bu, insanların qərarsızlıq sarayını tərk edib, ölümsüzlük sarayına yönəlməkləridir». O məhz həmin nur barəsində demişdir: «Allah insanları qaranlıqda yaratdı, sonra isə Öz nurundan onlara bəxş etdi». Bax həmin nurun işığında da həqiqəti aşkar etməyə çalışmaq lazımdır. Allahın səxavətindən tökülən bu nur insanların yalnız bəzilərinə əta olunur və bunu gözləmək zəruridir, bu barədə Peyğəmbər (122) buyurub: «Sizin tale günlərinizdə Allah (121) sizi əsən mehlə əhatə edir və sizə yalnız özünüzü bu mehə tərəf çevirmək qalır».

Bu söhbət o məqsədlə aparılır ki, məni, nəhayət ki, axtarışa ehtiyacı olmayan şeyləri axtarmağa gətirib çıxaran əməyimin mənzərəsi sənin qarşında dursun. Çünki ilkin prinsiplər axtarılmalı olan şeylər deyil, onlar qarşımızda mövcuddurlar. Qarşımızdakı şeysə elədir ki, onu axtardıqda itirilir və gözlərimizin qarşısından qaçır. Axtarılması tələb olunmayan şeylərin axtarışı ilə məşğul olan insanı isə həqiqətən tapılmalı olan şeylərin axtarışı üçün qayğısızlıq göstərən şəxs kimi qələmə vermək olmaz.

## HƏQİQƏTİ ARAYANLARIN KATEQORİYALARI

Allahın (121) mərhəməti və səxavətinin genişliyi sayəsində xəstəliyimdən qurtulduqdan sonra məndə belə bir fikir yarandı ki, həqiqəti arayanların kateqoriyaları dörd qrupa bölünür:

1. Özlərini nüfuzlu və səlahiyyətli şəxslər kimi qələmə verən mütəkəllimlər;
2. Özlərini əsas xüsusiyyəti pak imam tərəfindən onlara verilən nəzəriyyə elminin müdafiəçiləri kimi qələmə verən batinilər;
3. Özlərini məntiqin və sübutun müdafiəçiləri kimi qələmə verən filosoflar;
4. Həqiqətin aşkar edilməsində iştirak etmək kimi xüsusi bacarığa cəlb edilən, onların birbaşa düşüncə insanları, həqiqəti aşkar edən adamlar olduğu fikrinə cəlb olunmuş sufilər.

Mən yenə də öz-özümə dedim: «Həqiqət bu dörd kateqoriyaya müqavimət göstərə bilmir, çünki onlar həqiqət axtarışı yollarında daim irəliləyirlər və əgər həqiqət onlardan da yan keçirsə, onda, deməli, həqiqətə nail olmaq ümidsiz işdir. Lakin artıq ənənələrlə vidalaşdıqdan sonra yenidən onlara tərəf geriyə qayıtmaq olmazdı. İnsan yalnız o zaman ənənələrin ardınca gedə bilər ki, nüfuzlu şəxsin həmin adam tərəfindən təqlidi qeyri-iradi xarakterə malik olsun. Lakin o, bunu anladığı anda onun təqlid predmeti şüşə kimi çatlayacaq və xırda hissələrə parçalanacaqdır. Çatı tutmaq mümkün deyil, qəlpələri bir yerə yığmaq və onları birləşdirmək olmaz, deməli, bunları alovda əritmək və əvvəlkindən fərqli olan digər, tam yeni bir predmet yaratmaq lazımdır».

Mən tez məhz bu yolla fəaliyyət göstərməyə və sadaladığımız qrupların hər birinin baxışlarını tədqiq etməyə, bunun üçün də, birinci, kəlam nəzəriyyəsi ilə, ikinci, filosoların üsulları ilə, üçüncü, batinilərin ehkamları ilə və dördüncü, sufilərin üsulları ilə tanış olmağa başladım.

## KƏLAM NƏZƏRİYYƏSİ, ONUN MƏQSƏDİ VƏ MAHİYYƏTİ

Beləliklə, mən kəlam nəzəriyyəsindən başladım. Mən onu dərindən öyrəndim və başa düşdüm, bu nəzəriyyənin nümayəndələrinin tədqiqatlardan bəhs edən kitablarını oxudum və özüm də

onun haqqında zəruri saydığım şeyləri yazdım. Nəticədə aşkarladım ki, kəlamda mütəkəllimlərin məqsədinə cavab verən kifayət qədər bilik vardır, lakin bu bilik mənim öyrəndiyim məsələlərə cavab verə biləcək qədər kafi deyildir. Mütəkəllimlər öz qarşılarına Sünnə tərəfdarlarının inamını qorumaq və Sünnəni kafirlərin öz yenilikləri ilə onda yaranan dolaşıqlıqlardan qorumaq məqsədini qoymuşlar. Allah-Təala (121) Öz Rəsulunun (122) dodaqlarına Həqiqətin özü olan ehkamı bəxş etmişdir və onların ruhi və dünyəvi həyatlarının möminlik şərtləri bu ehkamda vardır ki, bu da Quranda və rəvayətlərdə deyilmişdir. Lakin sonradan iblis həmin dönüklərə Sünnənin əksinə olan şeyləri təlqin etmişdir, bu kafirlər də bu şeylər haqqında boşboğazlıq etməyə başlamışlar və az qalmışdı ki, Sünnənin həqiqi ehkamlarına inanan insanlarda təşviş yaratsınlar. Allah-Təala (121) buna görə də mütəkəllimlər məktəbini yaratmış və onları kafirlərin insanlarda təşviş yaradan və geniş yayılmış Sünnəyə qarşı olan yeniliklərini ifşa etmək qabiliyyətinə malik olan ardıcıl mühakimə vasitəsilə Sünnəni müdafiə etməyə vadar etmişdir. Kəlamın və onun tərəfdarlarının yaranması buradan başlanmışdır.

Bu məktəbin bir sıra nümayəndələri Sünnənin müdafiəsində, Peyğəmbər (122) barədəki rəvayətlərlə birlikdə qəbul edilmiş müsəlman ehkamlarının təmizlənməsində və kafirlər tərəfindən ona edilən yenilikləri dəyişdirməkdə özlərinin üzərlərinə düşən vəzifəni yerinə yetirməkdə nümunəvi çalışmışlar.

Lakin bu zaman mütəkəllimlər öz rəqiblərindən iqtibas etdikləri mühakimələrə istinad edirlər. Bu mühakimələrə ehtimal etməyə onları ya ənənəvi baxışlar, ya din səlahiyyətlilərinin bir səslə qəbul edilmiş qərarları, ya da Qurandan və rəvayətlərdən götürülmüş yeganə bir mülahizə məcbur etmişdir. Onların bütün uzun-uzadı mühakimələri adətən ona gətirib çıxarırdı ki, onlar öz rəqiblərinin fikirlərində olan hər hansı bir uyğunsuzluğu axtarıb tapırdılar və onu artıq qəbul olunmuş mühakimələrə düz gəlmədiyinə görə inkar edirdilər. Bütün bunlardan isə yalnız zərurilik xarakterinə malik olan prinsipləri həqiqət kimi qəbul edən insana az fayda olur. Buna görə də kəlam mənə Həqiqətin nə olduğu barədə kifayət qədər inandırıcı izahat bəxş etmədi və mənim şikayətləndiyim xəstəlikdən lazımi müalicəni mənə vermədi.

Doğrudur, zaman keçdikcə, kəlam sənəti əhəmiyyətli dərəcədə kamilliyə və yaxşı tədqiq edilmiş vəziyyətə gəlib çatdıqda

mütəkəllimlər şeylərin həqiqi təbiətinin öyrənilməsinə müraciət edərək Sünnəni müdafiə etmək həvəsinə düşdülər və onlar substansiyalar, təsadüflər haqqında mülahizələrə və onların müəyyən olunmasına girişdilər. Bu şeylər onların nəzəriyyələrinin məqsədi olmadığına görə həmin şeylər haqqındakı mühakimələri yüksək səviyyəyə çata və insanların fikirlərindən yaranan çətinlikləri tam həll edə bilmədilər.

Mən fərz edirəm ki, mütəkəllimlərin mühakimələri digər insanlara münasibətdə lazımi nəticəyə gətirib çıxarmışdır və hətta bir sıra müəyyən şəxslərə münasibətdə də bu nəticənin alınmasına mən qəti şübhə etmirəm. Lakin bu nəticələr tam nöqsansızlıqdan uzaq idilər, ona görə ki, mütəkəllimlərin ilkin olmayan prinsiplərə toxunan mühakimələri ənənələrə kor-koranə inamla qarışmışdır.

Burada mən heç də sağalmağım üçün müraciət etdiklərimi pisləməyi deyil, məhz o zamankı mənim vəziyyətim haqqında danışmağı öz qarşıma məqsəd qoymuşam. Müalicə vasitələri xəstəliyin xarakterinə görə müxtəlif olur. Sənin üçün faydalı, başqası üçünsə zərərli olan görün nə qədər dərmanlar mövcuddur.

## FƏLSƏFƏ

**Fəlsəfənin mahiyyəti barədə: onda nəyin tənqid olunması və nəyin tənqid olunmaması haqqında; filosofların fəlsəfədə mürtəd kimi yanaşdığı və bu cür yanaşmadığı vəziyyətlər haqqında; onların kafir yeniliklər buraxdığı və bu cür etmədiyi məsələlər haqqında mülahizələr.**

**Filosofların həqiqət uğrunda mücadilə edənlərin mühakimələrindən oğurladıqları və həmin səviyyədəki həqiqət sifəti vermək üçün özlərinin yalançı mülahizələrinə qarışdırdıqları şeylər haqqında; bu cür həqiqətlərə qarşı qəlblərdə nifrətin necə yarandığı və onun təmiz pul götürən pul xırdalayan kimi, onların mülahizələrindən əsl həqiqəti süni və saxta həqiqətdən seçməyi barədə məlumat.**

Mütəkəllimlərin nəzəriyyəsini başa vurduqdan sonra mən fəlsəfi elmlərdən yapışdım. Mənə yaxşı məlum idi ki, bu və ya digər elmlərin nöqsanları haqqında mühakiməni yalnız o insan yürüdə bilər ki, müəyyən elmi həmin elmin ən yüksək alimləri ilə eyni səviyyədə dura bilənə qədər tam öyrənsin, sonra isə öz idrakı ilə onları arxada qoyub həmin elmin onun nümayəndələrinin heç bir

anlayışı olmayan məsələləri ilə məşğul olsun. Ancaq bu şərtlə bu və ya digər elmin nöqsanları barədəki mühakimələr qanuni xarakter daşıya bilər. Mən bu predmetə diqqət və maraq göstərən bir nəfər də olsa, müsəlman alimi görməmişəm. Mütəkəllimlərin fəlsəfəni inkar edən kitablarında isə bu elmin nöqsanları barədə yalnız tam əlaqəsiz, dolaşıq şəkildə danışılır, onların mühakimələrindəki ziddiyyətlər və bu mühakimələrin dəyərsizliyi o qədər açıq-aydındır ki, bunlarla məşğul olmaq nəinki bu elmin bütün təfərrüatına iddialı olan şəxslər üçün, hətta kifayət qədər ağıllı olan adi bir insan üçün də şərəf vermir.

Nəzəriyyəni öyrənməmiş və onun mahiyyətinə çatmamış onu inkar etməyin, oxu kor-koranə atmağa bərabər olduğunu anladıqdan sonra qollarımı çırmalayaraq kitablardan yapışdım və bu elmi səylə öyrənməyə girişdim. Bu zaman mən yalnız oxuduqlarıma əsaslandım və hər hansı məsləhətçinin və müəllimin köməyinə müraciət etmədim. Müəllimlik fəaliyyəti ilə tam yüklənməyimə baxmayaraq, kitab yazmaqdan və müsəlman hüququ üzrə mühazirələrdən artıq qalan saatlarımda bu elmlə məşğul olurdum, çünki mən Bağdadda üç yüz nəfər tələbəyə dərs deyir və mühazirələr oxuyurdum. Allah (121) istədi ki, fasiləli oxumaqla mən iki il ərzində fəlsəfi biliklərə tam həcmdə malik olum. Bunları qavrayaraq mən daha bir il ərzində onları bir neçə dəfə yenidən nəzərdən keçirərək və dəfələrlə onların gizli sirlərinə baş vuraraq yorulmadan düşüncələrlə məşğul oldum. Nəhayətdə onlarda nəyin yalan və aldadıcı, nəyin ədalətli və nəyin xəyali olduğunu anladım.

İndi isə fəlsəfi elmlərin nəyə gətirib çıxardığına qulaq as. Mən gördüm ki, filosoflar bir sıra kateqoriyalara, onların elmləri isə bir neçə dərəcəyə bölünür. Lakin saysız kateqoriyaların hansına aid olmasından asılı olmayaraq, bu filosofların hər birində mütləq eyni bir möhür – dinsizlik və allahsızlıq var, baxmayaraq ki, onların qədim və lap qədim olanlarla, sonrakı və yeniləri ilə fərqləri böyükdür, o mənada ki, bunların biri həqiqətdən daha uzaq, digərləri daha yaxındır.

## FİLOSOFLARIN KATEQORİYALARI VƏ HAMISINDA DİNSİZLİK MÖHÜRÜNÜN OLMASI MƏNASINDA ONLARIN ÜMUMİLİYİ

Bil ki, onların çoxsaylı məktəblərinin və nəzəriyyələrinin müxtəlifliyinə baxmayaraq, onlar üç hissəyə: dəhritlərə, təbiətşünaslara və metafiziklərə bölünürlər.

Birinci kateqoriya dəhritlərdir. Bu, Hər Şeyi Təşkil Edən, Hər Şeyi Bilən və Hər Şeydən Qüdrətli Yaradanı qəbul etməyən və dünyanın əbədi olaraq öz-özünə mövcud olduğunu və Yaradanı olmadığını, heyvanların həmişə toxumdan, toxumun da heyvandan yarandığını, həmişə belə olduğunu və əsrlər boyu belə də olacağını təsdiq edən qədim mütəfəkkirlər qrupudur. Bunlar kafirlərdir.

İkinci kateqoriya təbiətşünaslardır. Onlar təbiət aləmində böyük axtarışlar edən, canlıların və bitkilərin vəhşi növlərini araşdıran və canlıların anatomik quruluşuna aid elm sahələrində çoxlu sayda tədqiqatlar aparan insanlardır. Bu axtarışlar zamanı onlar Allah-Təalanın (121) yaratdığı elə möcüzələrlə və Onun müdrikliyinin elə nəticələri ilə rastlaşmışlar ki, hansısa müdrik Yaradanın, bütün şeylərin mənasını və təyinatını Bilənin mövcudluğunu qəbul etmək məcburiyyətində qalmışlar. Çünki anatomiyanı və orqanların uyğunluğunun qəribə təzahürlərini öyrənərək, eyni zamanda həm də yüksək kamillik haqqında və onunla məharətli bir memarın canlıların, əsasən də insanın quruluşu ilə bağlı sərəncam verməsi barədə zəruri biliklərə çatmamaq mümkün deyildir. Lakin öz naturalist axtarışında həddindən artıq səy göstərən təbiətşünasların fikrinə görə, guya ehtirasın tarazlığı canlının qabiliyyətinin daxilinə təsir edir. Onlar elə düşünürdülər ki, insanın düşüncə qabiliyyəti onun həm də ehtirasından asılıdır və ehtiras yox olduqda həmin qabiliyyət də yox olur və ölür. Daha sonra onlar təsdiq edirdilər ki, ölən bir şeyin geri qayıtması barədə düşüncələr əsassızdır. Buradan onlar belə bir kəskin nəticə hasil edirdilər ki, ruh ölür və bir daha geri qayıtmır. Bununla da onlar o biri həyatı, Cənnəti, Cəhənnəmi, Dirilməni, Dəhşətli Qiyaməti və Hesab Çəkməni inkar edirdilər. Onların düşüncəsinə görə, itaət mükafatlandırılmır və itaətsizlik də cəzalandırılmır. Onlar heyvan kimi rəzil ehtiraslarını söndürməyə bağlanmışdılar. Bunlar kafirlərdir, çünki dinin əsası Allah-Təalaya (121) və Qiyamət Gününə inamdan ibarətdir. Bu

adamlarsa Allaha (121) və onun əlamətlərinə inansalar da, dəhşətli Hesab Gününü inkar edirlər.

Üçüncü kateqoriya metafiziklərdir. Buraya sonrakı dövrlərin filosofları – Sokrat və onun şagirdi Əflatun aiddir ki, o da öz növbəsində Ərəstunun müəllimi olmuşdur. Ərəstun məntiqi nizama gətirmiş, elmlərə ciddi görkəm vermiş, özünə qədər yazılmamış şeylər haqqında yazmış və hələ mükəmməl olmayan elmləri kamilliyə çatdırmışdır. Bütün bu insanlar əvvəlki kateqoriyalara – dəhritlərə və təbiətşünaslara qarşı öz etirazlarını bildirmiş və onların mühakimələrinin düzgün olmadığını ifşa edərək, bununla da elə bir iş görmüşdülər ki, digər alimlərə buna nəsə əlavə etmək zərurəti qalmamışdır. Lakin onlar öz aralarında didişirdilər – möminlərin arasında bu cür şeylərin baş verməsindən Allah (121) özü saxlasın! Ərəstun Əflatuna, Sokrata və onun digər metafizik ardıcıllarına hücum edərək ta onların hamısı ilə hesablaşmayana qədər sakitləşmədi. Buna baxmayaraq, onun özü də özündən əvvəlki filosofların malik olduqları kafirlik və dinsizlik nöqsanları ilə çirklənmişdi. Lakin başqaları dinsizlikdən və kafirlikdən azad ola bilməmişdilər, buna görə də həm bu metafiziklərin, həm də onların tərəfdarları olan müsəlman filosofların – İbn Sina, əl-Farabi və digərlərinin dinsizliyini ifşa etmək lazım idi. Bütün bunlara baxmayaraq, onu da qeyd etmək lazımdır ki, fəlsəfə ilə məşğul olan heç bir müsəlman bu iki şəxs qədər Ərəstun elminin dərinliyinə nüfuz edə bilməmişdir; filosofluq edən digər müsəlmanların Ərəstun elmi barədəki kitablarında elə qarma-qarışıqlıqlar və anlaşılmazlıqlar mövcuddur ki, bunlardan oxucunun dərrakəsi tam çaşıb qalır və o nə bu elm haqqında, nə də bu elmə qarşı necə münasibət bəsləyəcəyi barədə qərar qəbul edə bilir: bilmir ki, bu elmi inkar etsin, yoxsa onunla razılaşsın.

Adlarını çəkdiyimiz bu iki şəxsin sayəsində Ərəstun elmindən təhrif olunmamış vəziyyətdə bizə gəlib çatanını üç fəsilə bölmək olar. O zaman bunlardan birincisinin məzmununun günahlarla dolu olduğunu, digərinin isə məzmununun kafirlikdən ibarət olduğunu nəzərə alaraq tam rədd etmək lazımdır, üçüncüsünün məzmununu isə qətiyyən rədd etmək lazım deyil. Onları növbə ilə nəzərdən keçirək.

Əxlaqa gəldikdə isə, onların bütün mülahizələri ruhun xüsusiyyətləri və əxlaqi keyfiyyətlərinin təyin olunmasına, onların növlərinin və çeşidlərinin sadalanmasına, habelə ruhun şəfa tap-

ması və ehtirasa qalib gəlmək üsullarına aiddir. Bunların hamısı ilahiyyatda və ehtiraslara qarşı durmaqda Allah-Təala (121) yolunda irəliləyən və bu zaman dünyəvi ləzzətlərdən kənar duran ləyaqətli və mətanətli insanların – sufilərin mühakimələrindən əxz olunmuşdur.

Ruhun əxlaqi keyfiyyətləri, onun çatışmamazlıqları və fəaliyyətindəki nöqsanları – sufilərin idrak haqqında dedikləri bütün şeylər – onların zahidliyi sayəsində qarşılarında açılmış, sonra isə bütün bunlar filosoflar tərəfindən əxz olunaraq onların fikirləri ilə qarışdırılıb bütün üsullarla təriflənmişdir ki, onların bu uydurmaları insanlar içərisində özünə yer tapsın. Onların zamanında – təkcə onların deyil – hər bir dövrdə özlərini Allaha bərabər zənn edən xüsusi kateqoriyalı insanlar olmuş və Böyük Allah (121) yer üzünü onlardan təmizləməmişdir...

Keçmişlərdə onlar Quranda olanlardan yan keçirdilər. Onların şəxsi məhsullarının Peyğəmbərin (122) və sufilərin kəlamları ilə qarışması nəticəsində iki bəla üz verdi:

1) Bunları qəbul edənlər üçün bəla;

2) Bunları inkar edənlər üçün bəla.

İnkar edənlərə gəldikdə, bu çox böyük bir bəladır. Çünki bir çox insanlar özlərinin zəif dərrakələri ilə düşünürlər ki, bu əsərlərə əlavə olunan və onların yalan mühakimələri ilə qarışan kəlamlar unudulmalı və kənara atılmalıdır. Hətta onların fikrinə görə, bu kəlamları dilə gətirən insanlar pislənməlidirlər, ona görə ki, bu ifadələri onlar məhz bu insanların dilindən eşitmişlər, lakin lap əvvəldən bu insanların yalançı olduqları onların zəif ağlına məlum idi. Bir xristianın: «Allahdan başqa allah yoxdur, İsa Onun elçisidir», - dediyini eşidib: «Bu, xristian kəlməsidir», - deyə düşünərək onu inkar edən şəxsin başına gələnlər eyni ilə bu insanların da başına gəlir. Lakin o, özünə hesabat vermir ki, nəyə görə - yalnız onun söylədiyi ifadəyə və ya Məhəmmədin (122) peyğəmbərlik missiyasını inkar etdiyinə görəmi bu xristianı kafir hesab edir? Əgər o yalnız Məhəmmədin (122) peyğəmbərlik missiyasını inkar etdiyinə görədirsə, onda onun kafir olmadığı yerdə, daha doğrusu, onun ifadələrinin öz-özlüyündə həqiqət olduğu yerdə ona zidd getmək lazım deyil, qoy lap bu ifadələr həmin insanın nöqteyinəzərinə görə də, həqiqət olsun zəif ağıla malik olan insanların adəti belədir: onlar həqiqətə görə insanları deyil, insanlara görə həqiqəti dərk edirlər.

Ağıllı insan möminlərin hökmdarı Əli İbn-əbu-Talibin (dörd raşidi xəlifəsindən 656-661-ci illərdə xəlifəlik etmiş sonuncusu) söylədiyi bu kəlamın ardınca gedir: «Həqiqəti insanlara görə tanıma, həqiqətin özünü özünə görə dərk et, onda onun tərəfdarlarını tanıyarsan». Ağıllı insan həqiqəti dərk edir, yalnız bundan sonra deyilmiş mülahizənin mahiyyətinə baxır. Əgər bu mülahizə həqiqi olarsa, onun müəllifi yalançı və ya doğrucul olsa da, fərqi yoxdur, onu qəbul edir. Hətta o, səhv yola düşmüş insanların mülahizələrindən də həqiqəti axtarıb tapa bilər, axı qızılın özü də adi torpaqda gizlənir. Əgər pul dəyişən öz fərasətinə arxayındırsa, əlini müştərisinin pul kisəsinə salaraq oradan yalnız qızıl pulları seçib götürməyində, qəlp və saxta pulları isə saxlamağında heç bir bəla yoxdur. Buna görə də öz pullarını dəyişmək istəyən adamlarla iş görməyi öz işində ustad olan puldəyişənə deyil, məhz sadəlövh bir kəndliyə qadağan edirlər, axı bunun kimi, dənizin kənarına mahir bir üzgüçünü deyil, üzməyi bacarmayan ləng bir adamı qoymurlar və bunun kimi, ilana toxunmağı məharətli bir ilanoynadana deyil, məhz naşı bir yeniyetməyə qadağan edirlər.

Öz həyatıma and olsun ki, insanların çoxunun arasında belə bir fikir kök salmışdır ki, guya onlar özləri yüksək ustalığa və sənətə sahib olan, kamil dərrakəyə, həqiqəti yalandan seçmək və doğru yolu səhv yoldan ayırmaq bacarığına malikdirlər. Buna görə də belə insanların səhv yola düşmüş şəxslər tərəfindən yazılmış kitabları oxumasına imkan verməmək zəruridir, zira onlar yuxarıda xatırlatdığımız bədbəxtliyə düçar olmasalar da, aşağıda adını çəkəcəyimiz bəladan qurtula bilməzlər.

Bizim müxtəlif əsərlərimizdə olan ilahiyyat elmlərinin sirlərinə həsr olunmuş bəzi mülahizələrimiz elmlərdə lazımi gücə malik olmayan və müxtəlif nəzəriyyələrdə kifayət qədər fərasəti olmayan bir sıra müəyyən adamlar tərəfindən etirazla qarşılanmışdır. Onlar təsdiq edirlər ki, guya bu mülahizələrin bəziləri müxtəlif beyinlərin məhsulları olmasına baxmayaraq (bəzən atın bir dırnağının izinə digər dırnağı düşməsi mümkündür), qədim mütəfəkkirlərdən əxz olunmuşdur, digərlərinə isə şəriət kitablarında rast gəlinir və bu ideyaların çoxusu sufilərin kitablarında mövcuddur. Tutaq ki, bu mülahizələr yalnız qədim mütəfəkkirlərin kitablarında vardır. Əgər həmin mülahizələr öz-özlüyündə ağıllıdırsa, sübutlarla əsaslandırılmışsa, Müqəddəs Kitaba və Sünnəyə heç bir şəkildə zidd deyilsə, onda onları qəbulolunmaz və nöqsanlı hesab

etməyə lüzum varmı? Əgər biz bu cür fəaliyyətdə olsaq və hansısa bir yalançı müəllimin ağlına gəlmiş olan hər bir həqiqəti inkar etmək yolunu tutsaq, onda bir çox həqiqətlərdən imtina etmiş olarıq. Bu halda biz bəzi Quran şeirlərindən, Allahın Rəsulu (122) barədə olan hekayətlərdən, onun ardınca gedən möminlər haqqında olan rəvayətlərdən, müdriklərin və sufilərin kəlamlarından yalnız ona görə imtina etməli olarıq ki, «Saflıq qardaşları» kitabının müəllifi bu əsərdə öz mülahizələrini sübut etmək üçün onlara müraciət etmiş və öz yalançı elmini axmaq beyinlərə yeritmək üçün bunlardan yararlanmışdır. Bu şəkildə fəaliyyətin bizim üçün o təhlükəsi də vardır ki, bu halda həqiqət bizdən uzaqlaşar və onu öz əsərlərinə cəlb edən yalançı müəllimlərin malına çevrilə bilər.

Alimliyin ən aşağı dərəcəsi ondan ibarətdir ki, alim gərək nə iləsə təcrübəsiz insandan seçilsin. Balı hətta dəllək bankasında tapmış bir alim ondan iyrənməyəcək: o, yaxşı bilir ki, bu banka balın təbiətində dəyişiklik edə bilməz. Bu cür baldan yalnız hansısa bir sadəlövh insan həmin bankanın natəmiz qan saxlamaqdan ötrü olduğuna əsaslanaraq ikrah edə bilər və qanın natəmiz bir şey olduğuna görə onun bankada saxlandığını güman edər. O görə bilmir ki, qan yalnız öz təbiətində gizlənən müəyyən xassələrə görə natəmizdir, balsa bu cür xüsusiyyətlərə malik olmadığından həmin qabda olmasına baxmayaraq, həmin natəmiz xassələri qazanmır və buna görə də o, qeyri-təmiz bir şey kimi sayıla bilməz.

Bütün bunlar səfeh bir xəyalətdir, lakin bu bir çox insanlara xasdır. Bu və ya digər mülahizənin müəllifini axtarıb, həmin insanların arasında hörmət qazanmış birinin adını çəkmək kifayət edər ki, bu mülahizə yalan olsa da, onlar onu qəbul edələr. Lakin onların arasında pis ad qazanmış birisinin adını çəkmək kifayətdir ki, həmin mülahizə doğru olsa da belə, onu rədd etsinlər. Bu cür şəxslər həqiqətə görə insanları deyil, insanlara görə həqiqəti dərk edirlər və bununla da dərin bir yanlışlığa yuvarlanırlar.

İnkardan doğan bəla bu cürdür. İndi isə onun qəbul olunmasından yaranan bədbəxtlik barədə. O, bu şəkildə baş verir: filosofların kitablarını («Saflıq qardaşları» və sair bu kimi) nəzərdən keçirərək və onlarda öz ifadələrilə Peyğəmbərin (122) müdrik kəlamlarının və sufilərin mülahizələrinin qarışığını aşkar etdikdə razılıqla qarşılayar, onlarla razılaşar və onlara inanar. Bu insanlar düşünmədən bütün bu qarışıqla birlikdə oxuyub razılaşdıqları şeylərə yaxşı münasibətdə olaraq onların yalan mühakimələrini mə-

nimsəyər. Bu, insanları yalançı nəzəriyyələrə cəlb etməyin özünəməxsus üsuludur. Bu bəladan uzaq qaçmaq üçün insanları filosofların xəyanət törədə bilən və təhlükəli kitablarından qorumaq lazımdır. Sürüşkən yarğandan pis üzgüçünü qorumaq lazım gəldiyi kimi, insanlara da nəzarət etmək lazımdır ki, bu kitabları oxumaq üçün ələ götürməsinlər. İlana toxunmaq fikrinə düşməməsi üçün yeniyetmə cavana nəzarət olunduğu kimi, insanlara da nəzarət etmək lazımdır ki, bütün bu mülahizələrin qarışığı onların qulaqlarına çatmasın.

Müdrik insan ilan ovsunçusu kimi hərəkət etməlidir. Ovsunçu özünün kiçik yaşlı övladının yanında, əgər həmin körpənin özünü ovsunçu hesab edərək onu təqlid edəcəyini bilirsə, onda ilana toxunmamalıdır. Əksinə, şəxsi nümunə göstərərək və övladının iştirak etdiyi yerdə ilana toxunmayaraq, o, öz uşağına ehtiyatlı olmağı təlqin etməlidir. Daha sonra, müdrik insan həmin ovsunçunu başqa bir mənada da təkrar etməlidir: mahir ovsunçu ilanı əlinə aldıqdan və ondan zəhər teriakını ayırdıqdan sonra teriakı götürür və zəhəri zərərsizləşdirir, o, xəsislik göstərmədən kimə lazımdırsa, teriakdan verə də bilər. Alim puldan başı çıxan təcrübəli puldəyişən kimi hərəkət etməlidir. Puldəyişən öz müştərisinin pul kisəsinə əlini salaraq oradan saf qızıl sikkələri götürüb və saxta, qəlp pulları kənara ataraq, daha sonra saf puldan ehtiyacı olanlara xəsislik etmədən paylaya bilər.

Daha sonra. Teriaka ehtiyacı olan adamın qəlbindən buna qarşı onun ilandan – bu zəhər yığınından götürüldüyünü bildikdə bir iyrənmək hissi keçə bilər. Bu cür insana məsələnin nə yerdə olduğunu başa salmaq zəruridir. Bunun kimi, pula ehtiyacı olan kasıba da puldəyişənin müştərisinin pul kisəsindən götürülmüş qızıl sikkələr təklif olunduqda o, özünü təhqir olunmuş hesab edə bilər. Bu halda həmin kasıba başa salmaq lazımdır ki, bu hərəkətilə o yalnız cahillik etmiş olur – o cahillik ki, bunun sayəsində onun ehtiyacı olduğu nemətlərdən məhrum olmuşdur. Ona aydınlaşdırmaq lazımdır ki, qiymətli pulların saxtalarla bir yerdə olmasından qiymətli pullar saxtalaşmır, saxta pullarsa qiymətli olmur. Əsl bunun kimi həqiqətin də yalanla qonşuluğu həqiqəti yalana, yalanı isə həqiqətə çevirmir.

Bununla da filosofların məhvedici və zərərverici fəaliyyəti barədəki mülahizələrimizi başa vururuq.

## TƏLİMİLƏRİN NƏZƏRİYYƏSİ VƏ ONUN ZİYANI

Fəlsəfə elmini başa çatdırdıqdan sonra aldığım nəticələrə yekun vurdum, onu aydınlaşdırdım və ondakı ifşa olunası saxtalıqları aşkarladım, mənə məlum oldu ki, məqsədə çatmaq üçün bu da kifayət deyildir, yalnız idrakın köməyi ilə həlli tələb olunan məsələləri əhatə etmək mümkünsüzdür və idrak bütün bu problemlərin üzərindən pərdəni götürməyə qabil deyildir.

Bu zaman ərzində təlimilər nəzəriyyəsi artıq böyük şöhrət qazanmışdır: həqiqət üzərində bərqərar olmuş günahsız imamın vasitəçiliyi ilə şeylərin dərk olunması rəyi insanlar arasında geniş yayılmışdı. Mənim də ağlıma onların kitablarının məzmunu ilə tanış olmaq üçün mühakimələrini axtarıb tapmaq fikri düşdü.

Sonra isə belə oldu ki, mənə bizim xəlifə tərəfindən belə bir qəti fərman gəldi və ona əsasən mən onların nəzəriyyələrinin əsl mənasını açan bir kitab tərtib etməli idim. Bunu mən etməyə bilməzdim: əslində bu fərman mənim üçün artıq ruhumda doğan daxili niyyətimə əlavə olunan zahiri bir səbəb oldu. Mən də onların kitablarını axtarmaqla və onların mühakimələrini yığmaqla məşğul olmağa başladım. Lap əvvəldə mənə onların sələflərinin təmizləyib hazırladıqları yolla getməyən hal-hazırkı nümayəndələrinin beynində yaranmış bəzi yeni, orijinal fikirlər gəlib çatdı. İndi mən onların mülahizələrini bir yerə yığdım, onların müddəalarını təsdiq edən dəlilləri göstərərək nizama saldım və sonradan həqiqiliyini yoxlamaq üçün onların mühakimələrinin gedişini izləyərək təlimilərin verə biləcəyi bütün suallara mükəmməl cavab verdim. Bu elə edilmişdir ki, hətta bəzi həqiqət mücahidləri onların nəzəriyyələrinin xeyrinə gətirdiyim arqumentləri qoymaqda göstərdiyim xırdaçılığı pislədilər. Onlar deyirdilər: «Görünür, sən onlar üçün çalışırsan. Əgər sən tədqiq etməsəydin və nizamlamasaydın, onlar öz nəzəriyyələrində qarşılaşdıqları anlaşılmazlıqlarla heç vaxt bacara bilməzdilər».

Bu cür məzəmmət bəzi cəhətlərə görə məntiqlidir. Hələ Əhməd ibn-Hənbəl[3] mütəzilərin təkzibinə həsr etdiyi əsərə görə əl-Haris əl-Muhasibi[4] tənqid etmişdi. Ona cavab olaraq əl-Haris demişdir: «Küfrü təkzib etmək borcdur». Bununla Əhməd razılaşmamışdı: «Düzdür, lakin sən əvvəl onlarda olan anlaşılmazlıqları şərh etmisən, yalnız sonra onlara cavab vermisən. Axı belə də ola bilər ki, hər hansı bir şəxs onların səhv müddəalarını oxuyaraq

anlayar, lakin sənin cavabına ya əhəmiyyət verməz, ya da oxuduqda onun mahiyyətini başa düşməz. Nə ilə buna zəmanət verirsən?» Lakin Əhməd yalnız o zaman haqlıdır ki, həmin anlaşılmazlıqlar geniş yayılmasın və böyük şöhrət qazanmasın. Əgər beləəri varsa, onda onlara cavab vermək zəruridir. Cavab verməksə yalnız onları şərh edərək mümkündür. Doğrudan da, özünün sınaqdan keçirmədiyin və hiss etmədiyin səhvləri bu insanların ayağına yazmaq olmaz. Hətta mənimlə fikir ayrılığında olan dostlarımın birindən onlarla birləşib nəzəriyyələrini qəbul etdikdən sonra bu səhvlər barədə eşitmişəm. O, onları təkzib etməyə çalışanların yazdıqlarına necə güldükləri barədə danışırdı, çünki həmin şəxslər onların arqumentlərini anlamadan bunu edirdilər. O, özlərinin müddəaları və onlardan necə istifadə etdikləri barədə mənə söhbət etdi. Bundan sonra mənim onların əsas müddəalarından xəbərdar olduğumu onun bilməyini istəmədən həmin fikirləri ifadə etdim; onun bu müddəaları haradansa eşidib başa düşmədiyimi fikirləşməməsi üçün bu fikirləri müsbət cəhətdən izah etdim. Mən məqsədimə nail oldum; onların həqiqilik ehtimallarının bütün dəlillərini qarşıya qoyaraq səhvlərini müsbət mənada şərh etdim, sonra isə son dərəcə sübutlarla bu səhv mövqelərin xətalı olduğunu aşkarladım. Mən belə bir nəticəyə gəldim: onların nəzəriyyələrindən heç bir nəticə hasil olmur və onların mühakimələri faydasızdır.

Əgər islamın cahil dostlarının səfeh xidmətləri olmasaydı, bu küfr öz-özlüyündə müflis olar, bu cür geniş yayıla bilməzdi. Yalnız islamın cahil dostlarının mövhumat gücü həqiqət mücahidlərini onların istinad etdikləri mülahizələrə münasibətdə mübahisə etməyə və dedikləri hər bir ifadəyə etiraz etməyə məcbur etdi. Onlar təlimi tərəfdarlarının Nəzəriyyənin və Müəllimin varlığına ehtiyac olduğu barədəki mülahizələrinə və «hər bir müəllim haqlıdır, lakin vahid bir günahsız Müəllimin olmasına ehtiyac vardır» kimi fikirlərinə qarşı etiraz edirdilər. Təlimi tərəfdarlarının arqumenti bundan ibarət idi ki, Nəzəriyyəyə və Müəllimə tələbat mövcuddur. Buna olunan etiraz isə qeyri-qənaətbəxş idi. Sonuncu vəziyyətin onların nəzəriyyələrinin güclü və rəqiblərinin nəzəriyyələrinin isə zəif olmalarına bir sübut olduğuna özlərini inandıran təlimilərin arasında xəyallara qapılma hissləri yarandı. Təlimilər görmürdülər ki, yalnız həqiqət mücahidlərinin zəifliyi və onla-

rın seçdikləri yolun düşüncəsizliyi səbəbindən belə vəziyyət yaranmışdır. Əslində isə Müəllimin olmasına, onun zəruriliyinə və bu cür Müəllimin yalnız günahsız ola bilməsinə tələbatın mövcudluğunu etiraf etmək düzgün olardı. Lakin bundan sonra demək lazım idi ki, bizim günahsız Müəllimimiz Məhəmməddir (122).

Əgər təlimilər: «Sizin müəlliminiz artıq rəhmətə gedib», - desələr, biz: «Sizin müəlliminiz isə gizlidir», - cavabını verərik. Onlar deyə bilərlər: «Bizim müəllimimiz öz təbliğçilərinə məsləhət verib onları müxtəlif ölkələrə göndərmişdir ki, əgər onların arasında anlaşılmazlıq yaranarsa və ya qarşılarına hər hansı bir çətinlik çıxarsa, onlara məsləhət verməyə hazırdırlar». Onda biz də belə cavab verərik: «Bizim müəllimimiz də öz təbliğçilərinə məsləhət verərək onları müxtəlif ölkələrə yola salmışdır. O isə öz Nəzəriyyəsini mükəmməl yaratmışdır, çünki Allah-Təala (121) tərəfindən belə buyurulub: «Bu gün Mən sizin üçün dininizi kamil yaratdım və sizin üçün Öz iltifatımı başa vurdum». Əgər nəzəriyyə tam mükəmməldirsə, nə müəllimin ölümü, nə də onun olmaması heç bir ziyan gətirməz».

Daha bir mülahizə qalmışdır: «Siz haqqında heç nə eşitmədiyiniz şeyləri necə müzakirə edə bilirsiniz? Mətn əsasında? Axı onu siz eşitməmisiniz. Yaxud da ola bilər ictihad[5] əsasında? Lakin o da mübahisəlidir». Bu vəziyyətdə biz belə cavab verərik: «Allahın Rəsulu (122) Müəzi Yəmənə göndərən zaman o necə hərəkət edibsə, biz də elə edərik: əgər mətn varsa, onun əsasında, əgər belə bir mətn yoxdursa, onda ictihada əsaslanaraq mühakimə yürüdürük. Hətta öz imamları tərəfindən uzaq məmləkətlərə göndərilən onların təbliğçisi də eynən buna oxşar qaydalara əməl edir, çünki belə vəziyyətlərdə onun mətn əsasında mühakimə yürütməsi mümkün olmur. Hər bir mətn sonludur və buna görə də sonsuz sayda vəziyyətləri əhatə edə bilməz, təbliğçi də hər bir hadisədə məsləhət almaq məqsədilə imam yaşayan şəhərə qayıda bilməz. Bundan başqa, belə də ola bilər ki, fitva[6] almaq üçün imamın yanına qayıtmaq üçün lazım olan məsafəni qət edən təbliğçi imamını ölmüş görər və bütün bu səyahətin heç bir faydası olmaz. Daha sonra qibləni (namazın istiqaməti) təyin etməkdə çətinlik çəkən şəxsi götürək. Namaz qıldığı zaman ona yalnız şəxsi ictihadı rəhbər tutmaq lazımdır, belə ki, qibləni öyrənmək üçün imam yaşayan şəhərə yola düşərsə, namaz vaxtını itirmiş olar. Beləliklə, namazı şəxsi fikrə əsaslanaraq yerinə yetirmək olar, çünki buyurulub:

«İctihadda səhv edənlər mükafat alacaqlar, bu zaman həqiqətə nail olanlarsa, ikiqat mükafatlanacaqlar».

İctihad əsasında həll olunan bütün məsələlərdə vəziyyət eyni cürdür. Məsələn, kasıblar arasında paylanan zəkatı götürək. Şəxsi ictihada əsaslanaraq kasıb kimi qəbul etdiyin adam, ola bilər ki, öz var-dövlətini gizlədən bir varlı olsun. Lakin səhv edən şəxsi buna görə qınamaq olmaz, çünki yalnız öz şəxsi düşüncəsinin tələb etdiyi şeyə zidd gedən adam bu cür hökmə layiqdir.

Təlimi: «Bəs əgər insanın fikri onun rəqibinin fikri ilə üst-üstə düşərsə?» - deyə soruşduqda, biz belə cavab verərik: «Həmin adam qibləni təyin edən şəxs kimi öz şəxsi fikrini əsas götürməlidir, başqaları tərəfindən inkar oluna bilməsinə baxmayaraq, öz fikrini əsas tutmalıdır». Əgər: «Başqasının ardınca gedən adam kimin – Əbu Hənifin (124), Əş-Şafiinin, yoxsa digərinin ardınca getməlidir?» - deyə soruşarsa, o zaman mən də: «Əgər qiblənin təyin olunmasında insanlar arasında fikir ayrılığı varsa, onda başqalarının ardınca gedən adam necə hərəkət etməlidir?» - deyərəm. Buna təlimi: «Qiblənin təyini üçün olan əlamətləri hamıdan yaxşı bilən layiqli birini seçməkdə həmin şəxsin ictihada ixtiyarı vardır. Şəriətə münasibətdə də məsələ bu cürdür».

Peyğəmbərlər və imamlar insanların səhv edə biləcəyini başa düşərəkdən müstəsna hallarda insanların şəxsi ictihada əsaslanmalarına icazə vermişlər. Allahın Elçisi (122) demişdir: «Mən yalnız aşkar olanlardan xəbərdaram, Allahsa gizli fikirləri də görür», yəni mən şahidlərin ifadələrindən yaranan ən adi fikirlərdən xəbərdaram, şahidlərsə səhv edə bilərlər. Belə hallarda peyğəmbərlərin özləri burada səhvin olmayacağına zamin dura bilmirlərsə, biz necə bunu arzulaya bilərik?

Burada onlar iki sualı qarşıya qoyurlar:

Birinci sual. Onlar deyirlər: «Əgər butun bunlar ictihad tələb edən hallarda qanunauyğundursa, onda dini ehkamlara münasibətdə qanuni deyillər. Onda necə olmalıdır, axı bu məsələlərdə xəta edənə əfv yoxdur?». Buna mən belə cavab verirəm: «Dini ehkamlar Müqəddəs Kitabda və Sünnələrdədir. Kitabın və Sünnənin əhatə etmədiyi təfsilatlara və mübahisəli məsələlərə gəldikdə isə, bunlardakı həqiqət «doğru mizanlarda» ölçülmək yolu ilə, yəni Allah-Təalanın (121) Öz Kitabında buyurduğu qaydalara uyğun olaraq təyin edilir. Bu ölçülər beş dənədir və onlar haqqında mənim «Doğru mizanlar» kitabımda söhbət açılır.

Əgər: «Sənin düşmənlərin bu meyarlar məsələsində səninlə razı deyillər», - deyə etiraz edərlərsə, mən belə cavab verərəm: «Bu meyarların başa düşülən olmasına baxmayaraq, təlimilər üçün hər hansı bir ixtilaf obyektinə çevrilməsini təsəvvür etmək olmur, çünki mən bunları Qurandan götürmüşəm və Qurana görə də öyrənmişəm. Bu meyarlar məntiqçilər üçün də mübahisə obyekti ola bilməz, çünki bunlar onların öz məntiqlərinə müqəddimə kimi verdikləri şərtlərə tam uyğundur. Bu meyar müttəqilər üçün də ziddiyyət obyekti ola bilməz, zira bu, onların nəzəri sübutlara münasibətdəki mülahizələrinə uyğundur və dialektik mühakimələrdə həqiqət onun köməyi ilə təyin olunur.

Əgər onlar: «Bir halda ki, sənin əlində bu cür meyar var, onda nəyə görə insanlar arasındakı ixtilaflara son qoymursan?» - deyə soruşsalar, onda cavab verərəm: «Əgər onlar mənə qulaq assalar, mən bu ixtilaflara son qoyardım. Mənim «Doğru mizanlar» kitabımda bu cür ixtilafların aradan qaldırılması üsulları haqqında danışılır – orada deyilənləri dərk et və sən başa düşərsən ki, orada yazılanlar doğrudur və əgər insanlar mənə qulaq assaydılar, mən bu ixtilaflara həmişəlik son qoyardım. Lakin onların heç də hamısı mənə qulaq asmır. Doğrudur, bəziləri mənə qulaq asmışlar və mən də onların ziddiyyətlərinə son qoymuşam».

«Sənin imamın isə – təlimiyə deyərdim – ona qulaq asmadan bu insanlar arasındakı ziddiyyətləri aradan qaldırmaq istəyir. Onda soruşmaq lazımdır ki, nəyə görə o, indiyə qədər bu ixtilaflara son qoymamışdır? Bunu Əli (124) nəyə görə həll etməmişdir? Axı o, imamların başçısıdır! Sənin imamın, ola bilər ki, bu insanları güclə özünə qulaq asmağa məcbur etmək istəyir. Onda nəyə görə bu günə qədər onları buna məcbur etməmişdir? Bunu o nə vaxt etmək fikrindədir? İxtilafların kəskinləşməsindən və mübahisəli məsələlərin artmasından başqa, insanlar onun çağırışından bir şey əldə edə bilərlərmi? Bəli, insanlar çəkinirdilər ki, bu ziddiyyət bu və ya digər ziyanı vura bilər, lakin bu zərər heç zaman qan tökülməsinə, ölkənin dağılmasına, uşaqların yetim qalmasına, küçə davalarına və özgə sərvətinin talan olunmasına qədər gəlib çıxmır. Lakin sizin «ixtilaflara son qoyma» əməlinizə görə sizin lütfünüzdən dünyada elə qarşıdurmalar baş verdi ki, insanlar beləsini əsrlər boyu görməmişdilər».

Təlimi deyə bilər: «Sən insanlar arasındakı ixtilaflara son qoya biləcəyini təsdiqləyirsən. Lakin bir-birinə düşmən nəzə-

riyyələrin arasında qalaraq və müxtəlif tərəflərdən bir-birini inkar edən mülahizələr eşidərək çaş-baş qalan bir insanı götürək. Onu sənin rəqiblərinə qulaq asmağa qoymadan yalnız səni eşitməyə məcbur etmək olmaz. Bir-birinə rəqib olanların çoxusu isə səninlə razı olmayacaqdır və həmin insan səninlə sənin rəqiblərin arasında heç bir fərq hiss etməyəcəkdir». Bu, onların ikinci sualıdır. Buna da mən belə cavab verirəm: «Birincisi, bu dəlil sənin özünə qarşı yönəlir. Çünki əgər sən belə adamı öz tərəfinə çağırsan, o, sənə deyər: «Bəs sən özün rəqiblərindən nədə yaxşısan? Axı alimlərin çoxu səninlə razı deyil». Bilmək istərdim ki, sən ona nə cavab verəcəksən. Ola bilər ki, sən belə deyəsən: «Mənim imamım haqqında mətndə göstəriş vardır». Əgər o, mətni Allahın Rəsulundan (122) eşitməyibsə, onda mətndə təsdiq olunan şeyə münasibətdə kim sənə inanar? Axı bu adam yalnız sənin təsdiqini eşidir və eyni zamanda da görür ki, bütün alimlər bir səslə bunun yalan və uydurma olduğunu təsdiqləyir. Daha sonra belə güman edək ki, o, mətnə görə səninlə razılaşır. Əgər peyğəmbərliyin əsl təbiəti barədə həmin adamda aydın təsəvvür yoxdursa, onda sənə bu cür etiraz edəcək: «Ehtimal edək ki, sənin imamın özünün haqlı olduğuna dəlil kimi İsanın (123) möcüzəsinə müraciət edər və deyər: «Sənin mənə inanmağın üçün mən sənin atanı dirildərəm». Bunu da güman edək ki, sənin imamın bundan dərhal sonra onu diriltdi və sənə özünün həqiqətdə haqlı olduğunu dedi. Lakin bu halda da onun tam həqiqətdə haqlı olduğunu necə bilə bilərəm? Axı bu möcüzənin əsasında İsanın (123) haqlı olduğuna heç də hamı inanmadı. Əksinə, onun qarşısına elə məsələlər qoydular ki, bunlara idrak vasitəsilə dərindən müzakirə etməmiş cavab vermək olmazdı. Məgər səncə idrakın dərindən baxışı etibara layiq deyil? Əgər sehrbazlığın nə olduğu və onun ecazkarlıqdan nə ilə fərqləndiyi, Allahın (121) Öz qullarını səhv düşüncələrə salıb-salmaması (səhv yola salınma məsələsinin nə olduğunu və ona cavab verilməsinin nə qədər çətin olduğunu isə hamı bilir) məlum deyilsə, onda möcüzəni həqiqətin sübutu kimi qəbul etmək mümkün deyil. Onda nəyə görə sən bütün bunları inkar edirsən? Axı məlum oldu ki, sənin imamının rəqiblərinin hansınınsa arxasınca getməkdənsə, onun arxasınca getmək üçün elə bir əlavə əsas yoxdur və o da rəqiblərinin nəzəri arqumentlərlə inkar etdiyi şeylərə müraciət etməli olur və belə halda rəqibləri həmin şeylərin üzərində eyni şəkil-

də və hətta daha aydın dəlillərlə əməliyyat aparırlar. Bu sual onların özlərinə qarşı elə ciddi şəkildə çevrildi ki, bu suala cavab vermək üçün əgər onların birincisindən sonuncusuna qədər hamısı toplansaydı belə, yenə də bunu edə bilməzdilər.

Bu nöqsanın mənbəyi elmi mübahisələrdə məsələlərin əsl mahiyyətinə baxmayan, yalnız həmin məsələyə aid suallara cavablar tərtib etməklə məşğul olan bəzi səfehlərdir. Bu, elə işdir ki, çox danışırlar, uzun müddət izah edirlər və öz rəqibini heç bir dəlillə susmağa məcbur etmək mümkün olmur.

Əgər kimsə: «Bax budur sualın mahiyyəti. Buna cavab varmı?» - deyə soruşsa, mən: «Bəli, cavab belədir. Əgər çaşqınlıqda qalmış adam desə: «Mən karıxmışam və məni bu çaşqınlığa gətirib çıxaran məsələni göstərə bilmirəm», - onda ona deyərlər: «Sən: «Mən xəstəyəm», - deyən və ağrıyan yerini dəqiq göstərmədən onu müalicə etmələrini tələb edən xəstə kimisən.

Sonra isə ona deyərdilər: «Ümumiyyətlə, xəstəliklərdən müalicə yoxdur. Baş ağrısını, ishalı və bu kimi konkret xəstəlikləri müalicə edirlər». Belə adam həm də onu çaşqınlığa gətirib çıxaran səbəbin nə olduğunu da göstərməlidir. Əgər o, həmin məsələni göstərərsə, onda mən həmin məsələni beş mizanda çəkib ona münasibətdəki həqiqətlə həmin adama tanış edərəm. Bu mizanların düzgün olduğuna, onların vasitəsilə çəkilən şeyləri düzgün göstərdiyinə inanan adam bu həqiqəti anlaya bilər». Yalnız belə insan həmin mizanları başa düşər. Hesabı öyrənən adamın hesabın məğzini bildiyi kimi və ona hesabı öyrədən şəxsin bu elmi bildiyinə və ona düzgün məlumatlar verdiyinə inandığı kimi, bu insan da mizanların düzgünlüyünü anlayar. Mən bütün bunları «Əməllərin mizanı» əsərində iyirmi səhifədə izah etmişəm. Qoy o, bunları gözdən keçirsin.

Burada artıq onların nəzəriyyələrinin qüsurluluğunu sübut etmək məqsədi qoyulmur. Bu barədə, birincisi, «Mustazxiriyskoy» kitabında, ikincisi, «Həqiqətin sübütü» kitabında (onların Bağdadda mənim qarşıma qoyduqları mühakimələrə cavablardan ibarət olan), üçüncüsü, on iki fəsildən ibarət olan «Mübahisə haqqında mühakimələr» kitabında (bunlar Həmədanda mənim qarşıma qoyulan fikirlərə cavablardır), dördüncüsü, Əl-Cəvadildə yazılan «Yol» kitabında (bunlar Tusda qarşıma qoyulan bədbəxt fikirlər haqqındadır) və beşincisi, «Əməllərin mizanı» kitabında (bu kitab

özü-özlüyündə müstəqildir: bu əsər elmi ölçülərə izahat vermək və günahsız imamı qəbul edənlərin onsuz da keçinə bilmələrini göstərmək məqsədi daşıyır) ətraflı danışılmışdır.

Yox, bizim məqsədimiz görün nə barədə danışmaqdır. Onların heç bir müalicə olunmaq üsulu yoxdur ki, bunun sayəsində öz düşüncələrinin qaranlığından çıxa bilsinlər. Lakin onların imamı müəyyən etməkdə arqumentlər irəli sürmək bacarıqsızlığına baxmayaraq, Nəzəriyyəyə və günahsız Müəllimə ehtiyacın olması məsələsində və həmin Müəllimin məhz onların təyin etdikləri kimi olduğu barədə onların haqlı olduğunu qəbul edir və onlarla razılaşırıq. Daha sonra biz onlardan həmin Günahsızdan qazandıqları bilik haqqında soruşduq və onlara elə suallarla müraciət etdik ki, nəinki cavab verə bilmədilər, hətta mahiyyətini belə anlamadılar. Özləri bunu etmək vəziyyətində olmadıqları halda, hamısını gizli imamın üstünə yıxdılar və dedilər: «Mütləq ona müraciət etmək lazımdır». Qəribə işdir: onlar bütün ömürləri boyu müəllim axtarışında olublar və onu tapmaları ilə öyünürlər, lakin bütün bu müddət ərzində ondan heç nə öyrənməyiblər. Onlar üst-başı tamam çirklənmiş, su axtarmaqdan yorulmuş elə bir adama oxşayırlar ki, əgər o, su tapsaydı da belə, ondan istifadə etməz və natəmizliklə örtülmüş vəziyyətdə qalmış olardı.

Onlardan bəziləri iddia edirlər ki, nəyisə bilirlər. Lakin onların söylədikləri mahiyyətcə qədim mütəfəkkirlərdən biri olan Pifaqorun bədbəxt fəlsəfəsindən parçalardır. Onun nəzəriyyəsi filosofların ən zəif nəzəriyyəsidir və Ərəstun onu təkcə rədd etməmiş, həm də onun bir heç olduğunu və əxlaqsızlığını göstərmişdir. «Saflıq qardaşları» əsərində məhz ondan söhbət gedir və həqiqətdə məhz o, bütün filosofların ən pisidir.

Özlərinin bütün həyatını bilik axtarışına sərf edən, özlərini son həddə çatdıran, lakin sonradan bu cür bədbəxt, zəif «elmlə» kifayətlənən adamlar təəccüb doğururlar. Və bu zaman onlar belə düşünürlər ki, guya elmin ən yüksək hüdudlarına nail olmuşlar. Bizim belə adamlarla təcrübəmiz var. Onların mülahizələri və gizli fikirləri üzərində yoxlama apardıqdan sonra bizə aydın oldu ki, həm bunun, həm də digərinin mahiyyəti sadəlövh insanları və zəif idraka malik olan adamları Müəllimə ehtiyac barədə müraciətlərə cəlb etməkdən və Nəzəriyyəyə qarşı çıxan istənilən şəxslə mübahisə etməkdən ibarətdir. Burada onların sübutları o qədər «güclü» və «inandırıcıdır» ki, əgər kimsə Müəllimə ehtiyac məsələsində

onların tərəfinə keçərsə və «Bizə onun biliyini ver və onun nəzəriyyəsini başa sal», - deyə müraciət etsə, təlimi dayanar və deyər: «Əgər sən bu məsələdə mənimlə razısansa, indi qalan şeyləri özün axtar – mənim məqsədim yalnız bununla bitir». Çünki təlimi bilir ki, əgər artıq bircə kəlmə də desə, onda özünü biabır edəcəkdir, ona görə ki, nəinki ən sadə məsələləri həll etmək, hətta onları anlamaq gücünə malik deyildir və biz hələ onlara cavab vermək məsələsinə toxunmuruq.

Təlimilərin işlərinin vəziyyəti barədə həqiqət belədir. Onları anlasan, nifrət edərsən. Biz isə dərk edərək onlara heç fikir də vermədik.

## SUFİLƏRİN ÜSULLARI

Bu elmlərlə qurtardıqdan sonra mən öz diqqətimi sufilərin yoluna (təriqətinə) yönəltdim. Mən öyrəndim ki, onların yolu (daha doğrusu, təriqəti) özünün kamil formasında həm nəzəriyyəni, həm də praktikanı özündə birləşdirir. Bu praktikanın mahiyyəti ondan ibarətdir ki, onlar Allah-Təala (121) haqqındakı düşüncələrindən və bunu möminliklə zinətləndirməkdən qeyri, bütün fikirlərindən idraklarını təmizləyənə qədər özlərini ruhun axmaq vərdişlərindən və nöqsanlı əlamətlərindən azad etməklə və ruhi ehtirasların kökünü kəsməklə məşğul olurlar.

Sufilərin nəzəriyyəsi mənim üçün onların praktikasından daha asan göründü. Mən onların elmi cəhdlərinin mahiyyəti ilə tanış olana, təhsil və söhbətlər yolu ilə əldə etmək mümkün olan hər şeyi onların üsullarından qavrayana qədər Əbu-Talib əl-Məkkinin (124) «Ürəyin qidası» kitabından, əl-Xaris əl-Mühasibinin (124) əsərindən, əl-Cüneyd (124), Əş-Şibli (124) və Əbu-Yəzid əl-Bistami (124) haqqındakı rəvayətlərdən və onların digər mənəvi rəhbərlərinin əsərlərindən bu nəzəriyyəni öyrənməyə başladım. O zaman mənə məlum oldu ki, onların özünəməxsus xüsusiyyəti daha artıq dərketməyə təhsil vasitəsilə deyil, yalnız sınaqlar, duyğular və ruhi keyfiyyətlərin dəyişdirilməsi yolu ilə çatmaqdan ibarətdir.

Bir tərəfdən sağlamlığın və toxluğun elmi tərifini bilməkdə, o biri tərəfdən sağlam və tox olmağın arasında; bir tərəfdən sərxoşluğun elmi tərifi, onun mədədən qalxan buxarın düşüncə mənbələrini fəth etmək hadisəsindən yaranan bir hal olduğunu bilmək, o

biri tərəfdən insanın özünün sərxoş olması arasında nə qədər böyük fərq vardır. Kefli adam sərxoşluğun elmi tərifini və onun nəzəriyyəsini bilmirsə də və sərxoşluğun təbiəti barədə azca da olsa təsəvvürü olmasa da, hər halda sərxoşdur. Ayıq insansa özü sərxoş olmasa da, sərxoşluğun tərifini və onun səbəblərini bilir. Xəstələnən bir həkim öz xəstəliyinin tərifini, onun səbəblərini və sağalmaq üçün lazım olan dərmanı bilir və buna baxmayaraq, özü də xəstədir. Bir tərəfdən tərki-dünyalığın həqiqi təbiətini, onun şərtlərini, çıxış nöqtəsini bilmək və o biri tərəfdən insanın özünün həmin tərki-dünyalığı və bu yer üzünə, bu fani dünyaya ruhi nifrət vəziyyətini hiss etmək halları arasındakı fərqlər də eynən bu cürdür.

Mənim üçün tam aydın oldu ki, onlar mühakimə mücahidləri deyil, təlqin adamlarıdır və mən nəzəri yolla qavranıla bilən bütün şeyləri əldə etdim. Lakin söhbətlər və tədris vasitəsilə deyil, yalnız sınaqlar və müəyyən həyat tərzi sayəsində qazanıla bilən şeylər qalmışdır.

Mənim məşğul olduğum elmlər və bu elmlərin iki növü – dini-hüquqi və rasional elmlərin sayəsində məndə hələ əvvəldən Allah-Təalaya (121), peyğəmbərliyə və Qiyamət gününə böyük inam yaranmışdı. Dinin bu üç əsası mənim ruhumla müəyyən, dəqiq sübutlar sayəsində deyil, deyilməsi mümkün olmayan səbəblər, şəraitlər və təcrübələr nəticəsində yaranmışdı.

Mənə aydın oldu ki, o biri dünyadakı xoşbəxtliyə yalnız mömin həyat tərzində ömür sürən və dünyəvi həzlərdən kənar duran insanlar ümid edə bilərlər, bunlarda ən əsas şeysə heç bir dəyəri olmayan bu sarayı tərk edərək ölümsüzlük sarayına üz çevirmək və bütün diqqəti Allah-Təalaya (121) yönəltməklə ruhu fani dünya ilə əlaqələndirən yolları dağıtmaqdır və bunu yalnız bütün vəzifələrindən və zənginliyindən imtina edən, dünyəvi iztirablardan və əlaqələrdən kənar qaçan insan həyata keçirə bilər.

Daha sonra mən öz baxışlarımı özümün şəxsi halıma yönəltdim və məlum oldu ki, özüm məni tor kimi əhatə etmiş dünyəvi əlaqələr içərisində itib-batmışam. Özümün fəaliyyətimə, həm də bu fəaliyyətin daxilində olan şeylərin ən yaxşısına – mühazirələr deməyə və müəllimlik etməyə – baxdıqda mən aşkarladım ki, özünü o biri dünyaya səyahətə hazırlayan adam üçün mənası və faydası olmayan elmlər məni tamam məşğul etmişdir. Sonra mən öz müəllimlik fəaliyyətimlə çatmaq istədiyim məqsədlər barədə

düşündükdə, aydın oldu ki, bu məqsədlər barədə mənim fikirlərim yalnız tam olaraq Allah-Təalaya (121) istiqamətlənməmişdir, vəzifə və geniş şöhrət mənim üçün vadaredici səbəb və hərəkətverici qüvvə rolunu oynamışdır. Mən əmin oldum ki, uçurumun kənarında dayanmışam və əgər öz vəziyyətimi düzəltməklə məşğul olmasam, yəqin ki, Cəhənnəmə düşəcəyəm.

Öz halım barədə düşünməkdən dayanmayaraq müəyyən vaxt ərzində son seçimimi etmədim: bu gün mən Bağdaddan getmək və öz ətrafımdakı mühitlə əlaqəni qırmaq qərarını verirdim, sabah isə bunu etməkdən daşınırdım. Özümün o zamankı planlarımda mən bir ayağımla irəli, digəri iləsə geri addım atırdım: səhərlər mənim doğru yollar axtarışına başlamağı ürəkdən arzulamağım ona gətirib çıxarırdı ki, axşamlar bu arzularımın üzərinə onu soyudan dünyəvi ehtiraslar qoşunu hücum çəkirdi. Dünyəvi ehtiraslar məni öz buxovları ilə yerimdə dayanmağa dartır, eyni zamanda dinin səsi məni qışqırıb çağırırdı: «Yola! Yola! Sənin yaşamağına az qalıb, qarşında isə uzun bir yolçuluq var. Sənin yükləndiyin elm və iş yalnız yalan və xəyalətdir. Əgər indi deyilsə, bəs nə vaxt özünü o biri həyat üçün hazırlayacaqsan? Əgər indi deyilsə, bəs nə vaxt özünün bu dünya ilə əlaqələrini qıracaqsan?» Belə zamanlarda qaçmaq arzusu yaranır və cəsarətim möhkəmlənirdi. Lakin həmin andaca iblis peyda olur və deyirdi: «Bu, təsadüfi bir haldır və ona məğlub olmağı heç ağlına da gətirmə. Bu, tez keçib gedəcək və sən əgər ona məğlub olub sənə etimad edilmiş vəzifələrdən, heç bir kədər, heç bir qəm bilməyən nizama salınmış həyatından və hətta heç bir düşmənin tərəfindən əlindən alına bilinməyən firavanlığından əl çəksən, ola bilər ki, sənin qəlbin bu cür həyata yenidən qayıtmaq istəyəcək, lakin buna bir daha qayıtmaq sənə müyəssər olmayacaqdır».

Təqribən altı ay mən dünyəvi ləzzətlərin cazibəsi ilə o biri həyata çağırış arasında dayanmadan tərəddüd etməkdə davam etdim. Bu isə 488-ci ilin rəcəb ayında (1005-ci ilin iyul-avqust ayları) başlanmışdı.

Həmin ayda məsələ azad seçim hüdudlarını aşdı və zərurilik mövqeyinə keçdi. Allah (121) mənim dilimi bağladı və onun bu bağlılığı məni hətta tədrisimi aparmağa da mane oldu: bir gözəl gündə mən öz dərsimi mühazirələrimə gələnlər üçün daha xoş etməyə səy göstərdikdə, dilim bircə söz də ifadə edə bilmədi və mən nə qədər çalışdımsa da, bunu edə bilmədim. Mənim dilimin

bu cür bağlanması nəticədə qəlbimdə kədər oyatdı. Eyni zamanda həzmetmə qabiliyyətim də yoxa çıxdı – yeməyə və içkilərə məndə heç bir iştaha həvəsi qalmamışdı, çörək boğazımdan keçmirdi, bir tikə də olsa yemək həzm olunmurdu. Məndə elə bir zəiflik yarandı ki, təbiblər mənim sağalmağıma ümidlərini itirdilər. Onlar deyirdilər: «Onun ürəyini yaralayan şey ürəkdən sonra bütün bədəninə yayılmışdır. Əgər onu əldən salan qayğının sirri açılarsa, yalnız o zaman müalicə etmək mümkün olar».

Özümdə zəiflik hiss edərək və seçim sərbəstliyindən tam məhrum olaraq zərurilik hökmü altına düşən və öz ixtiyarı ilə heç bir qərar qəbul etmək qabiliyyətinə malik olmayan insanlar kimi, mən də Allah-Təalaya (121) müraciət etdim. Və həmin adamı – zərurilik hökmü altına düşən zamanda Ona tərəf müraciət edən – cavablandıran Şəxs mənə cavab verdi. Mənim ürəyim üçün artıq həm vəzifələrdən, həm zənginlikdən, həm övladlarımdan, həm də dostlarımdan imtina etməkdən asan bir şey yox idi.

Beləliklə, mən özümün Məkkəyə getmək qərarımı bəyan etdim, əslində isə ürəyimdə Suriyaya səfər etməyi düşünürdüm. Mən xəlifənin və dostlarımın Suriyada qalmaq niyyətimdən xəbər tutacaqlarından çəkinərək belə hərəkət etdim. Mən özümün Bağdadı tərk edərək bir daha buraya qayıtmamaq qərarımı gizlətmək üçün hiyləyə əl atdım. Və mən İraq əhalisinin butun dini rəhbərlərinin qınağına tuş gəldim, çünki heç kəsin ağlına gəlmirdi ki, məni əhatə edən hər bir şeydən imtina etməyimin dini səbəbləri ola bilər, zira onlar güman edirdilər ki, bunlar hamısı din xadiminin nail ola biləcəyi ən yüksək həddir. Bundan artıq onlar heç nə bilmirdilər.

Bundan sonra insanlar mümkün olan başqa gümanlar içərisində itməyə başladılar: İraqdan uzaqda olanlar düşünürdülər ki, mən hakimiyyətdən hansısa bir bədxah əməli əvvəlcədən hiss etdiyimə görə gedirəm, hakimiyyətə yaxın olanlar isə onların mənə möhkəm bağlılığını və sədaqətini bildiklərindən və mənim onların bütün nəsihətlərinə rəğmən çıxıb getməyimi gördükdə belə deyirdilər: «Bu, talenin əlidir: müsəlman icmasının və üləma birliyinin bədnəzərə gəlməsindən başqa bir şey deyildir».

Beləliklə, mən bütün əmlakımı insanlara paylayıb Bağdadı tərk etdim. Mənim yığdığımsa yalnız özümü və övladlarımı yedizdirmək üçün zəruri olan miqdarda idi. Mən bunu özümə ona görə rəva görmüşdüm ki, müsəlmanlar üçün nəzərdə tutulmuş İraqın

pulu ümumi rifah üçün xərclənirdi və mən dünyada pulun sərf edilməsində ən yaxşı yol kimi onun alimlərin öz övladları üçün yığmalarını görürdüm.

Sonra mən Suriyaya gəldim və burada iki il yaşadım. Mənim bu illər ərzində tərki-dünyalıqdan, tənha həyat keçirməkdən, təlimlərdən və ruhun paklanmasını müşayiət edən zahidlikdən, əxlaqi keyfiyyətləri kamilləşdirməkdən və ağılı sufilərdən qəbul etdiyim şeylərə uyğun olaraq möminliyə hazırlamaqdan başqa heç bir məşğələm yox idi. Bir müddət heç bir yerə çıxmadan Dəməşq məscidində gün ərzində bu məscidin minarəsinə qapanaraq və arxamca qapını örtərək keçirdim. Buradan Yerusəlimə yollandım və kiçik əs-Səhra kilsəsində hər gün qapalı vəziyyətdə oturub qaldım. Allahın Dostunu[7] (123) ziyarət etdikdən sonra məndə zəvvarlıq ziyarətinin ayinlərini həyata keçirməyə və Məkkənin, Mədinənin şəfalı yerlərinə baş çəkməklə, Allahın Rəsulunun (122) qəbrini ziyarət etməklə ruhumun möhkəmləndirilməsinə təəşşüq yarandı. Beləliklə, mən Hicaza yollandım.

Sonra isə övladlarımın qayğısı və çağırışı məni vətənə cəlb etdi və mən bu ana qədər oraya qayıtmaq barədə hər hansı şəxsdən daha az düşündüyümə baxmayaraq, vətənimə qayıtdım. Lakin vətənə qayıtdıqdan sonra da tənhalığımı qorumaqda və zahidlik üçün ruhumu, ürəyimi paklaşdırmaqla insanlardan kənarda olmağı üstün tutdum. Talenin dönüklüyü, ailə qayğıları və məişət ehtiyacları mənə məqsədlərimi həyata keçirməkdə mane olurdu və öz hay-küyü ilə tərki-dünya həyatın sakitliyini pozurdu. Mənim üçün zəruri olan şərait yalnız bəzi vaxlarda olurdu, lakin buna baxmayaraq, mən nə vaxtsa öz niyyətimə çatacağıma ümidimi itirmədim və yolumun üstündə hər dəfə maneələr durduqda mən onları dəf edir və təyin olunmuş məqsədimə doğru irəliləyirdim.

Düz on il belə davam etdi. Bütün bu tənhalıq illəri ərzində mənim qarşımda elə şeylər aşkarlandı ki, onları nə hesablamaq, nə də tədqiq etmək mümkün idi. İşin faydası naminə mən yalnız bir şeyi xatırladım. Mən tam yəqin etdim ki, Allah-Təalanın (121) yolu ilə gedənlər məhz sufilərdir, onların həyat tərzi ən gözəl həyat tərzidir, onların yolu ən yaxşı yoldur və onların əxlaqı ən təmiz əxlaqdır. Mən bundan da artıq deyə bilərəm. Sufilərin həyat tərzlərində və əxlaqlarında heç olmasa bir az yaxşılaşdırma məqsədi ilə nəsə bir şey etmək üçün əgər bütün ağıllı insanların idrakını, müdriklərin müdrikliyini və ilahi qanunları bilənlərin biliklərini

bir yerə yığsaydıq, onlar bilməzdilər ki, bunu necə etsinlər. Çünki sufilərin bütün işlərinin və əməllərinin, onların bütün gizli və açıqlanmış fikirlərinin mənbəyi Peyğəmbərlik Taxçasından[8] gələn nurdur və dünyada insanların rəhbər tuta biləcəkləri peyğəmbərlik nurundan başqa, işıq yoxdur.

Təmizliyi – bu, onun birinci şərtidir – Allah-Təalaya (121) yad olan hər bir şeydən ürəyin tamam təmizlənməsindən ibarət olan, başlanğıcı – bundan qaçansa Allahın (121) xeyir-duasından məhrum olur – ürəyin tam olaraq ilahi düşüncələrə dalmasından ibarət olan və sonu tam olaraq Allahın (121) özündə yox olmaqdan ibarət olan bu yol (təriqət) barədə insanlar nə danışırlar? Lakin bu yalnız, demək olar ki, sərbəst seçim sahəsində olan və ondan başlanğıc götürən şeyə münasibətdə sondur. Yaxından baxdıqda isə məlum olur ki, bu yalnız onların yollarının başlanğıcıdır, lakin buna qədər olanlar isə bu yola daxil olanlar üçün bir ərəfədir.

Gizlinin aşkarlanması və seyr edilməsi bu yolun lap başlanğıcında meydana çıxır, buna görə də, sufilər hətta tam ayıq olduqda belə, mələkləri və peyğəmbərlərin ruhunu seyr edirlər, onların səslərini eşidir və bunlardan fayda götürürlər. Xəyalları və surətləri seyr etmənin ardınca vəhylərin izahı mümkün olmayan yeni, daha yüksək pillələri gəlir, buna görə də, əgər kimsə bunu ifadə etməyə çalışarsa, onda onun sözləri mütləq yanlış olacaqdır və bundan da qorunmaq mümkün deyil.

Qısası, məsələn, yaxınlığa gedib çatır və bu zaman bəzilərinə elə gəlir ki, onlar əriyirlər, digərlərinə sanki qovuşurlar, üçüncülərə isə elə gəlir ki, onlar artıq bunu dərk etmişlər. Lakin bunlar hamısı səhvdir. Biz artıq belə hallarda buraxılan səhvlər haqqında «Ali məqsəd» kitabında izahat vermişik. Bu halı sınaqdan keçirən adama isə yalnız bunu demək olar: «Nə baş veribsə, artıq olub, lakin nə olubsa, xatırlamıram. Yaxşı düşün və sənə nəyisə xəbər vermələrini təmənna etmə».

Bir sözlə, bütün bunlardan nəyisə özündə hiss etməyən insan peyğəmbərliyin adından başqa, onun əsl təbiətindən heç nə başa düşməyəcəkdir. Diqqətlə nəzərdən keçirdikdə məlum olur ki, müqəddəslərin möcüzələri peyğəmbərliyin[9] birinci təzahürüdür. Allahın Rəsulunun (122) bu dünyanın özündən uzaqlaşaraq Hira dağına gəlməsi və orada öz Allahı (121) ilə tək qalması zamanındakı vəziyyət məhz belə hallardandır və həmin vaxt o, ərəblərin qarşısında möminliyini elə izhar etmişdir ki, ərəblər bir səslə:

«Doğrudan da, Məhəmməd öz Allahına olan qızğın məhəbbətindən alışırdı», - söylədilər.

Bilavasitə hiss etməklə həmin halı yalnız sufilərin yolu ilə gedənlər öyrənə bilərlər. Lakin bunu öz üzərində hiss etməyənlər yalnız sufilərlə tez-tez ünsiyyətdə olaraq onların söhbətləri və təcrübələri əsasında səhih bilik əldə edə bilərlər. Onların vəziyyətləri ilə müfəssəl tanış olduqdan sonra yalnız o zaman mötəbər məlumat qazana bilərlər. İnsanın onlarla az müddət oturması kifayət edir ki, onların inamını qəbul etsin. Sufilərsə elə insanlardır ki, onların müsahibləri heç bir yamanlıq bilmirlər. Əgər onlarla ünsiyyətdə olmaq kiməsə müyəssər olmayıbsa, onda qoy həmin şəxs məntiqi arqumentlərin göstəricilərinə əsaslanaraq «Dini elmlərin dirçəlişi» kitablarından birində, daha dəqiq desək, «Ürəyin möcüzələri» kitabında göstərdiyimiz şəkildə bunun mümkünlüyünə inansın.

Məntiqi sübutlar yolu ilə həqiqətin müəyyən edilməsi elə dərketmənin özüdür. Özünü həmin vəziyyətə gətirməksə birbaşa bu vəziyyətdə yaşamaqdır. Digərlərinin təcrübələrindən və söhbətlərindən əxz edilməsi mümkün olanların xoş niyyətlərlə qəbul edilməsi etiqadın özüdür.

Haqqında: «Sizin aranızdan inananları və dərk edə bilmək halında olanları Allah pillələrlə yüksəklərə qaldırar», - şəklində danışılan üç pillə belədir.

Bu insanlardan sonra cahillər gəlir. Sonuncular bütün bunları kökündən inkar edirlər və bu cür söhbətlər onlarda nəsə qəribə bir təəssürat yaradır və onlar buna qulaq asaraq istehza ilə deyirlər: «Təəccüblüdür! Onlar belə cəfəngiyatı necə danışa bilirlər!» Beləleri haqqında Allah-Təala (121) buyurub: «(Ya Peyğəmbər) Onların (kafirlərin) içərisində elələri vardır ki, səni dinləyər, sənin yanından çıxıb gedən kimi elmə çatmış kimsələrdən (səhabədən istehza ilə): «Məhəmməd bu saat nə dedi?» - deyə soruşarlar. Onlar Allahın ürəklərinə möhür vurduğu və nəfslərinə uymuş kimsələrdir!»

Mən onların üsullarını təcrübədən keçirdiyim zaman mənim üçün aşkarlanan şeylərə peyğəmbərliyin əsl mahiyyəti və onun məxsusi xüsusiyyətləri daxildir. Burada peyğəmbərlik prinsipi üzərində zəruri olaraq dayanmaq lazımdır, zira buna kəskin ehtiyac hiss olunur.

# PEYĞƏMBƏRLİYİN ƏSL MAHİYYƏTİ VƏ ONUN BÜTÜN İNSANLAR ÜÇÜN VACİBLİYİ

Bil ki, insanın özünün ilkin şəkildəki mahiyyəti təmiz, təcrübəsiz, Allah-Təalanın (121) aləmləri barədəki biliklərdən xəbərsiz yaradılmışdır. Bu aləmlərsə o qədər çoxdur ki, yalnız Allah-Təala (121) məhz özü onları saya bilər. Allah-Təala (121) bu barədə buyurub: «Və Allah-Təalanın qoşunu barədə Onun özündən başqa bir kimsə bilmir». İnsan dünya ilə yalnız onu dərk edərək tanış ola bilər və hər bir dərketmə üsulu ondan ötrü yaranmışdır ki, insan onun köməyi ilə gerçəkliklər dünyasını başa düşsün. Dünya dedikdə, biz gerçəkliklər növünü başa düşürük.

İnsanda yaranan birinci şey lamisə duyğusudur və insan onun köməyi ilə isti və soyuq, nəmlik və quruluq, yumşaqlıq və bərklik və digər bu kimi gerçəklikləri dərk edir. Rəng və səs lamisə duyğusuna qəti olaraq aid deyil – onlar lamisə üçün sanki mövcud deyillər.

İnsanda daha sonra görmə hissi yaranır və onun köməyi ilə qavranılan predmetlərin çox geniş aləmini yaradan rəngləri və formanı dərk edir.

Daha sonra eşitmə qabiliyyəti ona pay verilir və insan səsləri və tonları eşidir.

Onun üçün daha sonra dadbilmə duyğusu yaranır.

Bütün bunlar insan hissi predmetlər aləminin hüdudlarını aşana qədər davam edir. Və o zaman, təxminən yeddi yaşına çatdıqda insanda seçmə qabiliyyəti yaranır. Bu pillədə o, hisslər dünyasında mövcud olmayan, qavranılan predmetlər aləminin sərhədlərindən kənarda yerləşən şeyləri dərk edir.

O daha sonra yeni bir pilləyə yüksəlir və onun üçün idrak yaradılır. Bu zaman o, zəruri və lazım olan, lazım olmayan və əvvəlki pillələrdə rastlaşmadığı şeyləri dərk edir.

İdrakdan sonra digər bir pillə də gəlir və bu zaman insanda yeni bir göz yaranır və bunun köməyi ilə gizlinləri anlayır, gələcəkdə baş verəcəkləri görür və dərk olunan şeylərin seçmə qabiliyyəti üçün, seçmə bacarığı ilə anlanılan şeylərin isə hissi qabiliyyətlərdən ötrü mümkünsüz olması kimi, bu halda da idrak üçün əlçatmaz olan şeyləri dərk edir.

Əgər yalnız fərqləndirmə qabiliyyətinə malik olan insana

dərk oluna bilən şeyləri təqdim etsəydilər, o, bunları inkar edər və onları ağlasığmaz şeylər sayardı.

Bunun kimi bəzi dərrakəli adamlar da peyğəmbərlik istedadı sayəsində insanın nail olduğu şeyləri inkar etmiş və onları ağlasığmaz saymışdılar. Bu təmiz cahillikdir, çünki onlar bunun üçün yeganə mühakimə kimi yalnız bunu irəli sürə bilərdilər: onlar peyğəmbərlik pilləsinə nail olmamışlar; bu pillə onlar üçün mövcud deyildir və buna görə də onların fikrincə, bu şey öz-özlüyündə mövcud ola bilməzdi. Əgər rəngləri və formaları bilməyən bir kor insana həmin şeylər haqqında ilk dəfə danışsaydılar, o heç bir şey anlamazdı və belə şeylərin mövcud olmasını ağlına belə gətirməzdi.

Allah-Təala (121) peyğəmbərliyi Öz yaratdıqları üçün tamamilə əlçatan bir şey kimi yaratmış və onu peyğəmbərliyin xüsusi nümunəsi kimi yuxu ilə təchiz etmişdir. Çünki yatan adam gələcəkdə baş verəcək elə gizlinləri dərk edə bilir ki, mənası ya ayıqlıqda, ya da hansısa digər xüsusi formada yuxuyozmalar vasitəsilə açıqlana bilir. Əgər bütün bunları öz üzərində sınaqdan keçirməyən adama bunu desələr: «İnsanlar arasında eləleri vardır ki, yarıölü, bihuş vəziyyətə düşərək, görmə və hissiyyatdan, eşitmə və görmə bacarıqlarından məhrum olaraq gizlinlərə vaqif olurlar», o, bu cür iddiaları inkar edər və bunun cəfəngiyat olduğuna sübut kimi söyləyərdi: «Hissi qabiliyyətlər şeylərin dərk olunması üçün səbəbdir və əgər kimsə həmin qabiliyyətlərin olduğu zamanda buna nail ola bilmirsə, onda bu bacarıqların zəiflədiyi anda həmin şeyləri dərk etmək heç mümkün deyildir».

Lakin bu, həqiqət və aşkarlıq vasitəsilə təkzib olunan nəticələrdəndir. Hisslər vasitəsilə qavranılması mümkün olmayan şeyləri görməsi üçün insanda yeni bir göz yarandığı zaman bu idrakın insanın inkişaf pillələrinin birini təşkil etdiyi kimi, peyğəmbərlik də elə bir pilləni təşkil edir ki, bu pilləyə nail olan şəxs nura malik göz qazanır, gizlinlər və idrak üçün əlçatmaz olan şeylər həmin insan üçün aydınlaşır.

Peyğəmbərliyə şübhə ilə yanaşmaqsa, ya onun mümkünlüyünə, ya onun mövcudluq və gerçəkliyinə münasibətdə, ya da onun hər hansı bir fərdi insanda həyata keçməsinə münasibətdə ola bilər.

Profetizmin mümkünlüyünün sübutu onun özünün mövcudluğudur. Onun mövcudluğu isə bununla sübut olunur ki, dünyada

elə biliklər vardır ki, onların yalnız idrak vasitəsilə əldə olunmasını heç ağıla da gətirmək olmaz. Belə biliklərə yalnız İlahi təlqin və Allah-Təala (121) tərəfindən olan yardım sayəsində dərk olunan biliklər aiddir. Əməli yolla onları qazanmaq mümkün deyil.[1]..

İdrak vasitəsilə əldə oluna bilinməyən şeylərə nail olmaq üçün müəyyən üsulun olması göstərdiyimiz sübutlardan bəlli olur.

Profetizm dedikdə, məhz həmin üsul nəzərdə tutulur, ona görə yox ki, profetizm yalnız bunda özünü göstərir, ona görə ki, ağıl vasitəsilə dərk olunma hüdudlarından kənara çıxan şeyləri anlamaq çoxlu digər xüsusiyyətlərə də malik olan profetizmin yalnız bir əlamətidir və bu əlamət dənizdəki damla kimidir. Bu şeylər haqqında ona görə söhbət açırıq ki, sən bunların bir formasına – gizlinləri yuxuda dərk etmək qabiliyyətinə maliksən. Sən həm də təbabətdə və astronomiyada da bu növ biliyə sahibsən. Lakin yalnız idrakının malik olduğu şeylərə sahib olan şəxslər üçün bu biliklər əlçatmazdır.[2]

Peyğəmbərliyin digər xüsusiyyətlərinə gəldikdə isə, onlara yalnız sufilərin yolu ilə gedərək, birbaşa təəssürata əsaslanaraq nail olmaq olar, ona görə ki, adını çəkdiyimiz qabiliyyətə peyğəmbərlik xüsusiyyətlərinin bir forması kimi sənə əta olunmuş yuxu sayəsində nail olmusan və əgər səndə bu cür nümunə olmasaydı, onda sən onun mövcudluğuna inanmazdın. Əgər peyğəmbərin malik olduğu hər hansı bir xüsusiyyətə sən sahib olmasaydın, onda onun mövcudluğuna necə inana bilərdin? Zira yalnız dərk etdikdən sonra inanmaq olar. Bu nümunə isə sufilərin yolu ilə getməyə başladığın ilk vaxtlarında qazanılır və bu nümunənin sayəsində insanda onun zahidliyinin həmin mərhələsinə uyğun müəyyən növ təəssürat və məntiqi yolla sübut oluna bilinməyənə müəyyən növ inam yaranır.[3] Lakin sənin üçün elə bircə həmin nümunə bəs edər ki, sən peyğəmbərlik prinsipinin mövcudluğuna əmin olasan.

Əgər səndə müəyyən insanın peyğəmbər olub-olmaması barədə şübhə yaranarsa, onda yalnız həmin şəxsin əməlləri ilə – ya bilavasitə müşahidə vasitəsilə, ya da digər şəxslərin danışdıqlarına əsasən – tanış olduqdan sonra bu haqda dürüst məlumat qazana bilərsən. Çünki əgər sən təbabəti və müsəlman hüququnu bilirsənsə, onda həmin qanunvericilərlə və həkimlərlə ya onların əməllərini birbaşa müşahidə etməklə, ya da digər bir halda, onların mühakimələrinə əsasən tanış ola bilərsən. Biz Əş-Şafiinin (124)

qanunverici və Qalenin isə həkim olması haqqında həqiqi məlumatlara malik olmağını mümkünsüz hesab etmirik, onun üçün bu əməlləri digərlərinin ardınca təkrar etmək lazım deyil, sənin təbabətdə və müsəlman hüququnda müəyyən biliklər əldə etməyin, onların kitablarını və əsərlərini oxumağın kifayət edir ki, bunların nəticəsində onların əməlləri və işləri haqqında doğru məlumat əldə edə biləsən. Bunun kimi, əgər sən peyğəmbərliyin mənasını anlamış olsan, Quranı və hədisləri səylə oxusan, onda Allahın Rəsulunun (122) peyğəmbərliyin ən yüksək pilləsində durduğu barədə zəruri məlumatlar ala bilərsən. Əgər sən onun ibadətlər və bunların ürəyi paklaşdırmağa təsiri barədə deyilənləri təcrübə etsən və o, özünün: «Öz biliklərinə uyğun olaraq hərəkət edənlər Allahın bilmədikləri şeyləri dərk edən vərəsələridir», «Allah öz köməkçilərinə zalım olana zülmkar hakim verər» və «Səhərlər yalnız bircə qayğı ilə yuxusundan duran insanı Allah-Təala (121) həm bu dünyada, həm də o dünyada bütün qayğılardan azad edər», – kəlamlarında nə qədər doğru olduğunu hiss etsən, onda özünə kömək etmiş olarsan. Əgər sən bunu min dəfə, iki min dəfə, çox min dəfələrlə sınaqdan keçirsən, onda zəruri və mübahisəsiz bilik sənə qismət olacaqdır. Əsanın ilana çevrilməsindən və Ayın ikiyə bölünməsindən (Peyğəmbərin (122) möcüzələrindən biri) deyil, elə bu üsuldan peyğəmbərlik haqqında doğru biliklər tələb et. Əgər sən bu möcüzələrə (yəni qəramət-möcüzələrə) diqqət yetirib, çoxlu sayda digər vəziyyətlərə fikir verməsən, onda ola bilər ki, bunlar hamısı sənə sehrbazlıq və yalan, Allah-Təaladan (121) uzaqlaşma kimi görünə bilsin – axı O, «kimi istəsə yanlış yola sala bilər, kimi istəsə doğru yolla aparar».

Burada sən yenə də möcüzələr barədə məsələlərlə qarşılaşırsan. Əgər sənin inamın möcüzələrin həqiqi olmasını sübut etmək məqsədi ilə müntəzəm olaraq dəlillərə istinad edərsə, onda buradan əmələ gələn çətinliklərə nisbətən nizamlanmış mühakimələr və şübhələr sənin inamının möhkəmlənməsinə gətirib çıxaracaqdır. Qoy bu cür qeyri-adi şeylər sənin baxışlarının məcmu halına düşmək səbəblərindən və anlarından biri olsun və səndə elə bir zəruri bilik yaransın ki, sən onun mənbəyini dəqiq olaraq göstərə bilməyəsən. Bu, ona bənzəyir ki, hər hansı bir şayiəni ətrafa yayan kütlədə bu şayiənin mənbəyi verilən insanlar qrupundan kənarda olduğu üçün və konkret şəxslərin mülahizəsinə istinad etmək mümkün olmadıqda dəqiq olaraq elə bir şəxsi göstərmək mümkün

deyil ki, məhz onun mülahizəsi bu şayiənin yaranmasına səbəb olsun. Məhz bu da nəyəsə möhkəm və şüurlu şəkildə inanmaq deməkdir.

Bilavasitə təəssürata gəldikdə isə, bu, birbaşa müşahidəyə və sanki dərk olunan şeyin ələ götürülməsinə bərabər olan yüksək bir dərketməyə bənzəyir. Dərketmənin bu üsulu yalnız sufilərə xasdır.

Peyğəmbərliyin həqiqi təbiətinə bu baxış bizim indiki zamanda güddüyümüz məqsədlər üçün kifayət edər və lazım gələrsə, mən yenə də bu mövzuya qayıdaram.

---

[1] Batiniyyə – ismaili müsəlmanlarının nəzəriyyəsi. Bu nəzəriyyəyə görə, islamın əsl mənasını yalnız mücərrəd şərh etməklə dərk etmək mümkündür.

[2] Zahiriyyə – bu nəzəriyyəyə görə, islam ardıcılları müqəddəs kitabların hərfi mənasının tərəfdarları olmalıdırlar.

[3] Əhməd ibn-Hənbəl (780 – 855) – dörd məzhəbdən birinin əsasını qoyan imam.

[4] Əl-Həris əl-Mühasibi (781 – 857) – sufi şeyxi.

[5] İcdihad – şəriətdə birmənalı olaraq cavabı verilməyən sualların şərhi.

[6] Fitva – icdihadın köməyi ilə bu və ya digər məsələdə qəbul olunan qərar.

[7] İbrahim (123) peyğəmbərin Xevronda yerləşən qəbri nəzərdə tutulur.

[8] Qurandan istilah.

[9] Burada və daha sonra «peyğəmbərlik» ifadəsində Allah-Təalanın əta etdiyi elə bir qabiliyyət nəzərdə tutulur ki, onun köməyi ilə insan adi adamlara görünməyən şeyləri görür, onlar üçün gizli olanları dərk edir.

## MƏNİM BU MƏŞĞULİYYƏTDƏN İMTİNA ETDİKDƏN SONRA ELMLƏRİ YAYMAĞIMIN SƏBƏBİ

Bir çox üsulların sayəsində səylə yaşadığım təxminən on illik tənha tərki-dünya həyatımdan sonra həmin təəssüratların, həmin məntiqi dərketmələrin, həmin qəbul etdiyim inamın nəticəsində mənim qarşımda zəruri olaraq belə bir həqiqət aşkarlandı ki, insan ürəkdən və bədəndən yaradılmışdır. Mən ürək dedikdə, insanın Allah (121) haqqındakı biliklərinin anbarı sayılan ruhunun həqiqi təbiətini, daha doğrusu, həm heyvanlarla, həm də ölülərlə eyni olan bədən cismindən və qanından savayı, qalanını nəzərdə tuturam.

Mənim qarşımda həm də o həqiqət aydınlaşdı ki, insanın sağ-salamat yaşaması bədənin sağlamlığının, insanın məhvi isə onun xəstəliyinin sayəsində olduğu kimi, ürək də həm sağlam və nöqsansız («Allahın yanına yalnız sağlam ürəklə yollanan insan» xilas olacaqdır), həm də elə xəstə ola bilər ki, bunun səbəbindən o həm bu dünyada, həm də o dünyada məhv ola bilər. Allah-Təala (121) buyurub: «Xəstəlik onların ürəklərindədir».

Daha sonra qarşımda bu həqiqət də açıldı ki, Allahdan (121) xəbərsizlik məhvedici bir zəhərdir, öz ehtiraslarının ardınca getməklə Onu eşitməməkdə ürək üçün öldürücü bir xəstəlik vardır, Allah-Təalanı (121) tanımaqsa həyatverici bir padzəhrdir və Ehtiraslarla mübarizə aparmaqla Onu eşitmək ürək üçün şəfaverici bir dərmandır.

Mənə aydın oldu ki, ürəyə şəfa vermək, onun xəstəliklərini kənar etmək və sağlamlıq əldə etmək üçün yeganə vasitə dərmanlardır ki, eynən bədəni sağaltmaq üçün də müəyyən dərmanlarsız keçinmək mümkün deyil.

Zəruri olaraq özüm üçün onu da aydınlaşdırdım ki, bədənin sağalması üçün nəzərdə tutulan, bu sağlamlığı əldə etmək üçün daxilində özünəməxsus xassələri olan, yalnız idrakın köməkliyi ilə dərk olunmayan, həm də şeylərin xassələri barədəki biliklərə əsaslanaraq öz elmini peyğəmbərlərdən və peyğəmbərliyə xas xüsusiyyətləri dərk edən həkimlərin məsləhətləri ilə qəbul olunmalı olan dərmanlar kimi, ibadətlərin də şəfaverici təsiri onların peyğəmbərlər tərəfindən müəyyən olunmuş və ölçülmüş hədlərindən asılıdır. Bu şəfaverici dərmanın necə təsir göstərməsi dərrakəli insanların idrakı üçün əlçatmazdır. Buna görə də bu vasitə-

lərə əl atdıqda öz səviyyələrinə idrak vasitəsi ilə deyil, peyğəmbərlik nuru sayəsində çatmış peyğəmbərlərin məsləhətlərinə əməl etmək lazımdır.

Daha sonra mənə aydın oldu ki, dərmanların müxtəlif növ maddələrin müxtəlif miqdarda, belə ki, məsələn, birinin digərindən iki dəfə artıq çəki və həcmə malik qarışığından ibarət olmasına (bu zaman dərmanın özünəməxsus xüsusiyyətini özündə daşıyan bu miqdar fərqləri əsrarəngizlikdən xali deyildir) oxşar olaraq, ibadətin özü də məhz ürəyin xəstəliyinin müalicəsi kimi müxtəlif növ və müxtəlif miqdarda fəaliyyətlərdən ibarətdir. Belə ki, məsələn, səcdə iki dizçökmədən ibarətdir, səhər namazı isə öz həcminə görə məğrib namazının yarısına ekvivalentdir.

Bu da öz növbəsində, yalnız peyğəmbərlik nurunun sayəsində dərk oluna bilən ibadətin bir növ özünəməxsusluğu kimi, əsrarəngizlikdən xali deyildir. Rasional yollarla ibadətlərdən hansısa fəlsəfi bir müdriklik hasil etmək istəyən və onların özündə İlahi sirlər yaşatdığını deyil, razılığa əsaslanan hansısa bir şey olduqlarını hesab edənlər bununla çox böyük səfehlik və cahillik nümayiş etdirmişlər.

Dərmanlar onun əsasını təşkil edən başlıca tərkib hissələrdən və bunların da tamamı kimi iştirak edən əlavə hissələrdən (həm də nəzərə almaq lazımdır ki, bunların da hər biri dərmanın başlıca tərkib hissələrinə özünün məxsusi təsirini göstərir) ibarət olduğu kimi, lazım olandan artıq fəaliyyətlər və adətlər özlərini ibadətlərin əsas tələblərinə, onların fəaliyyətlərinə mükəmməl forma verən hansısa bir əlavə kimi ifadə edir.

Qısası, peyğəmbərlər ürəyin xəstəliklərini müalicə edən şəxslərdir. İdrakın verdiyi fayda və onun fəaliyyət dairəsi yalnız bunu bizə göstərməklə hüdudlanır. İdrak peyğəmbərliyə inam və yalnız peyğəmbərlik nəzəri ilə dərk olunan şeylərdə özünün gücsüzlüyü - şeyləri biz əlimizə götürdükdə dərk etdiyimiz şəkildə olmalı olan dərketmədə gücsüzlüyü barədə şəhadət verir. Korlar özlərini gəzdirənlərə arxayın olduğu, çətinə düşmüş xəstələr ümidlə özlərini şəfqətli həkimin əlinə verdikləri kimi, biz də peyğəmbərliyə etibar edirik. İdrakın fəaliyyət dairəsi də bax burada sona çatır və bu sərhədlərdən o tərəfdə olan şeylərə onun əli yetmir, yalnız ona Təbibin yazdığı şeyləri anlamağa qüdrəti çatır.

Bütün bunlar tənhalıq və tərki-dünyalıq illərindəki barbaşa müşahidələrdən doğan zəruriliklə dərk etdiyimizdir.

Biz sonra peyğəmbərlik prinsipinə, bundan sonra peyğəmbərliyin həqiqət olduğuna və daha sonra isə izah etdiyim peyğəmbərlik fəaliyyətinə inamın zəifləməsinin şahidi olduq. Biz əmin olduq ki, insanlar arasında bu zəifləmə çox geniş xarakter almışdır. Buna görə də insanların bu cür soyumasının və öz inamlarında bu qədər zəifləməsinin səbəblərini araşdırmağa başladım və aşkar etdim ki, bunların dörd səbəbi vardır:

- fəlsəfi elmlərə qapılmış şəxslərdən doğan səbəblər;
- sufilərin həyatına qapılmış şəxslərdən doğan səbəblər;
- özlərini təlimilərin nəzəriyyəsi ilə bağlayan şəxslərdən doğan səbəblər;
- alimlik nişanələri ilə tanınmış insanlarla əlaqələrdən doğan səbəblər.

Müəyyən müddət ərzində mən şəriətin tələblərini laqeyliklə həyata keçirən şəxslərə suallarla müraciət edərək, onların qəlbinə hakim olan şübhələr haqqında soruşaraq, onların inamları və sirləri barədə məlumatlanaraq ayrı-ayrı insanları öyrəndim. Mən bunlardan hər hansı birinə: «Sənə nə olub? Nəyə görə şəriətin tələblərini bu cür biganəliklə həyata keçirirsən? Əgər sən o biri dünyaya inanırsansa və həm də bu zaman oraya hazırlaşmırsansa, onu bu fani dünyaya qurban verirsənsə, bu, səfehlikdir! Axı sən iki şeyi birinə dəyişməzsən, bəs onda nəyə görə əbədi həyatı bu dünyada keçirəcəyin bir neçə günlük həyatına dəyişirsən? Əgər sən Allaha inanmırsansa, onda kafirsən. Əgər belədirsə, öz inamının axtarışına başla. Diqqətlə bax, sənin daxili etiqadını təşkil edən və aşkar ədəbsizliyinin səbəbinə çevrilən gizli inamsızlığının səbəbləri nədədir, baxmayaraq ki, bunu açıb söyləmirsən, imana yalançı nəzakətlə yanaşırsan və şəriət barədə hörmətlə danışırsan!» - deyə müraciət etdim.

Bəziləri mənə belə cavab verdilər: «Məsələ belədir ki, əgər bu barədə qayğılanmaq zəruri bir işdirsə, onda alimlər bu halda ən layiqli cərgədə olmalıdırlar. Lakin hörmətli alimlərimizin arasında olan filankəs dua etmir, filankəs şərab içir, filankəs vəqf malını[1] və yetimlərin varını yeyir, filankəs dövlət vergilərini yeyir, filankəs məhkəmə işlərinə və şahid ifadələrinə görə rüşvət alır», - və sairə, və ilaxır.

Digərləri sufi biliklərinə iddia edərək bildirirlər ki, onlar artıq elə bir möminlik səviyyəsinə çatmışlar ki, artıq Allaha (121) olunan hər hansı bir ibadətdən daha yüksəkdədirlər.

Üçüncülərsə sübut kimi, özlərinin ibahilərdən götürdükləri şübhəli mühakimələrindən istifadə edirlər[2]. Bütün bu insanlar sufilikdən rədd olunanlardır.

Təlimilərlə ünsiyyətdə olan dördüncü qisim insanlar deyirlər: «Həqiqət çətin dərk olunandır: ona gedən yol maneələrlə doludur, onun barəsində olan fikirlər müxtəlifdir və heç bir nəzəriyyəyə digərlərinə nəzərən üstünlük vermək olmaz; ağılların sübutları ziddiyyətlidir və heç bir nüfuz sahibinin etibarlı fikrinə etibar etmək olmaz, təlimilərin nəzəriyyəsini təbliğ edənlərin mühakimələri isə qəti, əsassız xarakter daşıyır. Bəs onda mən insanların şübhə ilə yanaşdıqlarını necə qəbul edə bilərəm?»

Beşincilər deyirlər: «Mən bunları heç də nüfuz sahiblərinə olan hörmətimə görə etmirəm – mən fəlsəfə üzrə kitabları oxumuşam və peyğəmbərliyin əsl mahiyyətini dərk etmişəm. Mən başa düşdüm ki, onun mahiyyəti müdriklikdən və insanların rifahı üçün qayğı göstərməkdən ibarətdir, onun vəsiyyətləri sadə insanları mühafizə etməyə, onları qarşılıqlı qırğınlardan və mübahisələrdən qorumağa, onları rəzil istəklərdə batıb qalmağa imkan verməməyə yönəlmişdir. Lakin mən bu cür bədnam cahillərdən deyiləm ki, dini göstərişlərin ağuşuna girim! Yox, mən müdriklər səviyyəsinə aidəm, bələd olduğum müdrikliyə riayət edərək mənim hansısa nüfuzlu bir insanın ardınca getməyə ehtiyacım yoxdur!» Metafiziklərin fəlsəfi nəzəriyyələrinə aid olan kitabları oxuyan və bunları İbn Sinanın və Əbu-Nəsr əl-Farabinin əsərlərindən öyrənmiş insanların inamının ən yüksək həddi budur!

Ola bilər ki, sən bu insanlardan bəzilərini Quran oxuyan, dini məclislərdə və ibadətlərdə iştirak edən, şəriəti sözdə tərifləyən görə bilərsən. Lakin bununla yanaşı, onlar şərab içməyi tərgitmir, əxlaqsız hərəkətlər, bu və ya başqa formada olan pis əməlləri həyata keçirməyi əldən qoymurlar. Əgər onlardan: «Əgər peyğəmbərlik yalandırsa, onda nəyə görə dua edirsən?» - deyə soruşularsa, ola bilər ki, o, belə cavab versin: «Bədənin məşqi üçün, ölkənin adətlərinə riayət etmək, əmlakın və uşaqların qorunması xatirinə». Ola bilər ki, o, belə də cavab versin: «Şəriət doğrudur, peyğəmbərlik həqiqidir». Bu halda ona etiraz edərlər: «Əgər belədirsə, onda nəyə görə şərab içirsən?», buna isə o cavab verəcək: «Şərab ona görə qadağan olunmuşdur ki, içildikdə qəzəb və qeyz əmələ gətirir, mən isə öz müdrikliyim sayəsində bunlardan uzağam. Şərabdan isə öz idrakımı itiləmək üçün istifadə edirəm».

İbn Sina öz vəsiyyətində yazmışdır ki, o, Allah-Təala (121) qarşısında filan-filan işləri görəcəyinə, şəriətə ehtiram göstərəcəyinə, dini mərasimlərə cidd-cəhdlə yanaşacağına və şərabı ləzzət xatirinə deyil, yalnız şəfa tapmaq və müalicə məqsədləri üçün içəcəyinə and içmişdir.

Allahın (121) inamına iddia edənlərin imanı bax budur. Bu insanlara görə, bəziləri xam xəyalların qurbanına çevrilmişlər, bu xülyalar isə onlara etiraz edənlərin etirazlarının zəifliyi ucbatından daha da dərinləşmişdir, çünki bu cür etirazlar həm riyaziyyatın, həm məntiqin və həm də onlar üçün zəruri olan digər elmlərin – buna, əvvəldə qeyd etdiyimiz kimi, onların müəyyən qədər əsası da vardır – inkarı ilə müşayiət olunmuşdur.

Göstərdiyimiz səbəblərdən inamları bu qədər sarsılmış müxtəlif kateqoriyaya aid insanlara baxış keçirərək mən bu yanlış fikirləri ifşa etməyi özümə borc bildim, xüsusən ona görə ki, onları rüsvay etmək mənim üçün bir udum su içmək qədər asandır, çünki mən artıq onların elmlərini və üsullarını, daha doğrusu, sufilərin, filosofların, təlimilərin və görkəmli alimlərin üsullarını oxuyub öyrənmişdim. Belə bir fikir mənim qəlbimi qığılcım kimi dəldi: bu iş təxirəsalınmaz və zəruridir; əgər xəstəlik ümumiləşmişsə, təbiblər xəsisdirlərsə və insanlar ölüm ərəfəsindədirlərsə, onda tənhalıqdan və tərki-dünyalıqdan sənə hansı fayda vardır? Lakin sonra öz-özümə fikirləşdim: «Bəs nə vaxt bu qaranlığı dağıtmaq və zülmətlə toqquşmaq fikrindəsən? Axı indiki vaxt - insanlar arasında inamın zəiflədiyi vaxt və hazırkı dövr – yalanlar dövrüdür. İnsanları dilə tutmaqla məşğul ol ki, onlar getdikləri bu yollardan əl çəksinlər və həqiqətə yaxınlaşsınlar – sənin müasirlərində sənə qarşı nifrət oyanacaqdır. Sən onlara müqavimət göstərə bilməyəcəksən! Sən onlarla yan-yana necə yaşayacaqsan? Bütün bunlar yalnız Allaha inanan və sarsılmaz bir hökmdarın köməyi ilə baş verə bilər».

Mən Allah-Təalaya (121) yalvarmağa başladım ki, mənə öz tərki-dünya həyatımı davam etdirmək üçün icazə versin və bu zaman dəlillərin köməyi ilə həqiqəti aşkara çıxartmağa gücümün yetməyəcəyinə istinad edirdim. Allah (121) tərəfindən irəlicədən müəyyən olunmuşdu ki, o zamankı hökmdar hər hansı xarici səbəblərdən deyil, özünün daxilindən gələn bir niyyətlə mənə təcili Nişapura yollanaraq insanlar arasında inamın aşağı düşməsinə qar-

şı tədbirlər görməyimi buyurdu. Bunu mən mütləq etməli idim. Əgər mən bunun əksini inadla tələb etsəydim, onda mənim tənhalığım mənim üçün ağır bir yük olardı. Mənim ağlıma gəldi ki, Allahdan (121) möhlət almaq üçün gətirdiyim səbəb artıq zəifləmişdir və tənbəllikdən, istirahət naminə xudbinlikdən və insanların sənə yetirə biləcəyi pisliklərdən qorunmaq cəhdlərinə görə bu tənhalığı saxlamaq yolverilməz bir haldır. İnsanları yanlışlıqdan qurtarmağın çox çətin olduğu fikri ilə özünü təmizə çıxarmaqla, bunun kimi bir hərəkət etmək məgər mümkündürmü, axı Allah-Təala (121) özü buyurub: «Bismillahirrəhmanirrəhim! Əlif, lam, mim (Quranın bir çox ayələri bu hərflərlə başlayır)! İnsanlar yalnız: «İman gətirdik», - deməələri ilə onlardan əl çəkilib imtahan olunmayacaqlarını sanırlar? Biz onlardan əvvəlkiləri də imtahana çəkmişdik. Şübhəsiz ki, Allah düz danışanları da, yalançıları da çox gözəl tanıyır!»

Allah (121) öz Rəsuluna (122), yaratdıqlarının arasında Özünə ən əziz olanına deyir: «(Ya Məhəmməd) Sənə qədər olan bütün peyğəmbərləri yalançı saymışlar, lakin onları yalan deməkdə təqsirləndirdikdə və onlara pisliklər etdikdə onlar özlərinə kömək olana qədər dözmüşlər. Allahın sözləri əvəzolunmazdır. Sənə peyğəmbərlər barədə xəbərlər gəlib çatmışdır».

O (121) sonra deyir: «Bismillahirrəhmanirrəhim! «Ya, sin! Hikmətlə dolu Qurana and olsun ki...» surəsindən «Sən ancaq Qurana tabe olub Rəhmandan (onun əzabını) görmədiyi halda, qorxan kimsəni qorxuda bilərsən. Beləsinə (axirətdə) bağışlanacağı və gözəl bir mükafata (Cənnətə) nail olacağı ilə müjdə ver!» surəsinə qədər.

Bu məqsədlə mən ürək və düşüncə insanlarına məsləhət üçün müraciət etdim və onlar bir səslə mənə tərki-dünya həyatımdan əl çəkməyimi və öz tənha guşəmdən çıxmağımı məsləhət gördülər. Buna həm də möminlərin dəfələrlə, bir-birinin ardınca gördükləri yuxular da əlavə olundu ki, həmin yuxular mənim bu addımımın Qüdrətli Allah (121) tərəfindən əsrin əvvəlinə uyğunlaşdırılmış faydalı və düzgün təşəbbüs olduğuna şəhadət verirdilər. Belə ki, Allah-Təala (121) öz dinini hər yüzilliyin başlanğıcında yenidən dirçəldəcəyinə vəd vermişdir.

Beləliklə, mənim ümidim möhkəmləndi, mənim bu əlamətlərlə qüvvətlənmiş yaxşı niyyətlərim qələbə çaldı, Allah-Təala

(121) mənim bu tapşırığı yerinə yetirmək üçün 499-cu ilin zülqədər ayında başladığım (1106-cı ilin iyul-avqust ayları) Nişapura səfər yolumu asanlaşdırdı.

Mən Bağdaddan 488-ci ilin zülqədər ayında çıxmışdım, deməli, mənim tərki-dünya həyatım on bir il çəkmişdi. Bu addım Allah-Təala (121) tərəfindən müəyyən olunmuş və Onun ən möcüzəli təyinatlarından biri idi ki, mənim ürəyim bütün bu tərki-dünya həyatımın necə keçdiyini hiss etməmişdi və ağlıma da heç bir zaman gəlməzdi ki, mən nə vaxtsa Bağdaddan gedərəm və o zamankı halımdan ayrılaram. Ürəyi və vəziyyəti dəyişən Allah-Təaladır (121) və «möminin ürəyi Rəhmanın iki barmağı arasındadır».

Mən yaxşı bilirdim ki, əgər qayıtsaydım, mən qayıtmazdım. Çünki qayıtmaq – keçmişə qayıtmaq deməkdir. Lakin həmin keçmiş zamanlarda mən o elmi yayırdım ki, onunla yüksək mövqe əldə edirlər, öz sözüm və əməlimlə insanları ona səsləyirdim – o zaman mənim məqsədim və mənim düşüncələrim ona müncər olmuşdu. İndi isə mən insanları elə bir elmə səsləyirdim ki, bunun sayəsində mövqelərini – onun səviyyəsinin aşağı düşməsi mənasında – itirirlər. İndiki mənim düşüncələrim, məqsədim və ümidlərim elə bunlardan ibarət idi və mənim bu niyyətlərim Allaha (121) məlum idi.

Mən özümü və başqalarını təshih etmək istəyirdim. Mənə məlum deyil ki, öz arzuladıqlarıma çatacağam, yoxsa məqsədimə nail olmamış öləcəyəm. Lakin mən qəti və inamlı olaraq bilirəm ki, öz əməllərimi həyata keçirməmişəm. O, mənim əməllərimi hərəkətə gətirmişdir, öz işlərimi mən idarə etməmişəm, məhz O, məndən itaətkar bir alət kimi istifadə edərək bunları idarə etmişdir. Mən də Ona dua edirəm ki, O əvvəlcə məni, daha sonra isə mənim vasitəmlə başqalarını islah etsin, O əvvəlcə məni doğru yola yönəltsin, daha sonra mənim vasitəmlə digərlərini həmin yola istiqamətləndirsin. Mən Ona dua edirəm ki, mənə həqiqəti doğru göstərsin və mənə bu həqiqətin ardınca getməyə kömək etsin, mənə yalanı yalan göstərsin və ondan kənar olmaqda mənə kömək etsin.

İndi isə göstərdiyimiz insanlarda inamın zəifləməsinin adını çəkdiyimiz səbəblərinə qayıdaq və onları doğru yola istiqamətləndirməyin üsullarına toxunaq...

Təlimilərin mülahizələrinə qulaq asaraq rastlaşdıqları qarma-

qarışıqlıqlardan danışan insanlara gəldikdə, haqqında «Doğru mizanlar» kitabında söhbət açdığım şeylər onların şəfa tapmasına xidmət göstərə bilər və bu haqda hazırkı elmi əsərimdə geniş dayanmayacağıq.

İbahilərin xülyalarına gəldikdə, biz onların qarışıq mühakimələrini yeddi növə bölərək «Səadət əlkimyası» kitabında onları təhlil etmişik.

İnamları fəlsəfənin dağıdıcı təsirlərinə yüksək dərəcədə məruz qalaraq, buna görə də hətta peyğəmbərlik prinsiplərini də inkar edən insanlara gəldikdə isə, biz artıq peyğəmbərliyin həqiqi mahiyyəti barədə və farmakologiya, astronomiya və digər bu kimi elmlərin mövcudluğuna sübutlarla müraciət edərək peyğəmbərliyin zəruri olaraq varlığı haqqında söhbətlər aparmışıq. Bu məqsədlə hazırkı fəsilə peyğəmbərliyin həqiqi mahiyyəti barədə xüsusi bir bölmə ilə müqəddimə də vermişik. Biz təbabətin və astronomiyanın özünəməxsus xüsusiyyətlərindən sübutları hasil etdik, ona görə ki, bunlar şəxsən öz elmlərindən yaranır. Məsələn, astronomiya, təbabət, sehrbazlıq və cadu kimi sənətləri təmsil edən istənilən alimə biz sübut edərik ki, məhz onun özünün elmində də peyğəmbərliyin zəruri olaraq mövcudluğu ifadə olunur.

Sözdə peyğəmbərliyinin zəruri olduğunu təsdiq edən, əməlində isə şəriətin göstərişlərini fəlsəfi müdrikliklə bir tutan insana gəldikdə, yaxından diqqət yetirdikdə məlum olur ki, o, peyğəmbərliyə inanmır. Belə insan müəyyən oxucusu olan və həmin oxucusundan onun ardıcılı olmasını tələb edən hər hansı bir müdrikə inanır. Bu isə peyğəmbərliklə heç bir əlaqəsi olmayan bir şeydir, zira peyğəmbərliyə əmin olmaq rasional dərrakədən yüksəkdə elə bir növbəti dərketmə pilləsinin olmasını qəbul etmək deməkdir ki, bu zaman insanda yeni göz açılır və qulaq vasitəsilə rənglər, gözlər vasitəsilə səslər, hisslərlə dərk olunan şeylər anlanılmadığı kimi, idrak vasitəsilə dərk olunmayan obyektlər də həmin gözlər vasitəsilə dərk oluna bilir.[2] Əgər bu, yolverilməzdirsə, onda, deməli, biz nəinki peyğəmbərliyin mövcudluğu imkanını, həm də onun özünün mövcudluğunu sübut etmişik. Əgər bu, yolveriləndirsə, onda, deməli biz yer üzündə idrak vasitəsilə qavranıla bilinməyən və idrak tərəfindən yalan və inanılmaz kimi elan olunan, xüsusi xassələr adlanan şeylərin mövcudluğunu sübut etmişik.[3]

...Filosoflar tərəfindən fizikada və metafizikada qurulmuş sübutların çoxu məhz bu növə aiddir. Onlar şeyləri gördükləri və

anladıqları kimi qəbul edirlər, insan üçün qeyri-adi olan bütün digər şeyləri onlar cəfəngiyat adlandırırlar. Əgər doğru çıxan yuxular adi bir şey olmasaydı və əgər insanlar təsdiq etməsəydilər ki, hisslərin zəiflədiyi zaman onlar gizli şeyləri dərk edə bilirlər, onda bu cür ağıla malik olan şəxslərmütləq onu da inkar edəcəkdilər. Əgər onlardan: «Dünyada buğda dənəsi boyda nəsə elə bir şey mövcud ola bilərmi ki, o, hər hansı bir şəhərə gətirilərsə, əvvəl bütün şəhəri, sonra isə özü-özünü yeyər və nəticədə nə şəhər qalar, nə də özü?» - deyə sual olunarsa, onda belə cavab verərdilər: «Bu ola bilməz, belə şeylər ancaq nağıllarda olur». Əslində isə, məhz alovla belə hal baş verə bilir. Heç bir vaxt alov görməyən bir kəs bunu eşidərsə, belə şeyin mövcud olduğunu mütləq inkar edəcəkdir. O biri dünyanın möcüzələrinə dair inkar mülahizələrin çoxu məhz bu nöqteyi-nəzərlə də qurulur...

Onda nəyə görə şəriətin göstərişləri həllinə rasional yolla nail oluna bilinməyən, yalnız peyğəmbərlik gözü ilə tədqiq oluna bilən ürəyin müalicəsi və paklaşdırılmasına aid xüsusiyyətlərə malik olmalı deyil? Axı bəziləri bundan daha möcüzəli xüsusiyyətlərin olduğunu etiraf etmiş və öz kitablarında bu haqda qeydlər etmişlər. Bu cür qəribə xüsusiyyətlərdən biri, məsələn, çətin doğan hamilə qadına olunan qulluq zamanı sınaqdan çıxarılır, belə ki, bundan ötrü müəyyən şəkil heç bir vaxt su dəyməmiş iki parçanın üzərinə çəkilir. Doğan qadın bu şəklə öz gözləri ilə baxır, sonra isə onları ayaq pəncələrinin altına qoyur və uşaq dərhal dünyaya gəlməyə tələsir. Bu xüsusiyyət mümkün olan bir şey kimi qəbul olunmuş və «Qəribə xüsusiyyətlər» kitabında qeyd edilmişdir. Həmin şəkildə doqquz yuvacıq çəkilmişdir və onların hər birində xüsusi rəqəmlər elə yazılmışdır ki, hər bir sütunda - istər uzununa, istər eninə və istərsə də dioqnal boyu hesablasan, həmişə on beşə bərabər olacaqdır.

Mən bilmək istərdim, elə bir adam ola bilərmi ki, buna inansın və sonra isə nəyə görə əvvəlcədən səhər namazının iki rukət (rukət – namazın təkrar olunan hissəsidir), günorta namazının dörd, axşam namazının isə üç rukət müəyyən olunmasının əqli təhlillə öyrənilməsinin mümkünsüzlüyünə inanmasın. Bunun səbəbi isə günün vaxtlarındakı fərqlərdir, bunun xüsusiyyətlərini isə yalnız peyğəmbərlik nuru sayəsində dərk etmək olar.

Qəribə işdir: əgər biz fikrimizin ifadə formasını dəyişmiş olsaydıq və münəccimlərin sözləri ilə desəydik, onda onlar bu vaxt-

lardakı fərqləri anlayardılar. Biz belə deyirik: «Məgər ulduz falının tərtib olunmasında Günəşin göyün ortasında, şərqdə və ya qərbdə olmasından asılı olaraq, mühakimələr fərqli olmurlarmı? Axı münəccimlərin gələcəyi göstərən fallarında şəfatapma yollarındakı, insanların taleyi və onların ölümləri barədə olan xəbərlərdəki fərqlər məhz bunlara əsaslanır. Bununla yanaşı, heç bir fərqi yoxdur; Günəş gözdən itmişdir, yoxsa səmanın ortasındadır, üfüqdə batmışdır, yoxsa qüruba yaxınlaşmışdır». İndi buna inanmaq olarmı? Axı burada o, eyni şeyi, lakin yüz dəfələrlə yalanını öz üzərində sınaqdan keçirdiyi münəccimin ifadə etdiyi şəkildə eşidir (buna baxmayaraq, o hər dəfə buna inanır, belə ki, əgər münəccim desə: «Günəş səmanın ortasında olduğu zaman, ona filan ulduz baxdığı vaxtda sənin ulduz falın filan bürclə təyin olunacaqdır və əgər həmin vaxt sən əyninə təzə paltar geyinsən, onda sən həmin paltarda da qətlə yetiriləcəksən», onda hər hansı bir fizik soyuqdan əziyyət çəkməli olsa da, bu paltarı geyinməyəcəkdir, baxmayaraq ki, o artıq belə sözləri münəccimdən dəfələrlə eşitmiş və onun yalançılığına əmin olmuşdur).

Mən bilmək istəyərdim, necə olur ki, insanın bunların bəzi peyğəmbərlərin ecazkar qabiliyyətlərilə dərk olunan hansısa xüsusiyyətlərdən ibarət olduğunu etiraf edərək bu cür xurafatla razılaşmağa ağlı çatır və eyni zamanda həmin insan necə olur ki, gerçək bir peyğəmbərin mülahizələrindən – doğruluğu möcüzələrlə təsdiqlənən və heç kim tərəfindən yalan kimi inkar olunmayan mülahizələrdən - bunlar haqqında eşitdikdə bu cür şeylərə inanmır? Əgər filosof rükətlərin sayında, daş atmada, ziyarətin əsas qaydalarının və şəriətdə müəyyən olunmuş digər ayinlərin kəmiyyətlərində bu cür xüsusiyyətlərin ola bilməsini inkar edərsə, onda o, bunlarla dərmanların və ya ulduzların xüsusiyyətləri arasındakı fərqləri ayırd edə bilməz. O deyə bilər: «Mən artıq təbabətin və astronomiyanın müəyyən vəziyyətlərini sınaqdan keçirdim. Bu zaman mən aydınlaşdırdım ki, bunların bəziləri doğrudur və mənim qəlbim bu vəziyyətlərə inamla alışdı, onlara olan inamsızlığım və qərəzim yox oldu. Lakin sənin dediyini mən sınaqdan keçirməmişəm. Onun mövcudluğu və bu cür şeylərin həqiqiliyi barədə, sən bunların mümkünlüyünü təsdiq etsən də, mən haradan bilə bilərəm? Buna mən belə cavab verərəm: «Sən özünün sınaqdan keçirdiyin və öz üzərində sınaqdan keçirənlərdən və arxasınca getdiklərindən eşitdiklərinə etibar etməklə kifayətlənmə.

Peyğəmbərlərin ifadələrinə qulaq as. Onlar bunu sınaqdan keçirmişlər və şəriətdə deyilən bütün şeylərin həqiqiliyini görmüşlər. Onların ardınca get və sən birbaşa seyrlə bu həqiqətlərdən bəzilərini dərk edə bilərsən».

Bununla yanaşı, mən deyərdim: «Bu şeyləri sınaqdan keçirmədiyinə baxmayaraq, sənin idrakın hökm edir ki, sən bunları sözsüz olaraq inam kimi qəbul etməli və bunları yerinə yetirməlisən». Yaşlı, ağıllı və heç bir zaman xəstəlik görməyən bir insanı təsəvvür edək. İndi isə təsəvvür edək ki, o xəstələnmişdir və eyni zamanda da onun ağlı bir şey kəsəndən təbabətdəki bilikləri barədə mülahizələrini eşitmiş və təbabəti bilən mərhəmətli atası vardır. Budur, atası qaşıq dərmanı hazırlayır və ona deyir: «Bu, sənə xəstəlik zamanı kömək edər və səni bu azardan sağaldar». Bu dərman acı və iyrənc dada malik olmasına baxmayaraq, həmin insanın ağlı bu zaman ondan nə tələb edəcəkdir? O, bu dərmanı qəbul edəcəkmi? Yoxsa ondan imtina edərək: «Mən anlaya bilmirəm ki, bu dərmanın mənim sağalmağımla nə əlaqəsi vardır; mən heç vaxt onun dadına baxmamışam», - deyəcəkdir. Şübhəsiz ki, əgər o, belə hərəkət edərsə, sən onu axmaq hesab edəcəksən. Lakin bunun kimi, sənin göstərdiyin inamsızlığa görə də ağıllı adamlar səni axmaq sayacaqlar!

Əgər sən: «Mən haradan bilim ki, Peyğəmbər (122) mərhəmətli və təbabətdən məlumatlıdır?» - desən, mən cavab verərəm: «Bəs sən öz atanın mərhəmətli olduğunu haradan bilmisən? Axı bu hiss olunan şey deyil! Sən bunu yalnız onun əməllərinə əsasən, onun davranışlarının bu və ya digər halda əldə rəhbər tutduğu şeylərə və belə vəziyyətlərdə bundan nə meydana çıxdığının şahidi olduğuna görə öyrənmisən».

Allahın Rəsulunun (122) buyurduqlarını, onun insanları doğru yolla apardığı zaman göstərdiyi qayğılarını, insanların əxlaqlarının yaxşılaşdırılması və davranışlarının islah edilməsi, başqa sözlə desək, insanların dində və dünyəvi həyatda islah edilmələri üçün yeganə üsulu yolunda çoxtərəfli təzahür edən şəfqəti və mehribançılığını dərk edən şəxsə məlum olacaqdır ki, Peyğəmbərin (122) öz xalqına göstərdiyi mərhəmət valideynlərin öz uşaqlarına göstərdiyi mərhəmətdən daha böyükdür. Əgər o, özünün qarşısında açılmış ecazkar əməllərə, Peyğəmbərin (122) Quranda və hədislərdə xəbər verdiyi gizli möcüzələrə diqqət yetirərsə, əgər Qiyamət günü barədə ona deyilənləri dərk edərsə və bütün bunları o

düzgün anlayarsa, onda biləcək ki, o, idrakdan daha yüksəkdə duran elə bir pilləyə nail olmuşdur və onun gözləri elə açılmışdır ki, yalnız seçilmiş insanlara qismət olan, idrakla dərk olunmayan məhrəm şeyləri öz qarşısında aşkar edəcəkdir.

Peyğəmbərə (122) inam bəsləyərək zəruri biliklərin qazanılması yolları bu cürdür. Quranı diqqətlə öyrən və hiss et, hədisləri oxu, onda sən əyani surətdə buna əmin olacaqsan.

Filosoflar üçün bu göstərişlər tam kifayət edər. Burada onların üzərində ona görə dayandıq ki, indiki dövrdə onlara çox böyük ehtiyac vardır.

Dördüncü səbəbə, daha doğrusu, alimlərin axmaq hərəkətləri nəticəsində sadə insanların arasında imanın zəifləməsinə gəldikdə isə, bu xəstəlikdən üç şeylə şəfa tapmaq olar.

Birincisi, sən deyə bilərsən: «Elə bir alimi götürək ki, sənin təsdiq etdiyin kimi, özünə elə günah şeyləri etməyi rəva bilmişdir ki, bu sənin üçün şərab içmək və donuz əti yemək, rüşvət almaq, həmçinin qeybət, yalan və böhtan kimi günahlara bərabərdir. Sənin bu göstərilən şeylərin günah olduğunu bilə-bilə etməyinin səbəbi bunların itaətsizlik olmasına səndə olan inamsızlıq deyil, qəlbindəki ehtirasların öhdəsindən gələ bilməməyindədir. Sənin ehtirasların sənə qalib gəldiyi kimi, onun da ehtirasları onu üstələmişdir. Bunların hüdudlarından kənarda olan məsələlərin səndən fərqli olaraq, onun bilməyi hələ o demək deyildir ki, o, bu cür biliklərinin sayəsində bu və ya digər günah əməllərin icrasında səndən daha artıq nəfsini saxlaya bilir. Doğrudan da, gör nə qədər insanlar var ki, təbabətə inanmalarına baxmayaraq, onlara qadağan olunanın əksinə hərəkət edərək soyuq su içməkdən özlərini saxlaya bilmirlər! Bu da o demək deyildir ki, belə hərəkətlər ziyanlıdır və ya təbabətə inanmaq düzgün deyildir. Alimlərin səhvləri bax buna əsaslanır».

İkincisi, rəiyyətlərə demək olar: «Sən inanmalısan ki, alim öz elminə o biri dünyadakı həyatı üçün hansısa bir ehtiyat kimi baxır və düşünür ki, elmi onu xilas edəcək və onun müdafiəçisinə çevriləcəkdir. Beləliklə, düşünür ki, Allah-Təala (121) qarşısında öz əməllərinə görə cavab verdiyi zaman elminin sayəsində öz aqibətini yüngülləşdirəcəkdir. Elm onun aqibətini ağırlaşdıra bilər, lakin eyni zamanda hansısa dərəcədə yüngülləşdirə də bilər – bu da istisna olunmur. Alim xeyir əməllər həyata keçirməyə də bilər – o, öz elmi ilə bəraət qazanar. Lakin sən - sadə rəiyyət əgər ona baxa-

raq xeyirxah əməllər həyata keçirmək fikrində deyilsənsə, onda sənin bu axmaq hərəkətin alimin biliyinə sahib olmadığın üçün səni məhv edəcəkdir, zira sən heç bir şeydə öz müdafiəçini tapa bilməyəcəksən».

Üçüncüsü, həqiqətdir ki, əsl alim diqqətsizlik ucbatından günah edə bilər və ona görə də heç vaxt bunun üstündə möhkəm durmur, zira həqiqi elm odur ki, Allah-Təalaya (121) itaətsizlik göstərməyin öldürücü bir zəhər olduğunu və o biri dünyanın bu dünyadan daha yaxşı olduğunu insanlara başa salsın. Bunu dərk edən kəs heç bir zaman xeyri ondan aşağı olan şeylə dəyişməz.

Bu bilik insanların çoxunun məşğul olduğu elm növləri ilə əldə olunmur, həmin elmlərdən insanların qazandıqları biliklər ona gətirib çıxarır ki, həmin insanlar getdikcə daha böyük həyasızlıqla Allah-Təala (121) qarşısında itaətsizlik göstərirlər. Həqiqi elm isə öz sahibinə getdikcə daha artıq qorxu və həyəcan təlqin edir, onu günah əməllərdən saxlayaraq daha çox ümid aşılayır – bu cür günah əməllər onlar tərəfindən yalnız gah bu, gah da digər hallarda insanlar tərəfindən qaçılmaz olan xətalar nəticəsində baş verir və bunlar heç də onların imanlarının zəifliyinə dəlalət etmir. Dindar adam əgər günah əməl edərsə, buna görə tövbə edir və öz günah əməllərində inadla dayanmaqdan və bu günahlara bulaşmaqdan uzaqdır.

Fəlsəfəni və təlimilərin nəzəriyyəsini pisləməklə, onların səbəb olduqları bəlalar barədə söhbətlər etməklə və fəlsəfəni, təlimilərin nəzəriyyəsini lazım olduğu kimi rədd etməyənlərin bais olduqları bəlalardan danışmaqla toxunmaq istədiklərim bunlardır.

# MÜNDƏRİCAT